İslam İnqilabının Böyük Rəhbəri
cənab Ayətullah Xamenei

# 250 YAŞLI İNSAN



# Mündəricat

## yaşlı İnsan ۲۵۰

## Kitab haqqında

Kitabın adı:.........................................۲۵۰ yaşlı insan

Müəllif:Ayətullahul-üzma Seyyid Əli Hüseyni Xamenei

Nəşr edən:.....................................................Şəhriyar

Çap tarixi:...........................................................۲۰۱۵

Çap növbəsi:.....................................................Birinci

Tiraj:..............................................................۳۰۰۰

səh:۱

## Mündəricat

## Giriş

İmamlar yalnız yaşadıqları dövrdə qərib olmadılar, əsrlər boyu onların həyatının mühüm və bəlkə də əsəs cəhətlərinə edilən diqqətsizlik bu qəribliyin tarix boyu davam etməsinə səbəb oldu. Bu əsrlərdə yazılmış kitablar imamların həyatına dair rəvayətləri gələcək nəsillərə ötürdüyü üçün şübhəsiz ki, misilsiz dəyərə malikdir. Lakin hidayətçi imamların ۲۵۰ illik həyatının davamlı xəttini təşkil edən gərgin siyasi mübarizə amili .elmi-mənəvi cəhətlərə dair hədis, rəvayət və tarixi məlumatlar arasında itmişdir

Biz imamların həyatını dərs və örnək kimi öyrənməliyik, yalnız əziz və dəyərli xatirələr kimi yox. Bu isə onların siyasi həyatına diqqət yetirmədən mümkün deyil. Məndə imamların həyatının bu cəhətinə maraq ilk dəfə ۱۹۷۱-ci ildə ağır və məşəqqətli bir imtahan zamanı yarandı. Ondan öncə tövhid sözünün ucalması və ilahi hökumətin bərqərar edilməsi naminə fədakarlıq göstərən böyük mübarizlər olan imamların həyatını araşdırsam da, o zaman gözlənilmədən mənim üçün bir məsələ aydın oldu. O məsələ bu idi ki, məsum rəhbərlərin həyatında bəzən ziddiyyət kimi başa düşülən zahiri fərqlər olsa da, onların həyatı ümumilikdə bir-birinə bağlı olan vahid hərəkəti təşkil edir. Bu hərəkət hicrətin ۱۰-۱۱-ci ilindən kiçik qeyb dövrünün başlandığı ۲۶۰-cı ilə qədər sürüb ۲۵۰ illik bir dövrü əhatə edir. Bu insanlar əslində bir şəxs kimidirlər, onların məqsəd və istiqamətlərinin bir olduğuna şübhə yoxdur. Odur ki, biz İmam Həsən Müctəbanın (ə), İmam Hüseynin (ə) və İmam Səccadın (ə) həyatlarını bir-birindən ayrı şəkildə təhlil edib bəzi zahiri fərqlərə görə bu üç imamın həyat tərzlərinin bir-birinə zidd olduğuna dair kobud səhvə yol vermək əvəzinə, onların hamısını hicrətin ۱۱-ci ilində bir yola qədəm qoyub ۲۶۰-cı ildə onun sonuna çatmış və ۲۵۰ il ömür sürmüş bir .insan kimi fərz etməliyik

Bu böyük və məsum insanın bütün hərəkətlərini bu baxışla dərk etmək olar. Məsum olmasa da, hər bir ağıllı və məqsədli

insan uzunmüddətli bir hərəkət zamanı müəyyən mövqe və taktikalar seçməli, bəzən sürətlə, bəzən zəif hərəkət etməli, bəzən hətta məqsədyönlü şəkildə geri çəkilməlidir. Onun elmli və məqsədli olduğunu bilən şəxslərə görə, bu da irəliyə hərəkət sayılır. Bu baxışa əsasən, Əmirəlmömininin (ə) həyatı İmam Müctəbanın (ə), İmam Hüseynin (ə) və ۲۶۰-cı ilə qədər yaşamış digər səkkiz imamın həyatı ilə birgə bütöv bir tamı təşkil edir. Mən o zaman bunu başa düşdüm, bu baxışla onların həyatını araşdırmağa başladım və araşdırdıqca bu fikir də öz təsdiqini tapdı. Allah Rəsulunun (s) Əhli-beyti olan bu əziz məsumların bütöv həyatı vahid siyasi məqsədi izlədiyinə görə, xüsusi şəkildə araşdırılmalıdır. Mən bu haqda danışmaq və bunu bir qədər izah etmək .istəyirəm

Əvvəla, imamlara aid etdiyimiz siyasi, yaxud gərgin siyasi mübarizə nə deməkdir? Məqsəd budur ki, məsum imamların mübarizəsi yalnız elmi və etiqadi mübarizədən ibarət olmayıb. Siz həmin müddətdə İslam tarixində Mötəzilə, Əşairə və digər firqələrlə aparılan etiqadi mübarizələrdən xəbərdarsınız. Uyğun məclis, dərs və çıxışlarda imamların məqsədi yalnız özlərinin kəlam, yaxud fiqh məktəblərinin görüşlərini isbatlamaq və rəqiblərini qane etmək deyil, bundan böyük olmuşdur. Həmçinin imamlarımız cənab Zeyd, onun davamçıları, İmam Həsənin nəvələri və İmam Sadiqin (ə) bəzi övladları kimi silahlı mübarizə də aparmamışlar. Düzdür, onları mütləq şəkildə pisləməmişlər; bəzilərini silahlı mübarizədən başqa səbəblərə görə pisləyir, bəzilərini tam təsdiqləyir, bəzilərinə də arxa cəbhədə dəstək verirdilər. İmam Sadiqdən (ə) nəql olunan hədisdə deyilir ki, Peyğəmbər (s) ailəsindən kiminsə qiyam etməsini xoşlayır və ailəsinin xərclərini üzərimə götürürəm.(۱) Maddi və mənəvi yardımlarla, yer verməklə, gizlətməklə və sair işlərlə qiyamçılara kömək edir, özləri isə bizim tanıdığımız cərəyanın öndərləri olaraq silahlı mübarizəyə qoşulmurdular. Bizim iddia etdiyimiz



---

.Bihar əl-ənvar, c. ۴۶, səh: ۱۷۲ [۱]-۱

siyasi mübarizədə məqsəd bu işlər də deyil. Məqsədimiz bir siyasi məqsədi rəhbər .tutan mübarizədən ibarətdir. Həmin siyasi məqsəd isə İslam hakimiyyəti qurmaqdır

İmamlar Peyğəmbərin (s) vəfat etdiyi andan ۲۶۰-cı ilə qədər İslam cəmiyyətində ilahi hakimiyyət qurmaq istəmişlər. Əsas iddia budur. Əlbəttə, deyə bilmərik ki, İslam hökumətini hər bir imam öz dövründə qurmaq istəmişdir; ortamüddətli, uzunmüddətli və bəzi hallarda qısamüddətli proqramlar olmuşdur. Misal üçün, İmam Müctəbanın (ə) dövründə yaxın gələcəkdə İslam hakimiyyəti qurmağa səy göstərilmişdir. İmam Müctəba (ə) Müsəyyib ibn Nəcəbənin və digərlərinin Siz nə üçün sükut etdiniz? sualına belə cavab verirdi: Bilmirəm. Bəlkə bu sizin üçün imtahan və müəyyən vaxta qədər möhlətdir.(۱) Mənim fikrimcə, İmam Səccadın (ə) dövründə ortamüddətli gələcək nəzərdə tutulurdu. Bunu sübut edən fakt və misalları söyləyəcəyəm. İmam Baqirin (ə) dövründə böyük ehtimalla yaxın gələcəkdə İslam hakimiyyəti qurmağa çalışmışlar. Səkkizinci imamın şəhadətindən sonra isə böyük ehtimalla uzaq gələcək nəzərdə tutulmuşdur. Nəzərdə tutulan zamanlar müxtəlif olsa da, məqsəd həmişə eyni .olmuşdur. Siyasi mübarizədə məqsəd budur

Bir insanın mənəvi inkişafına və Allaha yaxınlaşmasına aid olan mənəvi və psixoloji işlərdən başqa imamların bütün işləri - dərs, hədis, kəlam, elmi və ya siyasi rəqiblə debat, sürgün, bir qrupu dəstəkləmək, bir qrupu rədd etmək kimi işlər bu xətt üzrə (getmiş və məqsəd İslam hakimiyyəti qurmaq olmuşdur. (۱۹۸۶

Ümumiyyətlə, imamların siyasi həyatları olmuşdur, yoxsa yox? İmamların işi yalnız ətraflarına bir qədər şagird və mürid toplamaqdan, onlara namaz, zəkat, həcc hökmlərini, İslam əxlaqını, din təlimlərini, ideoloji prinsipləri, irfanı və bu kimi məsələləri öyrətmək olmuşdur, yoxsa onların həyatında bu deyilənlərdən əlavə və deyilənlərin ruhu olan siyasi fəaliyyət amili də olmuşdur? Bu çox əhəmiyyətli məsələdir və bunu



---

.Ənbiya/۱۱۱ [۲]-۱

aydınlaşdırmaq lazımdır. Təbii ki, qısa söhbətlərdə geniş əsaslandırmaya imkan yoxdur. Mən yalnız başlıqlarını deyəcəyəm, kimin həvəsi olsa, bu fərziyyə ilə hədislərə bir də müraciət etsin, tarix kitablarını araşdırsın, o zaman Musa ibn Cəfərin (ə), yaxud .digər imamlarımızın həyatının hələ də məchul qaldığı bəlli olar

İmamlar və şiələr Peyğəmbərin (s) onları mənən təmizləsin, onlara kitab və hikmət öyrətsin(١) ayəsində deyilən məqsədin həyata keçməməsini hiss etdilər; gördülər ki, İslamın erkən çağından sonra Peyğəmbərin (s) istədiyi İslam quruluşunu və İslam dünyasını qurmaq tamamilə yaddan çıxdı, nübüvvət və imamətin yerini şahlıq tutdu, xosrovlar, qeysərlər, quldurlar, iskəndərlər və tarixin digər zalım və azğınları xilafət formasında, Bəni-Üməyyə və Bəni-Abbas adları altında hakimiyyətə gəldilər, Quran hakimlərin və güc sahiblərinin istədiyi şəkildə izah olundu, xalqın düşüncəsi hökumət başçılarının maddi tamah axurundan su içən alimlərin xəyanətkar əməllərinin təsiri .altına düşdü. Bunu görən imamların həyatında ümumi bir plan yarandı

İmamlar deyəndə bütün imamları - İmam Əlidən (ə) İmam Əsgəriyə (ə) qədər on bir imamın hamısını nəzərdə tuturam. Mən dəfələrlə demişəm ki, imamların ٢٥٠ il sürən həyatına ٢٥٠ yaşlı bir insanın həyatı kimi baxmalıyıq. Bunlar bir-birindən ayrı deyil, hamısı vahid nurdur.(٢) Bunların hər hansı birinin dediyi söz əslində həm də o birlərin sözüdür. Bunların hər hansı birinin gördüyü iş əslində həm də o birilərin işidir. Sanki bir insan ٢٥٠ il ömür sürmüşdür. Bu ٢٥٠ il ərzində imamların bütün işləri bir məqsədi, bir .niyyəti və müxtəlif taktikaları olan bir insanın işləri kimidir

İmamlar İslamın qərib olduğunu, İslam cəmiyyəti qurulmadığını hiss edəndə bir neçə .məsələni özlərinin köklü məqsədlərinə çevirdilər. Biri İslamı düzgün başa salmaq idi



---

.Ali-İmran/١۶۴ [٣] -١

.Üyun əxbar ər-Rza c. ٢, səh: ۴١٧ [۴] -٢

Bu uzun illər ərzində hakimiyyət başında olanlara görə İslam dini problem yaradan bir amil sayılırdı. Peyğəmbər (s) İslamı, Quran İslamı, Bədr və Hüneyn döyüşlərinin İslamı, zadəganlığa, ayrıseçkiliyə qarşı çıxan, məzlumları müdafiə edən və hegemonlarla vuruşan İslam firon mahiyyətini saxlayıb Musa (ə) libasını, Nəmrud mahiyyətini saxlayıb İbrahim (ə) libasını geyinmək istəyənlərə sərf etmirdi. Onlar İslamı təhrif etməyə məcbur idilər, bunsuz mümkün deyildi. İslamı xalqın qəlbindən və beynindən birdəfəlik çıxarmaq da imkansız idi. Çünki xalq mömin idi. Buna görə də İslamı öz ruhundan, məzmun və mahiyyətindən uzaqlaşdırmağa, onu dəyişdirməyə məcbur .oldular

Siz xatırlayırsınız və şahid olmusunuz ki, İslama qarşı eynilə bu iş ölkəmizdə keçmiş rejim dövründə görüldü. O zaman İslamın zahiri məsələlərinə qarşı deyil, məzmununa, ruhuna, cihadına qarşı çıxırdılar; yaxşı işlərə dəvət etmək və pis işlərdən çəkindirmək prinsipinə, İslam həqiqətlərini söyləməyə qarşı çıxırdılar. İslamın zahiri işlərinə, onların mal-dövlətinə ziyan vurmayan zahiri məsələlərə qarşı çıxmırdılar. Əməvi və Abbasi xilafətləri dövründə də belə idi. Onlar İslamın ruhunu və həqiqətini dəyişdirmək üçün bir qrup muzdur yazar və natiq cəlb etmişdilər. Onlara pul verib hədis qoşdurur, öz fəzilətlərinə dair rəvayət quraşdırır, kitab yazdırırdılar. Deyirdilər ki, Süleyman ibn Əbdülməlik öləndə adını çəkmək istəmədiyim böyük bir alimin kitablarını heyvanlara, dəvələrə yükləyib xəzinədən çıxardılar. Yəni adı İslam kitablarında məşhur olan bu böyük müəllif, hədisşünas və tanınmış alim Süleyman ibn Əbdülməlik üçün kitab yazırdı. Sizcə Süleyman ibn Əbdülməlik üçün yazılan bir kitabda onun xoşu gəlməyən bir şey ola bilər?! Süleyman ibn Əbdülməlik zülmkarlıq edir, şərab içir, kafirlərlə dostluq edir, müsəlmanlara əziyyət verir, xalq arasında ayrıseçkilik salır, yoxsulları pis durumda saxlayır, xalqın malını mənimsəyirdi. Belə bir adam hansı İslamı bəyənər?! İslamın ilk əsrlərində cəmiyyətin böyük dərdinə çevrilmiş bu

tendensiyanı imamlar görür, Peyğəmbərin (s) dəyərli irsinin, yəni tarix boyu yaşayıb bütün dövrlərdə insanları hidayət etməli olan İslam hökmlərinin dəyişdirildiyini hiss edirdilər. İmamların çox mühüm məqsədlərindən biri İslamı və Quranı düzgün .açıqlamaq, təhrifləri və təhrif edənləri ifşa etmək idi

İmamların çoxlu sözləri hakimiyyət orqanlarına və şah saraylarına bağlı olan alim, fəqih və hədisşünasların İslam adı altında dediklərinin inkarından və həqiqətləri .söyləməkdən ibarətdir. İslam hökmlərini izah etmək imamlar üçün əsas məqsəd idi

Bu məsələnin özü siyasi mahiyyət daşıyır. Bilirik ki, təhrif xilafətin və sarayın təhriki ilə baş verir, zahirdə alim görünən muzdurlar şah və hökmdarlara görə həqiqətləri təhrif edirlər. Təbii ki, o təhriflərə qarşı çıxan şəxs həm də hakim və şahların siyasətinin ziddinə getmiş olur. Bu gün bəzi müsəlman ölkələrində muzdur yazıçılar və hökumətə çalışan din alimləri müsəlmanlar arasında təfriqə salmaq, yaxud öz müsəlman qardaşlarını pis göstərmək üçün kitab yazırlar. Bu ölkələrdə azad bir yazıçı İslam birliyi və İslam qruplarının qardaşlığı haqda kitab yazsa, əslində həm də hakim rejimin əleyhinə yönəlmiş siyasi iş görmüş olar. İmamların fəaliyyətinin böyük bir hissəsi bundan ibarət idi; İslam hökmlərini söyləmələrinə səbəb bu deyildi ki, o zaman cəmiyyətdə İslam hökmləri deyilmirdi. Xeyr! İslam dünyasının hər yerində Quran təlimləri haqda danışan, Peyğəmbərdən hədis söyləyən, bəzi hədisşünaslardan minlərlə hədis öyrənmiş şəxslər vardı. Bunlar yalnız Məkkəyə, Mədinəyə, Kufəyə və Bağdada məxsus deyildi, tarixdən bilirik ki, İslam dünyasının hər tərəfində belə şəxslər vardı. Xorasanda gənc bir alim bir neçə min hədis yazırdı; Təbəristanda filan böyük alim Peyğəmbərdən və səhabələrdən bir neçə min hədis nəql edirdi. Hədis deyilirdi, İslam hökmü bəyan olunurdu, bəyan olunmayan İslamın bütün sahələrdə və İslam cəmiyyətinə dair məsələlərdə düzgün təfsiri idi. İmamlar

.bunun qarşısını almaq istəyirdilər. Onların mühüm işlərindən biri bu idi

Başqa bir mühüm iş imamət məsələsinin izahı idi. İmamət – İslam cəmiyyətinin rəhbərliyi deməkdir. O zaman müsəlmanlar üçün aydın olmayan, praktik və nəzəri cəhətdən təhrifə uğramış əsas məsələ imamət məsələsi idi. İslam cəmiyyətinin imamı – rəhbəri kim olmalıdır? Vəziyyət elə bir həddə çatmışdı ki, əksər İslam hökmlərinə əməl etməyən və çoxlu haram işləri açıq şəkildə görən şəxslər Peyğəmbər (s) canişini olduqlarını iddia edir, xəcalət çəkmədən xilafət kürsüsündə otururdular. Bu, xalqa gizli deyildi. Xalq birinin xəlifə adı altında içkili, kefli halda cümə namazına gəldiyini, pişnamaz durduğunu görür, ona iqtida da edirdi. Xalq bilirdi ki, Yezid ibn Müaviyə böyük əxlaqi xəstəliklərə tutulub, böyük günahlar işlədir, amma eyni zamanda Yezidə qarşı qiyam edin deyəndə cavab verirdi ki, biz Yezidlə beyət etmişik, qiyam edə bilmərik. İmamət məsələsi xalqa aydın deyildi. Xalq elə bilirdi ki, müsəlmanların imamı və İslam cəmiyyətinin hakimi bu günahlara, zülmlərə, Quranın və İslamın aydın hökmlərinə zidd əməllərə aludə ola bilər və bu, xalq üçün əhəmiyyət kəsb etmir. Bir cəmiyyətdə hakimiyyət məsələsinin əhəmiyyətinə və hakimin cəmiyyətin istiqamətində təsirinə əsasən, bu, böyük problem və İslam dünyası üçün ən ciddi :təhlükədir. Odur ki, imamlar aşağıdakı iki məsələni xalqa deməyi vacib bilirdilər

Biri imamın və İslam hakiminin müəyyən şərt və xüsusiyyətlərə malik olmasını – məsum, təqvalı, elmli, mənəviyyatlı olmasını, xalqla müəyyən tərzdə rəftar etməsini və Allah qarşısında müəyyən işləri yerinə yetirməsini xalqa söyləmək, ikincisi isə bu gün bu xüsusiyyətlərə malik olan şəxsin kimliyini müəyyən etməkdir. Onlar özlərini təqdim edir, tanıtdırırdılar. Bu da imamların ən mühüm siyasi və təbliğat işlərindən, .siyasi təlimlərindən biridir

Əgər imamlar qeyd etdiyim bu iki işdən başqa heç bir iş görməsəydilər belə, biz onların həyatlarının əvvəldən sona

qədər siyasi fəaliyyətdə keçdiyini söyləyə bilərdik. Bu halda Quranı təfsir edəndə, İslam təlimlərindən danışanda da əslində siyasi iş görmüş olurlar, imamın xüsusiyyətlərini sadalayanda da. İmamların təlimləri yalnız qeyd etdiyim bu iki mövzudan ibarət olsaydı da, həyatlarının siyasi fəaliyyətdə keçdiyini deyə bilərdik, amma onlar bununla kifayətlənməmişlər. Bütün bunlardan əlavə, ən azı İmam Həsənin (ə) dövründən sonra hakimiyyətə gəlmək məqsədi ilə məxfi şəkildə hərtərəfli siyasi və inqilabi bir fəaliyyətə başlamışlar. İmamların həyatını araşdıranda buna heç bir şübhə qalmır. Diqqətdən kənarda qaldığını söylədiyim cəhət bundan ibarətdir. Təəssüf ki, imamların – İmam Sadiqin (ə), İmam Musa ibn Cəfərin (ə) və bir çox .imamların həyatına dair yazılmış kitablarda bu məqama toxunmamışlar

Bütün faktlara baxmayaraq, imamların geniş siyasi və təşkilati hərəkətləri diqqətdən kənarda qalmış, yazılmamış və onların həyatlarının təsvirində əsas problemə çevrilmişdir. Həqiqət budur ki, imamlar bu fəaliyyəti göstərmişlər. Buna olduqca çoxlu .faktlar dəlalət edir

Bütün bacı və qardaşlar bilsinlər ki, imamət əmanətini təhvil alan kimi bütün imamların başladıqları işlərdən biri hakimiyyətə gəlmək üçün siyasi fəaliyyət göstərmək və siyasi mübarizə aparmaq idi. Bu siyasi fəaliyyət yeni quruluş yaratmaq istəyənlərin (göstərdiyi fəaliyyətlər kimidir və imamlar bu işi görmüşlər. (١٩٨٥

İmamların həyatları boyu zalım hakimlərlə bütün davaları məhz buna görə olmuşdur. Bizim imamlarımıza qarşı çıxanların, onları zəhərləyənlərin, qətlə yetirənlərin, həbs edənlərin və nəzarətdə saxlayanların problemi onların hakimiyyət iddiası ilə olmuşdur. Onların bu iddiaları və siyasi hakimiyyət məsələsi olmasaydı, birincilərin və sonuncuların elmlərini özlərinə aid etsəydilər də, onlara qarşı heç bir iş görməz, ən azı bu qədər sərt davranmazdılar. Əsas məsələ budur. Məhz buna görə imamların dəvət və təbiğatlarında imamət sözü, imamət məsələsi üzərində həssaslıq olduqca

böyükdür. İmam Sadiq (ə) İslam hakimiyyəti iddiası edərkən buyurur ki, ey insanlar, Allahın rəsulu imam olmuşdur. O, Ərəfata toplaşmış insanlara deyir ki, cəmiyyətin imamı, öndəri, rəhbəri və hakimi Allahın rəsulu, sonra Əli ibn Əbu Talib (ə), sonra Həsən (ə), sonra Hüseyn (ə) olmuşdur; bütün imamları sayaraq özünə çatır.(۱) Yəni imamların və onların səhabələrinin mübarizələrində siyasi hakimiyyət, müsəlmanlara ümumi və mütləq vilayət məsələsi əsas mövzunu təşkil etmişdir. Hakim qüvvələrin .mənəvi məsələlərdə imamlarla problemləri yox idi

Xəlifələrin dövründə cəmiyyətdə zahid, alim insanlar, təfsir, elm və bu kimi sahələrdə məşhur adamlar vardı. Xəlifələrin də onlarla nəinki işi yox idi, hətta onlara hörmət ifadə edir, onların ayağına gedir və nəsihət verməlrini istəyirdilər. Nə üçün? Çünki onların siyasi iddiaları yox idi. Xəlifələr tərəfindən hörmət göstərilən Həsən Bəsri, İbn Şübrümə və Əmr ibn Übeyd kimi böyük alimlər elm, zahidlik, mənəviyyat, təfsir, Peyğəmbər (s) elmləri və digər bu kimi iddiaları edirdilər, amma xəlifələr onlara heç bir etiraz etmirdilər. Nə üçün? Çünki siyasi hakimiyyət iddiası yox idi. İmamların Bəni-Üməyyə və Bəni-Abbas xəlifələri ilə davaları imamət və vilayət məsələsi - bu gün (bizim başa düşdüyümüz imamət mənası üstündə olmuşdur. (۱۹۸۸



---

.Əl-Kafi, c. ۴, səh: ۴۴۶ [۵] -۱

## İşarə

Allah elçisinin (s) ən mühüm işi haqqa dəvət və bu dəvət uğrunda mübarizədən ibarət idi. Əziz Peyğəmbər (s) öz dövrünün zülmət dünyası qarşısında təşvişə düşmədi. İstər Məkkədə yalqız, yaxud kiçik bir qrup olan müsəlmanların əhatəsində olduğu, qarşısında isə təkəbbürlü ərəb başçılarının, Qüreyş dilavərlərinin və hegemonların kobud xarakterlərlə və qüdrətlə durduğu gün onlardan, yaxud elmdən heç bir bəhrəsi olmayan avam insanlardan qorxmadı, özünün haqq sözünü dedi, təkrar və izah etdi, aydınlaşdırdı, təhqirlərə, çətinliklərə, əzablara dözdü və böyük bir qrupu müsəlman etməyi bacardı. Peyğəmbər (s) bu dəvət və cihad səhnəsində bir an da zəiflik göstərmədi, İslam cəmiyyətini qüdrətlə irəliyə aparıb şərəf və iqtidarın zirvəsinə çatdırdı. İstərsə də İslam hökuməti təşkil edib özü bu hökumətin başçısı kimi qüdrətə sahib olduğunda (heç nədən qorxmadı). O zaman da müxtəlif düşmən və müxaliflər Peyğəmbərə (s) qarşı çıxdılar; istər silahlı ərəblər – Hicaz və Yəmamə səhraları boyunca vəhşi qəbilələr yaşayırdılar; İslamın dəvəti onları islah etməli idi, onlarsa müqavimət göstərirdilər - istər ozamankı dünyanın böyük padşahları – dünyanın ozamankı iki böyük gücü olan İran və Roma imperiyası. Peyğəmbər (s) onlara məktublar yazırdı, sözlərini deyirdi, qoşunlar yeridirdi, çətinliklər çəkirdi, iqtisadi mühasirəyə düşürdü, Mədinə xalqı onların ucbatından bəzən iki-üç gün yeməyə çörək tapmırdı. O zaman hər tərəfdən çoxlu təhdidlər Peyğəmbəri (s) əhatə etmişdi. İnsanların bəzisi nigaran olur, bəzisi zəiflik göstərir, bəzisi deyinir, bəzisi Peyğəmbəri (s) mülayimliyə və barışığa həvəsləndirirdi. Amma Peyğəmbər (s) bu dəvət və cihad səhnəsində bir an da zəiflik göstərmədi, İslam cəmiyyətini qüdrətlə irəliyə aparıb izzət və iqtidarın zirvəsinə çatdırdı. Həmin quruluş və cəmiyyət Peyğəmbərin (s) müharibə və dəvət sahələrində göstərdiyi müqaviməti sayəsində sonrakı illərdə dünyanın birinci (qüvvəsinə çevrilə bildi. (۱۹۹۱

Mütəvatir və məşhur hədisə əsasən, o həzrətin özü buyurub: Mən gözəl əxlaqı tamamlamaq üçün göndərildim(١). Peyğəmbər (s) əxlaqi gözəlliklərin və mənəvi dəyərlərin ümumiləşməsi, kamala çatması üçün göndərildi. Bir şəxsin özü ən yüksək əxlaqi səciyyələrə malik olmasa, Allah-Taala ona bu böyük və mühüm tapşırığı verməz. Odur ki, peyğəmbərliyin əvvəllərində Allah-Taala Peyğəmbərə (s) müraciətlə buyurur: Həqiqətən sən böyük əxlaq sahibisən.(٢) Onun peyğəmbər kimi yetişməsi və Allah-Taalanın öz vəhyinə münasib bildiyi çıxara malik olması peyğəmbərlikdən öncəyə aiddir. Buna görə deyilmişdir ki, gənclikdə ticarətlə məşğul olan və bu yolla çoxlu gəlir əldə edən əziz Peyğəmbər (s) onların hamısını Allah yolunda verdi və .yoxsullara payladı

Peyğəmbərin (s) təkamülünün sonlarında, vəhyin nazil olmasından öncə, yəni hələ peyğəmbər olmadığı dövrdə Hərа dağına çıxıb ilahi nişanələrə - səmaya, ulduzlara, yerə, müxtəlif hisslərlə və müxtəlif yollarla yer üzərində yaşayan məxluqlara baxırdı. O, bunların hamısında Allahın izini görürdü, Haqq qarşısında kiçilməsi, ilahi əmr, qadağa və ilahi iradə qarşısında təzimi günbəgün çoxalırdı, gözəl əxlaqın tumurcuqları onda günbəgün daha da inkişaf edirdi. Hədisdə göstərilir ki, o ən ağıllı və ən səxavətli insan idi.(٣) Peyğəmbər (s) bu dövrdə ilahi nişanələri müşahidə etməklə günbəgün daha da yetkinləşirdi. O nəhayət qırx yaşına çatdı. Qırx yaşında onun qəlbi ən işıqlı, (Allah qarşısında) ən çox kiçilən və ilahi sözü qəbul etmək üçün ən hazırlıqlı qəlb idi. Mənəviyyatın, ruhaniliyin və nuraniliyin bu həddinə və kamilliyin zirvəsinə çatanda Allah-Taala səmanın və qeyb aləmlərinin qapılarını onun üzünə açdı, mənəvi və qeybi aləmlərə gözünü açdı. O, mələkləri görürdü; onunla



---

.Təbrisi. Məkarim əl-əxlaq, səh: ٨ [۶] -١

.Qələm/۴ [٧] -٢

.Bihar əl-ənvar, c. ١٧, səh: ٣٠٧ [٨] -٣

danışırdılar, onları eşidirdi və nəhayət Cəbrayıl Əmin onun yanına gəlib dedi: Oxu!(۱)
.Bu, peyğəmbərliyin başlanğıcı idi

Allahın bu bənzərsiz məxluqu, ilahi vəhyin nazil olmasından öncə belə kamillik mərhələsinə çatmış bu kamil insan peyğəmbərliyinin ilk anından mürəkkəb, hərətərfli və çətin bir cihada başladı və iyirmi üç il çox çətin şəraitdə bu cihadı davam etdirdi; öz daxilində cihadı, həqiqət haqda heç bir dərki olmayan xalqla cihadı və mütləq zülmətə qərq olmuş cəmiyyətlə cihadı. İmam Əli (ə) Nəhcülbəlağədə buyurur ki, fitnələr hər tərəfdən xalqı sıxırdı,(۲) dünyagirlik, şəhvətpərəstlik, zülm, təcavüz, insanların daxilində əxlaqi qəbahətlər, güclülərin heç bir şeydən çəkinmədən zəiflərə qarşı təcavüzü baş alıb gedirdi. Bu təcavüz yalnız Məkkədə və Ərəbistan yarımadasında deyildi, o dövrün ən üstün sivilizasiyaları olan böyük Roma imperiyasında və İran şahənşahlığında da mövcud idi. Tarixə baxın; tarixi zülmət bəşərin bütün həyatını bürümüşdü. Bu əzəmətli güclə birgə mübarizə aparmaq, dayanmadan və təsəvvürolunmaz fəaliyyətlər göstərmək peyğəmbərliyin və ilahi vəhyin ilk saatlarından başlandı. İlahi vəhy də həmişə yararlı torpağa verilən təmiz su kimi o həzrətin müqəddəs qəlbinə nazil olur, ona qüvvə bəxş edirdi. Və o bu dünyanı möhtəşəm bir dəyişikliyin başlanğıcına çatdırmaq üçün əlindən gələni etdi və .məqsədinə çatdı

Məkkənin çətin günlərində Peyğəmbərin (s) güclü əlləri ilə İslam ümmətinin ilk bünövrəsi qoyuldu. İslam ümmətinin binası bu bünövrə üzərində dayanmalı idi. İlk möminlər, bu biliyə, bu şücaətə və bu nüraniliyə malik olub Peyğəmbərin (s) sözünün mənasını dərk edən və ona könül verən ilk şəxslər bu bünövrəni təşkil edirdilər. "Allah (kimi düz yola yönəltmək istəsə, onun köksünü İslam (dini) üçün açıb genişləndirər".(۳



---

.Ələq/۱ [۹]-۱
.Nəhcül-bəlağə, xütbə: ۲ [۱۰]-۲
Ənam/۱۲۵[۱۱]-۳

Hazırlıqlı ürəklər, onların bu ilahi təlimlərə, ilahi əmrlərə sarı açıq qapıları Peyğəmbərin (s) güclü əlləri ilə düzəldi, zehinlər işıqlandı, iradələr günbəgün daha da möhkəmləndi. Məkkə dövründə azsaylı möminlərin qarşısına çıxan çətinliklər bizim üçün təsəvvüredilməzdir. Bütün dəyərlərin cahiliyyət dəyərləri olduğu, yanlış təəssübkeşliklərin, güclü ədavətlərin, qəddarlığın, rəhmsizliyin, zülmün və ehtirasın bir-birinə qarışıb həyatı ağırlaşdırdığı bir şəraitdə bərk və keçilməz qayalar arasında bu yaşıl ağaclar baş qaldırdı. Əmirəlmömininin (ə) Səhra ağacları bərk və alovu güclüdür(۱) cümləsinin mənası budur. Qayaların arasından cücərib boy atan bu bitkiləri, ağacları heç bir tufan tərpədə bilmirdi. On üç il ötəndən sonra bu möhkəm .təməllər üzərində İslam cəmiyyəti, sivil Peyğəmbər dövləti quruldu

## İslam quruluşunun əsasının qoyulması

Ümmət yetişdirmək işi yalnız siyasi sahəyə aid deyildi. Onun bir hissəsi siyasi sahədə idi, digər əsas hissəsi isə insanları bir-bir tərbiyə etmək: "(Əksəriyyəti yazıb-oxumaq bilməyən) ümmi ərəblərə özlərindən peyğəmbər göndərən Odur. (Bu Peyğəmbər) onlara (Allahın) ayələrini oxuyar, onları mənən təmizləyər, onlara kitabı və hikməti öyrədər"۲. Peyğəmbər (s) bir-bir bütün qəlbləri tərbiyə edirdi, bir-bir beyinlərə və ağıllara elm və bilik təlqin edirdi. "Onlara kitabı və hikməti öyrədər". Hikmət bir pillə üstündür. Onlara yalnız qanun-qaydaları, hökmləri öyrətmirdi, həm də hikmət öyrədirdi, həqiqətlərə gözlərini açırdı. Peyğəmbər (s) on il belə və bu üsulla hərəkət etdi; bir tərəfdən siyasət, İslam cəmiyyətinin idarəsi, müdafiəsi, İslamın əhatəsini genişləndirmək, Mədinədən xaricdəki qrupların tədricən və bir-bir İslamın və İslam təlimlərinin nurlu sahəsinə daxil



---

.Nəhcül-bəlağə, xütbə: ۴۵ [۱۲] -۱

olması üçün yol açmaq, digər tərəfdən də bir-bir insanların tərbiyəsi. Bu iki məsələni .bir-birindən ayırmaq olmaz

Bəziləri İslamı yalnız fərdi məsələ bilib siyasəti ondan aldılar. Halbuki hicrətin əvvəlində əziz İslam Peyğəmbərinin (s) özünü Məkkə dövrünün problemlərindən xilas etdikdən sonra gördüyü birinci iş siyasət idi. İslam cəmiyyəti, İslam hökuməti, İslam quruluşu qurmaq, İslam qoşunu yaratmaq, dünyanın böyük siyasətçilərinə məktub yazmaq, dövrün nəhəng siyasi işlərinə qoşulmaq siyasətdir. İslamı siyasətdən ayırmaq mümkündürmü?! Siyasəti İslam hidayətindən uzaq izah etmək, formalaşdırmaq mümkündürmü?! Quranı (müxtəlif) hissələrə bölən kəslər...(١) Bəziləri Quranı parça-parça edirlər. Bəzisinə inanır, bəzilərinə isə inanmırlar(٢); Quranın ibadətinə iman gətirir, siyasətinə isə iman gətirmirlər. Biz peyğəmbərlərimizi açıq-aşkar dəlillərlə (möcüzələrlə) göndərdik. Biz onlarla birlikdə kitab və ədalət tərəzisi (şəriət) nazil etdik ki, insanlar ədalətlə rəftar etsinlər(٣). Ədalət nədir? Ədalət cəmiyyətdə ictimai ədaləti bərqərar etməkdir. Bunu kim bərqərar edə bilər? Ədalətli cəmiyyət qurmaq siyasi işdir, hakimiyyətin işidir. Bu, peyğəmbərlərin məqsədidir. Yalnız bizim Peyğəmbər (s) yox, hətta İsa (ə), Musa (ə), İbrahim (ə) və bütün ilahi peyğəmbərlər siyasət və İslam (quruluşu qurmaq üçün gəlmişlər. (٢٠٠۶

Əziz Peyğəmbərin (s) Mədinədə onillik İslam hakimiyyəti zamanı həyatı bəşəriyyət tarixində ən parlaq hökumət dövrlərindən biri və hətta deyə bilərik ki, onların ən .parlağıdır



---

.Hicr/٩١ [١۴]-١

Nisa surəsinin ١۵٠-١۵١-ci ayəsinə işarə vurulur: Allahı və peyğəmbərlərini inkar [١۵] -٢ edənlər, Allahı peyğəmbərlərindən ayırmaq istəyənlər, “Biz peyğəmbərlərdən bəzisinə inanır, bəzilərinə isə inanmırıq”, - deyənlər və bunun (imanla küfr) arasında bir yol (məzhəb) tapmaq istəyənlər - bütün bunlar, həqiqətən, kafirdirlər. Biz (axirətdə) !kafirlərdən ötrü alçaldıcı əzab hazırlamışıq

.Hədid/٢۵ [١۶]-٣

Bəşər tarixinin qısa, səmərəli və qeyri-adi təsirə malik olan bu dövrünü öyrənmək lazımdır. Mədinə dövrü Peyğəmbərin (s) iyirmi üç illik elçilik missiyası dövrünün ikinci dönəmidir. Məkkədə keçən on üç il birinci dönəmi təçkil edirdi. Təxminən on il də Peyğəmbərin (s) Mədinə dövrü - İslam quruluşunun əsasını qoymaq, bütün zamanlar, əsrlər və bütün məkanlar üçün İslam hakimiyyəti örnəyini qurmaq dövrüdür. Sözsüz ki, bu, ideal örnəkdir və heç bir dövrdə onun kimisi olmayıb. Lakin bu ideal örnəyə baxmaqla meyarları öyrənmək olaq. Bu meyarlar insanların, müsəlmanların quruluş .və cəmiyyətlər haqda mühakimə yürütmələri üçün əlamətlərdir

Mədinəyə hicrət etməkdə Peyğəmbərin (s) məqsədi o zaman bütün dünyaya hakim olan zalım, despot və fəsad dolu siyasi, iqtisadi və ictimai sistemlə mübarizə aparmaq idi. Məqsəd təkcə Məkkə kafirlərinə qarşı mübarizə deyildi, qlobal məsələ idi. Əziz Peyğəmbər (s) cücərməsinə ümidlə münasib zamanda düşüncə və etiqad toxumu səpməyə çalışırdı. Məqsəd azadlıq, oyanış və insan xoşbəxtliyi mesajının hamıya çatması idi. Bu, yalnız nümunə və örnək quruluş yaratmaqla mümkün olardı. Peyğəmbər (s) bu örnəyi göstərmək məqsədilə Mədinəyə getdi. Digərlərinin onu nə qədər davam etdirə, özlərini ona nə qədər yaxınlaşdıra bilmələri onların səyindən asılıdır. Peyğəmbər (s) nümunəni qurub bütün bəşəriyyətə və tarixə təqdim edir. Peyğəmbərin (s) qurduğu quruluşun müxtəlif xüsusiyyətləri var. Onların arasında .yeddi xüsusiyyət hamısından mühümdür

Birinci xüsusiyyət iman və mənəviyyatdır. Peyğəmbər (s) quruluşunu inkişaf etdirən həqiqi amil xalqın qəlbindən və düşüncəsindən qaynaqlanan, onların vücudunu düzgün istiqamətdə hərəkətə gətirən iman idi. Deməli, birinci xüsusiyyət insanlara iman və mənəviyyat ruhu üfürmək, onu gücləndirmək, düzgün etiqad və düşüncə verməkdir. .Peyğəmbər (s) bu işə Məkkədə başladı və onu Mədinədə qüdrətlə davam etdirdi

**.Mədinədə qüdrətlə davam etdirdi**

İkinci xüsusiyyət ədalətdir. Əsas iş ədalət və heç bir şeyi nəzərə almadan hər bir haqqı .sahibinə çatdırmaqdır

Üçüncü xüsusiyyət elm və bilikdir. Peyğəmbər (s) quruluşunda hər şeyin təməli bilmək, tanımaq, ayıqlıq və oyanışdır. Heç kəsi kor-koranə şəkildə bir işə dəvət etmirlər. Xalqı .ayıq, məlumatlı şəkildə və seçim imkanları ilə aktiv qüvvəyə çevirirlər

Dördüncü xüsusiyyət səmimilik və qardaşlıqdır. Peyğəmbər (s) quruluşunda xurafatçılıqdan, şəxsi maraqlardan, mənfəətgirlikdən yaranan çəkişmələr pislənmişdir və onlara qarşı mübarizə aparılır; cəmiyyət qardaşlıq və həmrəyliyin olduğu səmimi .cəmiyyətdir

Beşinci xüsusiyyət əxlaq və rəftarda düzgünlükdür. İnsanları mənəvi cəhətdən paklayır, əxlaq fəsadlarından və qəbahətlərdən təmizləyir, əxlaqlı və mənən saf insan yetişdirir: Onları mənən paklayar, onlara kitabı və hikməti öyrədər.(۱) Mənəvi paklıq əsas şərtlərdən biridir. Yəni Peyğəmbər (s) insanların hər biri üzərində tərbiyə və .insanlıq baxımından işləyir

Altıncı xüsusiyyət iqtidar və izzətdir. Peyğəmbər (s) cəmiyyəti və quruluşu başıqapazlı, asılı, başqasının ardınca düşən və ona-buna əl açan deyil, izzətli, iqtidarlı və qərarlıdır; .öz xeyrini bildikdə onu təmin etmək üçün çalışır və işlərini idarə edir

Yeddinci xüsusiyyət iş, hərəkət və daimi inkişafdır. Peyğəmbər (s) quruluşunda dayanmaq yoxdur, daim hərəkət, iş və inkişaf var. Nə zamansa demirlər ki, daha bitdi, indi oturub istirahət edək. Belə bir şey yoxdur. Təbii ki, bu iş ləzzətli və sevimli işdir, .yorucu deyil, insana həvəs, qüvvə və şövq verir

Peyğəmbər (s) belə bir quruluş yaratmaq, onu təkmilləşdirmək, örnək kimi bütün tarixə göstərmək üçün Mədinəyə daxil oldu. Ondan sonra qiyamətə qədər kim nə



---

۱- [۱۷] Ali-İmran/۱۶۴.

zaman bacarsa, onun kimisini qurub ürəklərdə həvəs yaratmalı və insanlar belə bir cəmiyyəti arzulamalı idilər. Əlbəttə, belə bir quruluşun yaranması üçün etiqadi və .insani təməllərə ehtiyac var

Əvvəlcə düzgün etiqad və düşüncələri mövcud olmalı və bu quruluş o düşüncələrin əsasında qurulmalıdır. Peyğəmbər (s) bu düşüncə və fikirləri onüçillik Məkkə dövründə tövhid sözü, insan ucalığı və digər İslam təlimləri şəklində izah etmişdi. Sonra da ömrünün sonuna qədər həmişə Mədinədə bu quruluşun təməlləri olan bu uca .düşüncələri və təlimləri daim insanlara anlatdı və öyrətdi

Bu quruluşun yaranması üçün ikinci növbədə insani amillərə ehtiyac var. Çünki İslam quruluşu bir fərdlə qurulmur. Peyğəmbər (s) bu insanların bir çoxunu Məkkədə yetişdirmiş, hazırlamışdı. Peyğəmbərin (s) böyük səhabələrindən ibarət və aralarında dərəcə fərqləri olan bir qrup insan vardı. Bunlar onüçillik ağır Məkkə dövrünün zəhmətinin bəhrəsi idilər. Bir qrup da Peyğəmbərin (s) hicrətindən öncə Yəsribdə onun sözü ilə yetişmişdilər; misal üçün, Səd ibn Məaz, Əbu Əyyub və digərləri. Peyğəmbər (s) Mədinəyə daxil olduğu andan kadr hazırlamağa başladı. Bu uca quruluşun möhkəm təməlləri olan bacarıqlı idarəçilər, böyük, cəsur, fədakar, imanlı, güclü və mərifətli .insanlar tədricən Mədinəyə daxil oldular

Peyğəmbərin (s) hicrətindən öncə bu şəhərin adı Yəsrib idi, o həzrətin gəlişindən sonra isə Mədinətün-Nəbi - yəni Peyğəmbər şəhəri adlandı. Peyğəmbərin (s) Mədinəyə daxil olduğu andan bu mühacirət gözəl bahar mehi kimi bütün şəhəri bürüdü, hamı qurtuluş yarandığını duydu, qəlblər oyandı. Əhali Peyğəmbərin (s) Mədinənin yaxınlığında yerləşən Qubaya daxil olduğunu eşitdikdə - o həzrət on beş gün orada qalmışdı – ürəklərində onu görmək həvəsi daha da artdı. Əhalinin bir qismi oraya gedib Peyğəmbəri (s) ziyarət edir və qayıdırdılar, bir qismi də Mədinəyə gəlişini gözləyirdilər. Peyğəmbər (s) Mədinəyə daxil olanda bu şövq, bu xəfif və

mülayim meh xalqın qəlbində bir tufana çevrildi və ürəkləri dəyişdirdi. Qəfildən öz qəbilə inamlarının, hisslərinin, əlaqə və təəssübkeşliklərinin bu kişinin simasında, onun rəftarının və sözünün təsirindən məhv olduğunu, yaradılış aləminin həqiqətlərinə və əxlaqi bilgilərə açılan yeni darvaza ilə tanış olduqlarını hiss etdilər. Əvvəlcə qəlblərdə inqilab yaradan, sonra Mədinə ətrafına qədər genişlənən, daha sonra Məkkə qalasını fəth edən, nəhayət uzaq yollara qədəm qoyub o zamanın iki böyük imperiyasının dərinliklərinə işləyən və getdiyi hər bir yerdə ürəkləri oyadan, insanların daxilində dəyişiklik yaradan amil bu tufan idi. Müsəlmanlar erkən İslam çağında İran və Romanı iman gücü ilə fəth etdilər. Bu imanı görən kimi hücuma məruz qalan xalqların qəlbində də iman yaranırdı. Xəncər maneələri – sərvətli və güclü sərkərdələri yoldan götürmək üçün idi. Xalq isə hər yerdə bu tufanı dərk etmişdi. O zaman iki böyük imperiya olan yəni Roma və İran İslam quruluşunun və ölkəsinin bir hissəsinə çevrilmişdilər. Bütün .bunlar qırx il sürdü; on ili Peyğəmbərin (s) dövründə, otuz ili də ondan sonra

Peyğəmbər (s) Mədinəyə daxil olan kimi işə başladı. O həzrətin həyatının möhtəşəm xüsusiyyətlərindən biri budur ki, bu on il ərzində bir anı də hədər vermədi. Peyğəmbərin (s) mənəviyyat, hidayət, təlim və tərbiyə işinin bir an da dayanması görünmədi. Onun oyaqlığı, yuxusu, məscidi, evi, döyüşü, küçə və bazara getməsi, ailədə rəftarı – bütün varlığı dərs idi. Belə bir ömür möhtəşəm faydalarla doludur! O, bütün tarixi öz düşüncəsi ilə fəth etdi, bütün tarixdə təsir buraxdı. Mən dəfələrlə demişəm ki, əsrlər sonra bəşəriyyət üçün müqəddəsləşən bir çox məsələlər, o cümlədən bərabərlik, qardaşlıq, ədalət və demokratiya anlayışları onun təlimlərindən təsirlənmişdir. Digər dinlərin təlimlərində belə şeylər ya yox idi, ya da ən azı açıqlanmamışdı. O yalnız on il hökumət işi, siyasi və ictimai iş gördü. Necə faydalı .ömürdür! Daxil olan kimi öz mövqeyini müəyyən etdi

Peyğəmbərin (s) mindiyi dəvə Yəsrib şəhərinə daxil oldu. Xalq onu dövrəyə aldı. O zaman Mədinə şəhəri məhəllələrə bölünürdü. Hər məhəllənin özü üçün evləri, küçələri, hasarı və böyükləri vardı və müəyyən bir qəbiləyə məxsus idi; Övs və Xəzrəcə bağlı olan qəbilələrə. Peyğəmbərin (s) dəvəsi Yəsrib şəhərinə daxil olanda hansı qəbilənin qalasının qarşısına çatırdısa, böyüklər bayıra çıxıb dəvənin önündə dayanır, deyirdilər ki, ey Allahın rəsulu, buraya gəl, bizim evimiz, sərvətimiz, imkanlarımız sənin olsun. Peyğəmbər (s) buyururdu ki, dəvənin yolunu açın, o, aldığı əmrə görə hərəkət edir, qoyun getsin.(۱) Beləliklə dəvənin yolunu açırdılar və o, sonrakı məhəlləyə çatırdı. Yenə böyüklər, varlılar, qocalar, böyük şəxsiyyətlər və gənclər qarşıya çıxıb dəvənin önünü kəsir, o həzrətə deyirdilər ki, ey Allahın rəsulu, burada en, bura sənin evindir, nə istəsən, verəcəyik, hamımız sənə xidmət göstərəcəyik. Buyururdu ki, dəvənin yolunu açın, qoyun getsin, o, aldığı əmrə görə hərəkət edir. Dəvə beləcə məhəllə-məhəllə gəzirdi. Nəhayət, Peyğəmbərin (s) anasının mənsub olduğu Bəni-Nəccar məhəlləsinə çatdı. Onlar Peyğəmbərin (s) dayıları sayılırdılar. Buna görə qarşıya çıxıb dedilər ki, ey Allahın rəsulu, biz sənin qohumlarınıq, bizim canımız sənə fəda olsun, bizim yanımızda qal. Buyurdu ki, kənara çəkilin, bu dəvə aldığı əmrə görə hərəkət edir. Yolu açdılar. Dəvə Mədinə şəhərinin ən yoxsul məhəlləsinə çatıb yerdə oturdu. Hamı bu yerin kimə məxsus olması ilə maraqlandı. Gördülər ki, Mədinənin ən yoxsul adamı, yaxud ən yoxsullarından biri olan Əbu Əyyub Ənsarinin evidir. Özü və kasıb ailəsi gəlib Peyğəmbərin (s) əşyalarını evə apardılar. Peyğəmbər (s) də qonaq kimi onların evinə daxil oldu, əyan-əşrafa, nüfuzlu insanlara, qəbilə başçılarına və bu kimi şəxslərə isə rədd cavabı verdi. O özünün ictimai mövqeyini müəyyən etdi. Bəlli oldu ki, bu şəxs pula, ,qəbilə nüfuzuna, filan qəbilə rəisinə, qohum-əqrəbaya



---

.Bihar əl-ənvar, c. ۱۹, səh: ۱۰۹ [۱۸] -۱

üzlü və bu kimi adamlara bağlı deyil və olmayacaq. İlk andan ictimai münasibətlərdə hansı qrupun, hansı təbəqənin tərəfdarı olduğunu və daha çox kimlərə xeyir verəcəyini müəyyən etdi. Peyğəmbərdən (s) və onun təlimlərindən hamı faydalanır, amma daha məhrum olan təbii ki, daha artıq haqq götürür və məhrumluğunun əvəzi .verilir

Əbu Əyyub Ənsarinin evinin qarşısında istifadəsiz torpaq vardı. Buyurdu ki, bu torpaq kimindir? Dedilər ki, iki yetim uşağa məxsusdur. Özü pul verib o yeri aldı, sonra buyurdu ki, bu yerdə məscid tikəcəyik; yəni siyasi, ibadi, ictimai və idari mərkəz və xalqın toplantı yeri. Toplaşmaq üçün yer lazım idi. Odur ki, məscid tikməyə başladılar. Məscidin torpağını kimdənsə istəmədi, bağışlanmasını da gözləmədi, öz pulu ilə aldı. O iki uşağın atası və himayədarı olmasa da, Peyğəmbər (s) onların atası və himayədarı kimi haqlarına tam şəkildə riayət etdi. Məscidi tikməyə başlayanda Peyğəmbərin (s) özü əlinə bel götürüb məscidin bünövrəsini qazmağa başalayn ilk şəxslərdən, yaxud ilk şəxs oldu. Formal olaraq yox, həqiqətən işə başladı və tər tökdü. Elə işlədi ki, kənarda oturan bəzi şəxslər dedilər biz oturaq, Peyğəmbər (s) isə bu şəkildə işləsin?! Qalxın biz də işləyək. Odur ki, qısa müddətdə məscidi inşa etdilər. Uca və qüdrətli rəhbər olan Peyğəmbər (s) göstərdi ki, özü üçün heç bir xüsusi haqq tanımır, bir iş görülməlidirsə, həmin işdə onun da rolu olmalıdır. Sonra o quruluşun idarəetmə siyasətini tənzim etdi. İnsan baxdıqda, tədbirli və ağıllı şəkildə addım-addım irəlilədiyini gördükdə o əzmkarlığın, güclü qərar və qətiyyətin arxasında hansı düşüncənin, fikrin və dəqiqliyin durduğunu və güman ki, bunun ilahi vəhydən başqa bir yolla mümkün olmadığını anlayır. Bu gün də həmin on ilin vəziyyətini addım-addım izləmək istəyən şəxslər bir şey anlamırlar. Əgər insan hər bir hadisəni ayrı-ayrılıqda incələsə, bir şey anlamaz; gərək işlərin ümumi gedişinə, bütün bu işlərin necə tədbirlə, ağılla və dəqiqliklə həyata .keçirildiyinə baxsın

Birinci iş birlik yaratmaqdır. Mədinə əhalisinin hamısı müsəlman deyildi; əksəriyyəti müsəlman oldu, çox az bir qismi isə qeyri-müsəlman qaldı. Bundan əlavə, özlərinin təxminən Mədinəyə yapışmış xüsusi qalalarında üç mühüm yəhudi qəbiləsi yaşayırdı: Bəni-Qeyn-Qa qəbiləsi, Bəni-Nəzir qəbiləsi və Bəni-Qüreyzə qəbiləsi. Bunların Mədinəyə gəlişi ١٠٠-٢٠٠ il ondan öncəyə qayıdırdı.Gəlmələrinin səbibi də uzun .söhbətdir

**.Gəlmələrinin səbəbidə uzun söhbətdir**

Əziz Peyğəmbərin (s) Mədinəyə daxil olduğu dövrdə bu yəhudilərin iki-üç xüsusiyyəti vardı. Biri bu idi ki, Mədinənin əsas sərvəti, ən yaxşı əkinçilik sahələri, ən qazanclı ticarətlər, ən gəlirli sahə olan zərgərlik və digər bu kimi sənətlər onların əlində idi. Mədinə əhalisinin çoxu ehtiyacları olanda onlara müraciət edib borc alır, sələm götürürdülər. Yəni maliyyə baxımından hamı onlardan asılı idi. İkincisi budur ki, Mədinə əhalisinə nisbətən mədəni üstünlükləri vardı. Onlar kitab əhli, Mədinənin yarımvəhşilərinin çox uzaq olduqları müxtəlif bilgilərlə və dini təlimlərlə tanış olduqlarına görə elm və düşüncə baxımından üstün mövqedə idilər. Bugünkü dillə ifadə etmək istəsək, deməliyik ki, onlar Mədinədə ziyalı təbəqəni təşkil edirdilər. Buna görə oranın əhalisini axmaq sayır, təhqir və məsxərə edirdilər. Sözsüz ki, təhlükəyə məruz qalanda və lazım olanda təvazökarlıq da edirdilər, lakin normalda üstünlüyə .malik idilər

Üçüncü xüsusiyyətləri bu idi ki, uzaq yerlərlə də əlaqələri vardı, yalnız Mədinə şəhərində qapılıb qalmamışdılar. Bunlar Mədinədə real qüvvə idilər. Buna görə də, Peyğəmbər (s) bunlar haqda düşünməli idi. Əziz Peyğəmbər (s) ümumi bir müqavilə hazırladı. O həzrət Mədinəyə daxil olanda heç bir müqavilə imzalamadan, xalqdan heç bir şey istəmədən və xalq arasında heç bir müzakirə aparılmadan cəmiyyətin rəhbəri olması bəlli idi. Yəni Peyğəmbərin (s) şəxsiyyəti və əzəməti təbii şəkildə hamını onun qarşısında kiçiltdi; bəlli oldu ki, o, rəhbərdir və hamı onun sözü ilə hərəkət etməli, çalışmalıdır. Peyğəmbər (s) hamı tərəfindən qəbul olunan bir

müqavilə hazırladı. Müqavilə ictimai və ticarət əlaqələri, münaqişələr, qan bahası, Peyğəmbərin (s) müxaliflər, yəhudilər və qeyri-müsəlmanlarla münasibətləri barədə idi. Bunların hamısı yazıldı və qeyd olundu. Bu həm də genişdir; qədim tarixə aid böyük .kitabların iki-üç səhifəsini əhatə edir

Çox əhəmiyyətli olan sonrakı addım qardaşlıq yaratmaq idi. Zadəganlıq, xurafatçı təəssübkeşliklər, qəbilə qüruru və xalqın müxtəlif təbəqələrinin bir-birinə özgəliyi ozamankı təəssübkeş və cahil ərəb cəmiyyətlərinin ən böyük bəlası idi. Peyğəmbər (s) qardaşlıq yaratmaqla bunları ayaqları altına atdı. Bir qəbilə başçısı ilə çox aşağı və orta səviyyəli bir adam arasında qardaşlıq yaradaraq dedi ki, siz iki nəfər bir-birinizlə qardaşsınız. Onlar da bu qardaşlığı könüldən qəbul etdilər. Zadəganları və böyük şəxsləri müsəlman olmuş və azadlığa çıxmış qullarla bir tutdu. Bu işlə ictimai birliyin bütün maneələrini ortadan götürdü. Məscidə azançı seçmək istəyəndə səsi və görkəmi gözəl olanlar çox idilər, çoxlu məşhur adamlar və görkəmli şəxsiyyətlər vardı. Amma bütün bunların arasından Bilal Həbəşini seçdi; nə gözəllik, nə səs, nə əsil-nəsəb və nə ata-ana şərafəti nəzərə alındı, yalnız İslam, iman, Allah yolunda mücahidlik və fədakarlıq göstərmək meyar seçildi. Görün dəyərləri əməldə necə müəyyən etdi! Onun .sözündən çox əməli, rəftarı və davranışı insanlara təsir edirdi

### İslam quruluşunu qorumaq

Bu işi nizama salmaq üçün üç mərhələ vardı: Birinci mərhələ quruluşun əsasını qoymaq idi. Bu, sözügedən işlərlə baş tutdu. İkinci mərhələ bu quruluşu qorumaq idi. Bütün hakim qüvvələrin təhlükə duyduğu canlı və dinamik varlığın təbii ki, düşməni olmalıdır. Əgər Peyğəmbər (s) bu mübarək quruluşu düşməndən ağıllı şəkildə qoruya bilməsə, məhv olar və bütün zəhmətləri hədər gedər. Buna görə də, onu qorumalıdır. Üçüncü mərhələ təkmil etməkdən və quruculuqdan ibarətdir. Əsasını qoymaq birinci addımdır və

kifayət etmir. Bu üç iş bir-birinin yanında görülməlidir. Təməlini qoymaq birinci dərəcəlidir, amma bunda da düşmənlər nəzərə alınmışdır və bundan sonra keşik davam edəcək. Təməl qoymaq işində şəxslərin və ictimai təsisatların quruculuğuna da diqqət yetirilmişdir və bundan sonra da davam edəcək. Peyğəmbər (s) baxıb görür ki, :yeni doğulmuş İslam cəmiyyətini beş əsas düşmən təhdid edir

Bəzən kiçik və az əhəmiyyətli düşmən də böyük təhlükə törədə bilər. Ona əhəmiyyətsiz yanaşmaq olmaz. Bu düşmən kim idi? Mədinə ətrafında yaşayan .yarımvəhşi qəbilələr

Mədinədən ١٠, ١۵, ٢٠ fərsəng uzaqda iş-gücləri döyüşdən, qan tökməkdən, soyğunçuluqdan, bir-birinin canına düşməkdən və bir-birindən oğurluq etməkdən ibarət olan yarımvəhşi qəbilələr var. Əgər Peyğəmbər (s) Mədinədə sağlam, əmin-amanlı və dinc bir ictimai quruluş yaratmaq istəyirsə, bunları nəzərə almalıdır. Peyğəmbər (s) bunlar haqda düşündü. Onların hansında hidayətə ümid vardısa, onunla müqavilə bağlayırdı. Əvvəldə demədi ki, mütləq müsəlman olmalısınız. Xeyr! Onlar kafir və müşrik idilər, amma onlarla müqavilə bağladı ki, müsəlmanlara hücum etməsinlər. Peyğəmbər (s) öz müqaviləsinə çox sadiq qalırdı; bu haqda danışacağam. O, etimadsız quldurlara isə çarə qıldı, özü onlara sarı getdi. Eşitmisiniz ki, Peyğəmbər (s) əlli nəfəri filan qəbiləyə sarı yolladı, iyirmi nəfəri filan qəbiləyə sarı; bunlar həmin qəbilələrdir: xislət və təbiətləri sakitlik, hidayət və yaxşılıq qəbul etməyən, qan tökmədən və zorakılıq etmədən yaşaya bilməyənlər. Buna görə, Peyğəmbər (s) onları .məğlub etdi və yerlərində oturtdu

**İkinci düşmən mərkəz olan Məkkədir**

Düzdür, Məkkədə tam mənada bir hökumət mövcud deyildi, amma bir qrup təkəbbürlü, güclü və nüfuzlu zadəgan birlikdə Məkkənin hakimi sayılırdılar. Bunların bir-biri ilə ixtilafları vardı, lakin bu yeni doğulmuş İslam qarşısında əlbir olmuşdular. Peyğəmbər (s) əsas təhlükənin onlardan gəldiyini bilirdi. Bu sonradan təsdiqini də tapdı. Peyğəmbər (s) gördü ki, oturub onları

gözləsə, mütləq fürsət qazanacaqlar. Odur ki, onlara hücum planladı. Lakin Məkkəyə doğru hərəkət etmədi. Onların karvan yolu Mədinənin yaxınlığından keçirdi. Peyğəmbər (s) onlara qarşı hücumlara başladı. Əvvəldə bu hücumların ən mühümü Bədr döyüşü idi. Peyğəmbər (s) hücuma başladı, onlar da təəssübkeşlik və inadkarlıqla döyüşə gəldilər. (۲۰۰۱)

Böyük Allahın vədinə uyğun olaraq, müsəlmanlar bilirdilər ki, hicrətin ikinci ilində bir qrup kafirə qalib gələcəklər. Qüreyşin Şamdan gələn ticarət karvanı Mədinənin kənarından keçib Məkkəyə doğru gedirdi. Qüreyş kafirləri qəhrəman müsəlman döyüşçülərin planından xəbər tutanda öz sərvətlərini qorumaq üçün silahlı qüvvələrini Mədinəyə sarı yolladılar. Müsəlmanlar müdafiə qüvvəsi zəif olan ticarət karvanını saxlamağı daha çox arzulayırdılar. Allahın hökmü isə bu idi ki, Qüreyş kafirlərinin silahlı döyüşçülərinin qarşısına çıxsınlar: O zaman Allah sizə iki dəstədən birinin (Şamdan qayıdan karvanın və ya Məkkədən çıxıb onların köməyinə gələn Qüreyş əsgərlərinin) sizin olmasını vəd edirdi. Siz silahsız karvanı arzu edirdiniz(۱). Müsəlmanlar bu döyüşdə qalib gələcəklərini bilirdilər. Amma bu döyüşün Qüreyşin silahlı qüvvələri üzərində olacağını bilmirdilər; elə bilirdilər ki, Şamdan gələn karvan üzərində qələbə çalacaqlar. Peyğəmbər (s) isə yolu dəyişib onları döyüşçülərə sarı apardı. Karvan getdi və müsəlmanlar Bədr adlı yerdə kafirlərlə vuruşmalı oldular. Allah-Taalanın müsəlmanların yolunu karvana deyil, silahlı qüvvələrə sarı yönəltməsinin səbəbi nə idi? Səbəb bu idi ki, müsəlmanlar yaxını görürdülər, ilahi iradə isə uzaq bir məqsədi izləyirdi: Allah isə Öz sözləri (bu barədə nazil etdiyi ayə) ilə haqqı bərqərar etmək və kafirlərin kökünü kəsmək istəyirdi(۲). Allah məhv olmalı və məhv olası batilin birdəfəlik sonunu istəyirdi: (Allah bununla) günahkarların xoşuna gəlməsə də, haqqı bərqərar və batili yox



---

۱- [۱۹] Ənfal/۷.
۲- [۲۰] Yenə orada.

etmək istəyirdi(١). Məgər İslam bütün şeytani və tağut gücləri məhv etməyəcəkmi?! Məgər müsəlman ümməti (qiyamətdə) insanların əməllərinə şahid(٢) olmayacaqmı?! Məgər İslam bayrağı bəşəriyyətin başı üzərində dalğalanmayacaqmı?! Bəs nə zaman, ?necə və hansı yolla

O zaman müsəlmanlar fikirləşirdilər ki, biz bu qiymətli karvanı müsadirə etsək, gənc İslam güclənər. Düz fikirləşmişdilər, amma bundan üstün və dəyərli bir fikir də vardı. O fikir bu idi ki, Peyğəmbərin (s) ətrafında olan müsəlmanlar bu gün elə bir həddə çatmışlar ki, düşüncə və yollarını məzlum və məhrum cəmiyyətlərə, qaranlıq və zülmət dünyalara çatdıra bilirlər. Bu çeşmədə o qədər su var ki, axıb quru torpaqları və solğun ağacları suvara bilər. Bu daha uca fikirdir. İslam özünün həqiqi qələbəsini əldə etməli, əzəmət və qüdrətlə məzlumlar yaşayan bölgələrə getməlidirsə, zülm sarayları biri o birindən sonra devrilməlidirsə, bu haradansa başlanmalıdır. İslamın erkən çağının ixlaslı və səmimi müsəlmanı haradan başlanmasını bilmir, Allah isə ona öyrədir, onu istiqamətləndirir, Qüreyşin ticarət mallarını müsadirə etmək üçün çıxan həmin insanları istəmədən bir döyüşə yönəldir, həmin döyüşdə imkanların azlığına baxmayaraq, qətiyyətli iman sayəsində bir gündə düşməni geri oturdur, təsir, inkişaf və nüfuz üçün yol açır, haqqın güclənməsinə şərait yaradır, düşmənə başa salırlar ki, İslam var və siz onu ciddiyə almalısınız. Yəni ey müsəlmanlar, sizi böyük düşmən ordusu ilə üz-üzə qoyduq ki, onlara möhkəm zərbələrinizi daddıra və ilahi gücü (göstərəsiniz. (١٩٨٠

Bədr döyüşündə ilahi lütf, mərhəmət və müsəlmanların səyi nəticəsində İslam döyüşçülərinə ilahi qələbə nəsib olandan sonra bu tezliklə ədavətindən əl çəkməyən düşmən Ühüd döyüşünə hazırlaşdı. Ühüd döyüşündə müsəlmanlar birliklərinə görə ,əvvəldə yenə də düşmənin sıralarını yardılar



---

.Ənfal/٨ [٢١]-١

.Bəqərə/١٤٣ [٢٢]-٢

amma tez bir zamanda qələbəyə nail olandan sonra dağ keçidini qorumalı olan əlli nəfər qənimət toplamaq məqsədi ilə postlarını tərk edib qənimətlərə sarı və müsəlmanların qafilcəsinə toplaşdığı yerə tələsdilər. Dağ keçidini qorumağa təyin olunmuş müsəlmanların yalnız on nəfəri orada qalıb vəzifələrini yerinə yetirdilər. Bununla da düşmən dağın ətrafına fırlanıb yetərincə gözətçi olmayan keçiddən müsəlmanlara hücum etmək imkanı qazandı. Bu hücum müsəlmanlara ağır tamam oldu. İslam məğlub olmadı, amma əvvəla qələbəsi bir qədər gecikdi, ikincisi isə şəhidlər ağası Həmzə kimi şücaətli və əziz sərkərdələrin canı qurban getdi. Böyük Allah müsəlmanları ibrət almağa və düşünməyə çağırır; buyurur ki, biz öz vədimizə əməl etdik, sizin düşmənə qalib gələcəyinizi demişdik və qalib gəldiniz, amma sizdə bu üç xüsusiyyət yaranandan sonra düşməndən zərbə gördünüz: Zəiflik göstərdiniz, (sizə verilmiş) əmr haqda bir-birinizlə mübahisə etdiniz və (Peyğəmbərin) əmrindən çıxdınız(١). Əvvəla bir-birinizlə çəkişdiniz, birliyinizi və sıralarınızı pozdunuz; ikincisi zəiflədiniz, əvvəlki həvəsinizi, qəhrəmanlığınızı və hazırlığınızı əldən verdiniz; üçüncüsü isə başçınız və rəhbəriniz olan Peyğəmbərin fərmanına əməl etmədiniz, onun əmrindən boyun qaçırdınız. Sizdə bu üç xüsusiyyət yarananda düşmən də arxadan zərbə endirdi, İslamın ən əziz övladını qana boyadı, şəhid etdi və İslam dünyası belə (bir şəxsiyyəti əldən verdiyinə görə ziyan etdi. (١٩٨٠

Onların (Məkkənin təkəbbürlü və güclü zadəganlarının) Peyğəmbərə (s) qarşı son hücumları Xəndək döyüşü idi. Bu çox mühüm döyüşlərdən biri idi. Onlar bütün qüvvələrini topladılar, digərlərindən də kömək aldılar, dedilər ki, Peyğəmbəri (s) və onun yaxın adamlarından ٣٠٠, ٥٠٠ nəfəri qıracaq, Mədinəni də qarət edib qayıdacağıq; daha bunlardan heç bir əsər-əlamət qalmayacaq. Onlar Məkkəyə çatmazdan öncə Peyğəmbər (s) məsələdən hali oldu və məşhur xəndəyi



---

.Ali-İmran/١٥٢ [٢٣] -١

qazdı. Mədinənin bir tərəfi açıq idi. Orada təxminən qırx metr enində bir xəndək qazdılar. Ramazan ayı və bəzi rəvayətlərə görə hava çox soyuq idi. Həmin il yağıntı olmamışdı, qıtlıq və çoxlu problemlər yaranmışdı. Peyğəmbər (s) hamıdan çox işləyirdi. Xəndək qazanda kimin yorulduğunu, dayandığını və davam edə bilmədiyini görəndə gedib külüngü alır və işləməyə başlayırdı. Yəni təkcə əmr verməklə çalışmırdı, özü cəmiyyətin arasında idi. Kafirlər xəndəyin qarşısında dayanıb bu maneəni keçə bilmədilər; məğlub, rüsvayçı, məyus və nakam halda geri qayıtmağa məcbur oldular. Peyğəmbər (s) buyurdu ki, məsələ bitdi. Bu, Məkkə Qüreyşinin bizə son hücumu idi. .Bundan sonra növbə bizimdir. Biz Məkkəyə və onlara doğru gedəcəyik

Növbəti ildə Peyğəmbər (s) dedi ki, biz ümrə ziyarətinə getmək istəyirik. Çox mənalı hadisələrdən biri olan Hüdeybiyyə hadisəsi o zaman baş verdi. Peyğəmbər (s) ümrə ziyarəti məqsədi ilə Məkkəyə sarı hərəkət etdi. Onlar gördülər ki, Peyğəmbər (s) müharibənin yasaq olduğu hörmətli bir ayda Məkkəyə sarı gəlməkdədir. Nə etsinlər? Yolu açsınlar və gəlsin? Bu uğurdan sonra nə edəcək və onun qarşısında necə dayanacaqlar? Yoxsa döyüşün haram olduğu bir ayda gedib onunla vuruşsunlarmı? Necə vuruşsunlar?! Nəhayət qərara gəldilər ki, gedib onu Məkkəyə gəlməyə qoymayacaq və bəhanə tapsaq, hamısını qıracağıq. Peyğəmbərin (s) çox yüksək siyasəti sayəsində onlar Peyğəmbərlə (s) müqavilə imzaladılar ki, bu il qayıtsınlar və növbəti ildə gəlib ümrə ziyarətini yerinə yetirsinlər. Bununla bütün bölgədə Peyğəmbərin (s) təbliğatına şərait yarandı. Adı sülhdür, amma Allah-Taala Quranda buyurur: Biz sənə açıq-aşkar bir zəfər bəxş etdik.(١) İnsan düzgün və mötəbər tarixi qaynaqlara müraciət etsə, Hüdeybiyyə hadisəsinin nə qədər möhtəşəm olduğunu görər. Növbəti ildə, yəni hicrətin səkkizinci ilində Peyğəmbər (s) ümrə ziyarətinə getdi və onların istəyinin əksinə olaraq, o



---

١- [٢۴] Fəth/١.

həzrətin hörməti günbəgün artdı. Sonrakı il, yəni kafirlərin müqaviləni pozduğu səkkizinci ildə Peyğəmbər (s) gedib Məkkəni fəth etdi. Bu, Peyğəmbərin (s) qüdrətindən xəbər verən əzəmətli zəfər idi. Buna əsasən, Peyğəmbər (s) bu düşmənlə də ağılla, qüdrətlə, səbir və hövsələ ilə, özünü itirmədən və bir addım da geri .çəkilmədən rəftar etdi; günbəgün və anbaan irəlilədi

**Üçüncü düşmən yəhudilər idi**

Yəni hələlik Peyğəmbərlə (s) birgə Mədinədə yaşamağa razı olan, lakin əziyyət verməkdən, maneə törətməkdən və təxribatdan əl çəkməyən etimadsız əcnəbilər. Quranın Bəqərə və digər bəzi surələrinin mühüm hissəsi Peyğəmbərin (s) yəhudilərlə mədəni mübarizəsinə aiddir. Dedik ki, onlar mədəni və məlumatlı insanlar idilər, imanı zəif olanlara güclü təsir göstərir, təxribat aparır, xalqı məyus edir və bir-birinin canına salırdılar. Onlar mütəşəkkil düşmənlər idilər. Peyğəmbər (s) bacardığı qədər onlarla yola getdi, lakin sonradan buna layiq olmadıqlarını görüb onları cəzalandırdı. Peyğəmbər (s) həm də səbəbsiz yerə onların üstünə getmədi. Bu üç qəbilənin hər biri bir iş törətdi və Peyğəmbər (s) onlara uyğun cəzanı verdi. Əvvəlcə Bəni-Qeyn-Qa Peyğəmbərə (s) xəyanət etdi. Peyğəmbər (s) də onlara buyurdu ki, buradan getməlisiniz. Onları köçürtdü, o bölgədən qovdu və bütün imkanları müsəlmanlara qaldı. İkinci dəstə Bəni-Nəzir idi. Onlar daha mühüm xəyanət etdilər və Peyğəmbər (s) buyurdu ki, əşyalarınızdan bir qədərini götürün və gedin. Onlar da getməyə məcbur oldular. Üçüncü dəstə Bəni-Qüreyzə idi. Peyğəmbər (s) onların qalmasına icazə verdi, onları qovmadı, onlarla razılığa gəldi ki, Xəndək döyüşündə düşmənin məhəllələr tərəfindən Mədinəyə daxil olmasına imkan verməsinlər. Lakin onlar namərdlik edib düşmənlə razılaşdılar ki, onların yanında Peyğəmbərə (s) hücum etsinlər; yəni nəinki Peyğəmbərlə (s) razılaşmalarına sadiq qalmadılar, hətta düşmənlə danışıq apardılar və onlarla birgə məhəllələr tərəfdən Mədinəyə daxil olub Peyğəmbərə (s) arxadan xəncər vurmaq qərarına gəldilər. Peyğəmbər (s) Mədinənin bir

hissəsində Xəndək qazmışdı. Bunların məhəllələri isə digər tərəfdə idi və onlar .düşmənin həmin yerdən gəlməsinə mane olmalı idilər

Peyğəmbər (s) təxribat əsnasında məsələdən hali oldu. Mədinənin mühasirəsi bir ay sürdü. Bunlar bu bir ayın ortasında həmin xəyanəti etdilər. Peyğəmbər (s) bunların belə bir qərara gəldiklərini anladı. O çox ağıllı bir tədbirlə bunların Qüreyşlə arasını vurdu. Bunun təfərrüatını tarixdə yazmışlar. Bunlarla Qüreyşin bir-birinə etimadı sarsıldı. Peyğəmbərin (s) çox gözəl hərbi-siyasi hiylələrindən biri budur. Bunları hələlik dayandırdı ki, ziyan vura bilməsinlər. Qüreyş və müttəfiqləri məğlub olub Məkkəyə qayıdanda Peyğəmbər (s) də Mədinəyə döndü. Elə həmin gün zöhr namazını qılıb buyurdu ki, əsr namazını Bəni-Qüreyzə qalalarının önündə qılacağıq; yola düşün, oraya gedirik. Yəni hətta bir gecə də gözləmədi, gedib onları mühasirəyə aldı. Bu mühasirə və döyüş ۲۵ gün davam etdi. Peyğəmbər (s) bunların bütün döyüşçü kişilərini qətlə yetirdi. Çünki bunların xəyanəti daha böyük və düzələsi deyildi. Peyğəmbər (s) bunlarla belə rəftar etdi, əsasən Bəni-Qüreyzə, ondan öncə Bəni-Nəzir və sonra Xeybər yəhudilərinin ədavətini belə ağılla, qüdrətlə, qətiyyətlə və uca insani əxlaqla müsəlmanlardan uzaqlaşdırdı. Bu hadisələrin heç birində Peyğəmbər (s) əhdini pozmadı. Hətta İslam düşmənləri də qəbul edirlər ki, Peyğəmbər (s) bu məsələlərdə .heç bir müqaviləni pozmadı. Müqaviləni pozan onlar idilər

Dördüncü düşmən xalqın arasında olan münafiqlər idilər. Onlar dildə iman gətirmiş, əslində isə imanı olmayan rəzil, ədavətli, dar düşüncəli, düşmənlə əməkdaşlığa hazır olan, lakin təşkilatlanmamış insanlar idilər. Onların yəhudilərlə fərqi bu idi. Peyğəmbər (s) hücuma hazır olan və fürsət gözləyən mütəşəkkil düşmənə qarşı, yəhudilərlə etdiyi kimi rəftar edir, aman vermir, təşkilatlanmamış, fərdi inad, ədavət və xəbislikləri olan .imansız düşmənlərə isə dözür

Abdullah ibn Übəy Peyğəmbərin (s) ən qatı düşmənlərindən biri idi. Bu şəxs Peyğəmbərin (s) həyatının təxminən son ilinə qədər sağ idi. Peyğəmbər (s) ona qarşı pis rəftar etmədi. Onun münafiq olduğunu hamı bilsə də, Peyğəmbər (s) onunla keçinir, digər müsəlmanlar kimi rəftar edir, beytülmaldan payını verir, təhlükəsizliyini təmin edir və hörmətini saxlayırdı. Onlar isə Peyğəmbərə (s) qarşı çoxlu pislik və xəbislik edirdilər. Bəqərə surəsinin bir hissəsi də bu münafiqlərə aiddir. Onların bir qrupu mütəşəkkil cinayət törədəndə Peyğəmbər (s) onları cəzalandırdı. Onlar Zirar məscidi hadisəsində bir mərkəz yaradaraq İslam quruluşundan xariclə – yəni Romada olan Əbu Amir Rahib kimi bir şəxslə əlaqə qurdular, Romadan Peyğəmbərin (s) əleyhinə qoşun yeridilməsinə hazırlıq gördülər. Bu zaman Peyğəmbər (s) onlara hücum etdi, tikdikləri məscidi dağıdıb yandırdı və buyurdu ki, bu, məscid deyil, məscid, Allahın adı və xalq əleyhinə təxribat mərkəzidir. Yaxud həmin münafiqlərin bir qrupu öz küfrlərini aşkar edib Mədinədən getdikləri və qoşun topladıqları zaman Peyğəmbər (s) onlara qarşı mübarizə apardı; buyurdu ki, yaxınlaşsalar, gedib onlarla vuruşacağıq. Halbuki Mədinənin daxilində münafiqlər vardı, amma Peyğəmbərin (s) onlarla işi yox idi. Buna əsasən, üçüncü dəstəyə qarşı qətiyyətli və təşkilati şəkildə, dördüncü dəstə ilə isə mülayim rəftar etdi; çünki bunlar təşkilatlanmamışdılar və təhlükələri fərdi .xarakter daşıyırdı. Peyğəmbər (s) öz rəftarı ilə çox zaman bunları utandırırdı da

Beşinci düşmənə gəlincə isə, bu düşmən müsəlman və mömin şəxslərin hər birinin daxilində olan düşməndən ibarət idi. Ən təhlükəli düşmən də budur. Bu düşmən bizim daxilimizdədir: nəfsi təmayüllər, xudpəsəndlik, yayınmaya, şəraitini insanın özünün hazırladığı azğınlığa meyl. Peyğəmbər (s) bu düşmənə qarşı da güclü mübarizə apardı. Lakin bu düşmənlə mübarizə xəncər mübarizəsi deyil, tərbiyə, mənəvi təmizləmə, təlim və xatırlatmadır. Odur ki, insanlar o qədər zəhmətlə müharibədən qayıtdıqda (Peyğəmbər (s

buyurdu ki, siz kiçik cihaddan qayıtdınız, indi böyük cihadla məşğul olun. Qəribədir! Ey Allahın rəsulu! Böyük cihad nədir? Biz bu böyüklükdə və bu qədər zəhmətli cihadı yerinə yetirdik, məgər bundan da böyük cihad varmı?! Buyurdu ki, bəli, bu, öz nəfsinizlə cihaddır.(١) Quranın Qəlblərində (ruhlarında) xəstəlik olanlar(٢) sözü münafiqlərə aid deyil. Düzdür, münafiqlərin bir qismi də belədir, lakin qəlbində xəstəlik olan hər bir adam münafiq deyil. Bəzən möminin də ruhunda xəstəlik olur. Bu xəstəlik nədir? Yəni əxlaqi zəiflik, eqoistlik, nəfsə pərəstiş və müxtəlif istəklərə uymaq. Bunun qarşısını almasan, özün bununla mübarizə aparmasan, imanını əlindən alacaq və səni daxildən yeyəcək. İmanın alındıqda isə qəlbin imansız, zahirin isə imanlı olacaq. Və .belə bir şəxsin adı münafiqdir

Allah eləməmiş, mənim və sizin qəlbimiz imansız, zahirimiz isə imanlı olsa, etiqad və imanı əldən versək, dilimiz isə əvvəlki iman sözlərini söyləsə, bu, münafiqlik olar. Bu da təhlükəlidir. Quran buyurur: Sonra da Allahın ayələrini yalan hesab edib onları məsxərəyə qoymaqla pislik edənlərin aqibəti lap pis oldu!(٣) Pis iş görənlərə ən pisi qismət olacaq. Ən pisi nədir? Allahın ayələrini təkzib etmək. Başqa bir yerdə bu böyük vəzifəyə - Allah yolunda ehsan etməyə əməl etməyənlər haqda buyurur ki, Allah da onların ürəyinə qarşılaşacaqları günə (qiyamət gününə) qədər (davam edəcək) nifaq saldı.(٤) İslam cəmiyyəti üçün böyük təhlükə budur. İslam cəmiyyəti tarix boyu bu cəhətdən yayınmışdır. Xarici düşmənin məğlub və tar-mar edə bilər, amma məhv edə bilməz. Hər halda, iman qalır və haradasa baş qaldırır, yenidən cücərir. Bu daxili düşmən qoşununun hücum etdiyi və insanın daxilini boşaltdığı zaman yol yayınır. ,Harada yayınma varsa



---

١- [٢٥] Vəsail əş-Şiə, c. ١١, səh: ١٢٢.

٢- [٢۶] Tövbə/١٢٥.

٣- [٢٧] Rum/١٠.

۴- [٢٨] Tövbə/٧٧.

.bundan qaynaqlanır. Peyğəmbər (s) bu düşmənlə də mübarizə apardı

Peyğəmbər (s) ağıllı rəftar edir və gecikmirdi. O heç bir hadisədə vaxtın ötməsinə qoymadı. Qənaətcil və pak insan idi, şəxsiyyətində heç bir mənfi cəhət yox idi, məsum və pak idi. Bunun özü digərlərinə təsir baxımından ən mühüm amildir. Biz gərək öyrənək. Bu sözlərin çoxunu mənə deməlidirlər; mən öyrənməliyəm, məmurlar öyrənməlidirlər. Əməllə edilən təsir dillə edilən təsirdən dəfələrlə əhatəli və dərindir. O, qətiyyətli və açıq danışan vardı. Peyğəmbər (s) heç zaman ikibaşlı danışmadı. Təbii ki, düşmənlə qarşılaşdığı zaman dəqiq siyasi iş görür və düşməni səhvə salırdı. Peyğəmbər (s) çox yerdə hərbi və ya siyasi baxımdan düşməni mat qoymuşdur. Lakin möminlərlə və öz xalqı ilə həmişə açıq, şəffaf və aydın danışardı, siyasətbazlıq etməzdi. Lazım olan yerlərdə yumşaqlıq göstərirdi; misal üçün, Abdullah ibn Übəyə qarşı. O heç zaman xalqla, hətta düşmənləri və Məkkə müşrikləri ilə bağladığı müqaviləni pozmadı. Peyğəmbər (s) onlarla bağladığı müqavilələrə sonadək sadiq qaldı. Onlar pozdular və Peyğəmbər (s) də qətiyyətli cavab verdi. Hamı bilirdi ki, bu .şəxslə müqavilə bağladıqda ona güvənmək olar

Digər tərəfdən, Peyğəmbər (s) öz ibadətini yaddan çıxarmadı, Allahla əlaqəsini günbəgün gücləndirdi. Döyüş meydanında öz qüvvələrini nizama salanda, döyüşə həvəsləndirəndə, özü əlinə silah götürüb qətiyyətlə komandanlıq edəndə, onlara nə etməli olduqlarını başa salanda da dizi üstə oturub əllərini qaldırır və xalqın önündə göz yaşı töküb Allahla danışmağa başlayırdı: İlahi! Sən bizə kömək et. İlahi! Sən bizə dayaq ol. İlahi! Sən Özün düşmənlərini dəf et!. Nə onun duası qüvvəsini işlətməməyə səbəb olurdu, nə də qüvvəsini işlətməyi təvəssülü, duanı və Allahla rabitəni unutmağa; hər ikisinin öz yeri vardı. O heç zaman inadkar düşmən qarşısında qorxuya düşmədi. Şücaət simvolu olan Əmirəlmöminin (ə) deyir ki, döyüşdə vəziyyət ağırlaşanda .Peyğəmbərə (s) sığınırdıq; kim çətinliyə düşürdüsə, Peyğəmbərə (s) sığınırdı

O, ١٠ il hakimiyyətdə oldu. Biz bu ١٠ ildə görülən işləri fəal bir qrupa tapşırsaq, o qədər xidməti yüz ilə edə bilməzlər. Biz bugünkü işlərimizi Peyğəmbərin (s) gördüyü işlərlə müqayisə etsək, onun nə etdiyini anlaya bilərik. Hakimiyyət idarəsi, cəmiyyət .quruculuğu və örnək göstərilməsi Peyğəmbərin (s) möcüzələrindəndir

İnsanlar on il gecə-gündüz onunla yaşadılar, evinə getdilər, evlərinə gəldi; məsciddə bir yerdə idilər, birgə yol getdilər, birgə səfərə çıxdılar, birgə yatdılar, birgə aclıq çəkdilər, birgə sevindilər. Peyğəmbərin (s) cəmiyyəti həm də şən cəmiyyət idi; insanlarla zarafat edir, yarış keçirir, özü də yarışda iştirak edirdi. On il Peyğəmbərlə (s) yaşayan insanların qəlbində ona sevgi və inam günbəgün artdı. Əbu Süfyan Peyğəmbərin (s) əmisi Abbasın yardımı ilə gizlicə müsəlmanların düşərgəsində gəzirdi. O, səhər çağı insanların Peyğəmbərin (s) üz və qollarından axan dəstəmaz suyunu götürməyə çalışdıqlarını görəndə Abbasa dedi ki, təəccüblüdür, mən Kəsra və Qeysəri - İran padşahını və Roma imperatorunu görmüşəm, amma onların heç birində sənin qardaşın oğlunun əzəmətini müşahidə etməmişəm. Bəli, əsl ucalıq mənəvi ucalıqdır: İzzət və ucalıq yalnız Allaha, Onun elçisinə və möminlərə məxsusdur!(١) Möminlər də (bu yolla getsələr, uca olarlar. (٢٠٠١

**İslam quruluşunu möhkəmlətmək**

Qədir-Xum hadisəsi İslam tarixinin çox mühüm və təyinedici bir hadisəsidir. Bu hadisəyə iki cəhətdən yanaşmaq olar. Bunların biri Şiəyə məxsusdur, biri isə bütün İslam firqələrinə. Onun ikinci cəhətinə əsasən, bütün dünya müsəlmanları bu böyük hadisəni xatırladan Qədir-Xum bayramının yalnız şiələrə məxsus olmadığını .bilməlidirlər

Qeyd etdiyim kimi, hadisənin birinci cəhəti şiələrə məxsusdur, çünki bu hadisədə Əmirəlmöminin (ə) Peyğəmbər



---

.Münafiqun/٨ [٢٩] -١

s) tərəfindən xəlifə təyin olunmuşdur. Həmin hadisə zamanı bəzi şəxslər) Peyğəmbərdən (s) soruşdular ki, ey Allahın rəsulu, bu elan sənin tərəfindəndir, yoxsa Allahın tərəfindən? Buyurdu ki, Allah və Onun rəsulu tərəfindən.(۱) Şiələr bu hadisəni ona görə uca tuturlar ki, əqidə bəslədikləri Əmirəlmömininin (ə) fasiləsiz xəlifəliyi ən çox bu dəlilə əsaslanır. İslam tarixi boyu çoxlu kitablarda uyğun etiqadı sübut etmək üçün bu hadisəyə əsaslanmışlar. Minlərlə alimin danışdığı və yazdığı bu mövzuya .mənim bir şey əlavə etmək niyyətim yoxdur

Əhəmiyyət baxımından hadisənin birinci cəhətdən geri qalmayan ikinci cəhəti şiə və .sünni arasında müştərəkdir. Mən bu haqda bir qədər danışacağam

Hadisə bundan ibarətdir ki, Allahın Rəsulu hicrətin onuncu ilində Mədinədən və Ərəbistan yarımadasının digər yerlərindən olan müsəlmanlarla birgə həccə yollandı. Əziz Peyğəmbər (s) Allah evini ziyarət etdiyi bu səfərdən İslamın siyasi, hərbi, əxlaqi, etiqadi təlimlərini bəyan etmək üçün lazımınca istifadə etdi. Minada Peyğəmbərin (s) iki dəfə çıxış etdiyi nəql olunmuşdur; biri güman ki, ayın onuna, biri də on üçünə təsadüf edir. Belə nəzərə çarpır ki, bunlar iki çıxışdır, bir çıxış deyil. Allahın Rəsulu (s) bu çıxışlarda müsəlmanlara zəruri olan təxminən bütün əsas məsələləri bəyan etdi. Bunlar əsasən siyasi məsələlərdir. Bu gün İslam dünyasında həcci siyasətdən uzaq sayan, orada yalnız adi mənada ibadət etməli olduqlarını və hər bir siyasi işi həcdən xaric hesab edənlərin İslam tarixindən və əziz Peyğəmbərin (s) həyat yolundan çox .uzaq və xəbərsiz olduqları görünür

Allah elçisinin bu çıxışlarda dediyi sözlər şiə və sünni kitablarında qeyd olunmuşdur. Çıxışların xülasəsi belədir: Əvvəlcə cihad haqda danışır, müşrik və kafirlərlə cihad məsələsini bəyan edir və bu cihadın Allahdan başqa heç bir tanrı yoxdur sözünün hər yerə yayılacağı zamana qədər



---

.Təbrisi. Əl-İhticac, c. ۱, səh: ۸۲ [۳۰] -۱

davam edəcəyini bildirir. Peyğəmbər (s) bu çıxışlarda İslam birliyi məsələsinə toxunub söyləyir ki, müsəlmanlar daxili müharibələrə getməsinlər, birliklərini qorusunlar. Cahiliyyət ənənələri haqda açıqca deyir ki, İslama görə bunların heç bir dəyəri yoxdur: Cahiliyyət zamanı dəyər sayılan hər bir şeyi bu anda ayaqlarım altına atıram. O, cahil dəyərləri tamamilə rədd etdi. Cahiliyyət dövründən müsəlmanların arasında qalmış maliyyə ixtilaflarını - məsələn, biri o birinə sələmlə borc vermişdi və pulunu istəyirdi – rədd etdi və qüvvədən saldı: Cahiliyyət dövründən qalmış hər bir sələmi bu anda ayaqlarım altına atıram(۱). Dedi ki, mən birinci növbədə əmim Abbasın sələmlə verdiyi borcları ləğv edirəm. O, cahiliyyət dövründə çoxlarına belə borc vermiş və hələ hamısını almamışdı. Buyurdu ki, bunları qüvvədən saldım. O, təqvanı yenə də İslamın ən üstün dəyəri kimi təkrarlayıb söylədi ki, təqvadan başqa bir səbəblə kimsə o birindən üstün olmaz. Müsəlmanların başçısına nəsihət verməyin, yəni siyasi məsələlərə müdaxilənin, başçı və öndərlərə fikir bildirməyin vacib əməl olduğunu vurğulayıb söylədi ki, bütün müsəlmanlar öz xeyirxah fikirlərini İslam başçılarına .çatdırmağa borcludurlar

Əziz Peyğəmbər (s) bu çıxışlarda İslam dünyasının əsas siyasi və ictimai məsələlərinə toxundu, Səqəleyn hədisini söylədi. Bu hədisdə deyilir ki, mən sizin aranızda iki dəyərli irs qoyuram: Allahın kitabı olan Quranı və Əhli-beytimi. Sonra iki əlinin işarə barmaqlarını birləşdirib yan-yana tutdu, buyurdu ki, onlar belədirlər, iki işarə barmağı kimi bir-birindən əsla fərqlənmirlər. Sonra bir əlinin işarə barmağı ilə orta barmağını qaldırıb dedi ki, mən Əhli-beytimlə Quranı belə hesab etmirəm. Onlar iki işarə barmağı (kimidirlər və biri o birindən üstün deyil.(۲



---

.Əs-Sirə ən-nəbəviyyə, c. ۲, səh: ۴۱۲ [۳۱] -۱

Əl-Kafi", c. ۲, səh. ۴۱۵[۳۲] -۲

Həcc əməlləri bitəndən sonra dərhal Mədinəyə sarı yollandılar. Peyğəmbər (s) yolda Mədinə karvanlarının Yəmən karvanlarından ayrıldığı Qədir-Xum adlı bir yerdə dayandı. Şahidlərin söylədiyinə görə, hava o qədər isti idi ki, əti yerə atsaydılar, kabab olardı. Belə bir şəraitdə Peyğəmbər (s) hündür bir yerdə dayandı və camaat tədricən oraya toplaşdı. Hamı toplaşanda Əmirəlmömininin (ə) əlini hamının görəcəyi şəkildə yuxarıya qaldırıb vilayət məsələsini elan etdi: Mən kimin mövlası və rəhbəriyəmsə, Əli də onun mövlası və rəhbəridir!(١) Çoxlu hədislərdə söylənmişdir ki, hamının görməsi üçün əllərini qaldıranda Peyğəmbərin (s) və Əlinin (ə) qoltuğunun altı göründü. .Hadisənin xülasəsi bundan ibarətdir

Mənim nəzərdə tutduğum beynəlxalq cəhət və İslam firqələri üçün ortaq məsələ şiələrə məxsus deyil. Bu elan heç şübhəsiz, baş vermiş və bu cümlə Peyğəmbərin (s) ağzından çıxmışdır. Əgər bu elanda Allah rəsulunun (ə) məqsədinin Əlinin (ə) fasiləsiz hakimiyyətindən ibarət olmadığını fərz etsək belə, ən azı müsəlmanların Əli (ə) və Peyğəmbər (s) ailəsi ilə sıx əlaqəsini və onlara qarşı sevgisini təmin etmək, möhkəmlətmək məqsədi daşımışdır. Peyğəmbərin (s) həm Minada, həm Qədir-Xumda etdiyi çıxışlarında, həm də dəfələrlə söylədiyi Səqəleyn hədisində Əhli-beyti Quranın kənarında qeyd etməsinin və Əli (ə) haqda xüsusi təkidinin bir səbəbi də xalqa və bütün gələcək nəsillərə İslamın istədiyi və qəbul etdiyi ideal nümunələri göstərmək idi. O, ideal insan nümunəsini real, aydın və şübhəedilməz formada bütün insanlara göstərib islami tərbiyənin bu səmtə hərəkət etməli olduğunu, kamil və ideal müsəlman nümunəsinin belə olduğunu bildirmək istəyirdi. Bu insanların paklığı, elmi, təqvası, düzgünlüyü, Allah qarşısında bəndəliyi, İslam məsələlərinə əhatəliyi, İslam amallarını ,həyata keçirmək naminə cəsarət və fədakarlıqları hamıya bəlli və aydındır. O



---

.Yenə orada, c. ۱, səh: ۴۲۰ [۳۳] -۱

Əmirəlmömininini (ə) nümunə bir şəxs kimi tanıtdırır ki, istər ozamankı, istərsə də sonrakı nəsillər ona müraciət etsinlər. Peyğəmbərdən (s) dərhal sonrakı canişinliyi həyata keçməsə və ۲۵ ildən sonra xəlifə olsa da, hər halda, Peyğəmbərin (s) canişini oldu, imamlıq məqamı təsbit oldu və bütün müsəlmanlar onu cəmiyyətin rəhbəri kimi qəbul etdilər. Bu xüsusiyyət, sevgi, əlaqə, eləcə də hamının Peyğəmbərin (s) canişini kimi qəbul etdiyi bir şəxsiyyət bütün müsəlmanlar üçün İslam insanına dair örnək və nümunə kimi həmişəlik qalmalı, onunla müsəlmanlar arasındakı əlaqə düşüncə, .etiqad, emosiya və əməl müstəvisində daim davam etməlidir

Bu baxışla Əmirəlmöminin (ə) yalnız şiələrin deyil, bütün müsəlmanlarındır. Həm də yalnız Əmirəlmöminin (ə) yox, onun övladları olan bütün imamlar Peyğəmbərin (s) Əhli-beyti olduqlarından həmişə müsəlmanlara görə ideal İslam insanına dair nümunə kimi qalmalıdırlar. Bu bir məsələ. İkincisi, Əhli-beyti Quranın kənarında göstərməklə, müsəlmanlarla Əhli-beyt arasında əlaqənin zəruriliyini elan etməklə əziz Peyğəmbər (s) əslində Quranın və Quran təlimlərinin təhrif olunduğu zaman vəzifəni də bəyan etmiş olur. Hakim rejimlər öz xeyirlərindən ötrü İslam təlimlərini təhrif, Quranı səhv izah edəndə, müsəlmanları azdıranda, xalqı İslam dərkindən məhrum edəndə xalqa həqiqəti başa salmalı, düzgün sözü tanıtdırmalı, insanları azğınlıqdan xilas etməli və .insanların da dinləməli olduğu mərkəz və mənbə Əhli-beytdir

Bu gün bu məsələ İslam dünyası üçün zəruri məsələdir. Əmirəlmömininin (ə) və onun övladlarının fasiləsiz imamlığına etiqadı olan və olmayan bütün müsəlmanların bu gün Peyğəmbərin (s) Əhli-beyti vasitəsi ilə çatdırılan İslam təlimlərindən istifadə etməyə ehtiyacları var. Şiələr bu hədisin qəti mənasını fasiləsiz canişinlik bilir və ona etiqad bəsləyirlər. Buna etiqadı olmayan sünni qardaşlar da Peyğəmbər (s) ailəsi və Əmirəlmömininlə (ə) düşüncə rabitəsini, əqli, etiqadi və emosional əlaqəni (kəsməməlidirlər. Qədir-Xum məsələsi Əli ibn Əbu Talib (ə) və Peyğəmbər (s

Əhli-beyti ilə müsəlmanlar arasında əlaqə yaratmaq cəhətindən bütün müsəlmanlara (məxsusdur. (١٩٨٧

Qədir-Xum məsələsi sırf tarixi bir məsələ deyil, İslamın kompleksliyinin göstəricisidir. Əziz Peyğəmbər (s) on il ərzində öz mübarizəsi və vəfalı səhabələrinin köməyi ilə təəssüb və xurafat dolu ibtidai bir cəmiyyətin yerində mütərəqqi İslam cəmiyyəti qurdu. O həmin on ildən sonrakı dövr haqda düşünməsəydi, ümmətə yol göstərməsəydi, iş yarımçıq qalardı. Cahil təəssübkeşliklər o qədər güclü idi ki, onları yox etmək üçün bəlkə çox uzun illərə ehtiyac vardı. Zahiri vəziyyət və xalqın imanı yaxşı idi. Təbii ki, hamı bir səviyyədə deyildi. Əziz Peyğəmbərin (s) vəfat etdiyi zaman bəzi şəxslərin müsəlman olmasından bir il, altı ay, yaxud iki il ötürdü. Həm də İslamın gözəllikləri ilə yanaşı Peyğəmbərin (s) hərbi qüdrəti də bunları İslama sövq etmişdi. Hamı Məkkə dövrünün köklü müsəlmanlarından deyildi. Bu cəmiyyətin dərin qatlarından cahiliyyət ənənələrini silmək və İslamın hidayət xəttini Peyğəmbərdən (s) sonrakı dövrdən ötrü sığortalamaq məqsədilə bir iş görmək lazım idi. Bu iş görülməsəydi, missiya yarımçıq qalardı. Buna görə mübarək Maidə surəsində buyurur: Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi tamamladım(١). Açıq şəkildə deyilir ki, İslam, hidayət və bəşəriyyətə düzgün bələdçilik neməti yalnız Peyğəmbərdən (s) sonrakı yol xəritəsinin bəlli olduğu zaman tamamlanar və təkmil olar. Bu təbii məsələdir. Bu işi Peyğəmbər (s) Qədir-Xumda gördü, iman, əxlaq, müxtəlif təbəqələrlə rəftar, inqilabi və hərbi şəxsiyyət baxımından nümunəvi fərd olan .Əlini (ə) buna təyin etdi və xalqa ona tabe olmağı tapşırdı

Bu, Peyğəmbərin (s) fikri deyildi, ilahi hidayət, Allahın əmri və təyinatı idi; əziz Peyğəmbərin (s) digər söz və tövsiyələri kimi ilahi ilham idi. Allah bu aydın əmri əziz .Peyğəmbərə (s) buyurmuşdu. Peyğəmbər (s) də ona əməl etdi



---

١- [٣۴] Maidə/٣.

Qədir-Xum budur: İslamın kompleksliyini, gələcəyə baxışını, İslam ümmətinin hidayət və rəhbərlik şərtlərini göstərən amil. Bu şərtlər hansılardır? Əmirəlmömininin (ə) şəxsiyyətinin göstərdiyi cəhətlər - yəni təqva, dindarlıq, dinə mütləq itaət, Allahdan və haqq yoldan başqa heç bir şeyi nəzərə almamaq, Allah yolunda qorxmadan hərəkət etmək, elmə, ağla, dərrakəyə, iradə və əzmkarlığa yiyələnmək. Bu, real və eyni zamanda simvolik bir əməldir. Bu xüsusiyyətlərə malik olan Əli (ə) xəlifə təyin olundu. Eyni zamanda bu, İslam yaşadıqca müsəlman ümmətin rəhbərlik simvoludur. Yəni Əmirəlmömininin (ə) ilahi seçimində həyata keçən amil tarix boyu İslam rəhbərliyinin (simvoludur. Qədir-Xum belə bir məsələdir. (۲۰۰۷

## İkinci fəsil: İmamət

### İşarə

İmamət – cəmiyyətin insani ehtiraslardan, nöqsanlardan, qürur və təkəbbürdən irəli gələn müxtəlif üsul-idarələrinə qarşı çıxan ideal idarəetmə üsuludur. İslam bəşəriyyətə imamət üsulunu təqdim edir. Bu həm qəlbi ilahi hidayət işığı ilə dolan, həm din təlimlərini bilən, anlayan, düzgün yolu təyin edən, həm güclü idarəçilik qabiliyyətinə sahib olan, həm də öz canına, istəyinə və həyatına çox da əhəmiyyət verməyən, insanların canını, həyatını və xoşbəxtliyini isə hər şey sayan bir insanın rəhbərliyi deməkdir. Əmirəlmöminin (ə) özünün beş ildən az sürən hakimiyyətində bunu əməli surətdə göstərdi. Görürsünüz ki, bəşəriyyət bu qısa hakimiyyət dövrünü heç zaman unutmamış, o, nümunə və örnək kimi əsrlər boyu yaşamışdır. Bu, Qədir-Xum (hadisəsinin dərs və mənasının nəticəsidir. (۲۰۰۲

Rəhbərlik mənasını ifadə edən imamət sözü İslam ədəbiyyatında daha çox xüsusi mənada, düşüncə və siyasi baxımdan ictimai rəhbərlik kimi başa düşülür. Quranda işlənmiş imam və imamət sözləri bu mənada ümmətin rəhbərliyi deməkdir – düşüncə rəhbərliyi, siyasi rəhbərlik, yaxud hər ikisi. Peyğəmbərin (s) vəfatından sonra İslam inanclılarının bir neçə firqəyə bölünməsi ilə nəticələnən etiqadi və siyasi parçalanmalarda əsas amil ümmətin siyasi rəhbərliyi olduğundan, imamət və imam sözləri xüsusi əhəmiyyət kəsb etdi və daha çox siyasi rəhbərlik mənasında işlənib digər mənaları kölgədə qoydu. Belə ki, hicrətin ikinci əsrində biri o birindən sonra kəlam məktəbləri yarananda və müxtəlif İslam təmayülləri müəyyən ideologiya və məktəblər formasına düşəndə siyasi rəhbərlik mənasında olan imamət bütün bu məktəblərin mühüm məsələlərindən birini təşkil etdi. Bu məsələdə adətən imamın – yəni cəmiyyətin hakiminin və başçısının şərait və xüsusiyyətlərindən söhbət açılırdı və .bu haqda hər bir qrupun öz sözü və etiqadı vardı

Şiələr tərəfindən İslamın ən ortodoks düşüncə cərəyanı hesab edilən Şiə məktəbində imamət bu mənada başa düşülürdü. Bu məktəbin imam haqda görüşü belə xülasə olunurdu: İslam cəmiyyətinin imamı və siyasi başçısı Allah tərəfindən təyin və Peyğəmbər (s) tərəfindən təqdim olunmalı, düşüncə rəhbəri, Quran təfsirçisi, dinin bütün sirr və incəliklərindən xəbərdar, pak, məsum, fiziki cəhətdən qüsursuz, hər bir əxlaqi nöqsandan uzaq, pak və iffətli ailədə doğulmuş olmalıdır və sair. Beləliklə, birinci və ikinci əsrin müsəlmanlarına görə siyasi rəhbərlik kimi başa düşülən imamət şiələrə xas baxışda siyasi rəhbərlikdən əlavə, həm də düşüncə və əxlaq rəhbərliyinə şamil .olurdu

Şiələr imam bildikləri şəxsdən yalnız ictimai deyil, həm də düşüncə idarəçiliyini, dini təlimdə, mənəvi və əxlaqi saflıqda bələdçiliyi gözləyirdilər. Onlar bu vəzifələrin öhdəsindən gələ bilməyən şəxsi həqiqi imam saymır və başqalarına görə yetərli meyarlar sayılan yaxşı siyasi idarəçilik, hərbi güc və qəhrəmanlıq xüsusiyyətləri ilə .qane olmurdular

Şiənin imamətə dair baxışına əsasən, bir cəmiyyətin imamı insanların fərdi rəftarını və ictimai hərəkətini tənzim və idarə edən, eyni zamanda əxlaq müəllimi, onların həyat və fəaliyyətinin hakimi olan üstün qüvvədir. Bu baxışa görə, əsasını qoyduğu cəmiyyətin düşüncə və siyasi rəhbərliyini icra etdiyi üçün Peyğəmbər (s) də imamdır. Peyğəmbərdən (s) sonra onun vəzifələrini, o cümlədən siyasi rəhbərlik işini yerinə yetirmək üçün ümmətin yenə də imama ehtiyacı var. Şiələr inanırlar ki, bu canişinlik Peyğəmbərin sözlərinə əsasən, Əli ibn Əbu Talibə (ə) və sonra həmin ailədən olan .məsum imamlara məxsusdur

Dövrümüzün bəzi görkəmli mütəfəkkirləri İslam imaməti və hökuməti üçün üç cəhət qeyd etmişlər: siyasi rəhbərlik, dini təlim və mənəvi paklıq. İslam xilafətində bu üç məsələ bir-birindən ayrılmamış və bir proqram kimi insanlara təqdim olunmuşdur. Deməli, ümmət rəhbərliyi də bu üç sahədə

rəhbərlik deməkdir. İmamətin bu məna genişliyinə görə şiələr imamın Allah tərəfindən .təyin edilməli olduğuna inanırlar

İmaməti xilafət və hökumət qarşısında sırf mənəvi, psixoloji və elmi mənsəb hesab edənlərin dayaz baxışının əksinə olaraq, Şiə mədəniyyətində imam ümmətin rəhbəridir; həm dünyəvi işlərdə, cəmiyyətin siyasi və ictimai idarəsində və nizama salınmasında (hökumət başçısı), həm də mənəvi və psixoloji təlimdə, hidayətdə, .(düşüncə problemlərinin həllində və İslam ideologiyasının izahında (ideoloq

Bu aydın məsələ imamətə etiqad bəsləyənlərin çoxunun düşüncəsinə o qədər yaddır ki, Quran və hədisdə buna dair yüzlərlə dəlildən bir neçə nümunəni qeyd etmək pis :olmaz

Kafi kitabının Höccət bölməsində həzrət Əli ibn Musa Rzadan (ə) imamətə və imama dair böyük bir hədis nəql olunmuşdur. Bu hədis mənalı və maraqlı xüsusiyyətləri ehtiva edir, imaməti dinin sükanı, müsəlmanın nizam-intizamı, dünyanın abadlığı, möminlərin başucalığı, peyğəmbərlərin mənsəbi, canişinlərin mirası, Allah və Peyğəmbərin (s) canişinliyi, imamı isə ümumi sərvəti artıran, ilahi qanun və cəzaları icra edən, sərhədləri qoruyan, xalq arasında Allahın əmanətdarı, yüksək yerdə işıqlı məşəl, Allahın yolunu bərpa və müdafiə edən, münafiqləri qəzəbləndirən, (İslamla vuruşan) kafirlərin kökünü kəsən, möminlərə şərəf bəxş edən, idarəçilikdə mahir və peşəkar, siyasət işinə vaqif, Allahın fərmanına hazırlıqlı, Allahın bəndələri üçün xeyirxah qüvvə (və Allahın dininin gözətçisi adlandırır.(١

Başqa bir hədisdə İmam Sadiq (ə) açıq şəkildə söyləyir ki, Əli (ə) və digər imamlar (Peyğəmbərin (s) bütün üstünlüklərinə və öhdəliklərinə sahibdirlər.(٢



---

.Əl-Kafi, c. ۱, səh: ۲۰۰ [۳۵] -۱

.Yenə orada, səh: ۱۹۶ [۳۶] -۲

İmam Sadiq (ə) başqa bir hədisdə canişinlərə itaətin vacibliyini vurğulayaraq qeyd edir (ki, canişinlər Quranın əmr sahibləri(۱) adlandırdığı şəxslərdir.(۲)

Müxtəlif kitabların müxtəlif bölmələrində qeyd olunmuş yüzlərlə rəvayət şiəlikdə mövcud olan imam və imamət anlayışını açıq-aşkar şəkildə müsəlman ümmətinin idarəsi və başçılığı kimi göstərmiş və Əhli-beyt (ə) imamlarını hakimiyyətin həqiqi sahibləri adlandırmışdır. İnsaflı tədqiqatçı üçün heç bir şübhə qalmır ki, Əhli-beyt (ə) imamlarının imamət iddiası elmi və mənəvi müstəvidən geniş, həm də dəqiqliklə hakimiyyət iddiasıdır və onların hərtərəfli dəvəti əslində hakimiyyətə gəlmək üçün (siyasi-hərbi mübarizəyə çağırışdır. (Sadiq rəhbər, səh: ۶۹-۷۴

İmam Səccaddan (ə) İmam Əsgəriyə (ə) qədərki səkkiz imamın yalnız din hökmləri, din təlimləri ilə məşğul olduqlarını və dövrlərinə uyğun siyasi mübarizə aparmadıqlarını düşünən adam Kafi kitabının onların həyatına dair rəvayətlərini yəqin ki, araşdırmamışdır. Onların həyatlarında mübarizə amili aydın görünür. Ümumiyyətlə İslamda imamətin mənası və Şiənin imamətə dair fəlsəfəsi bundan qeyrisi ilə əsla uyğun gəlmir. Bizdə imamların mübarizəsinə dair aydın dəlil olmasaydı belə, ən azı bundan xəbərimizin olmadığını, uyğun məlumatların bizə çatmadığını, onların isə mübarizə apardıqlarını düşünməli idik. Biz məhz Şiə ədəbiyyatında yox, ümumi İslam ədəbiyyatında imamətin həqiqi mənasını bildikdən, qəbul etdikdən sonra imamlarımızın yüz əlli il, yaxud daha artıq müddətdə əllərini əllərinin üzərinə qoyub evlərində oturduqlarını, yalnız Quran hökmlərini və İslam təlimlərini bəyan etdiklərini və siyasi mübarizə aparmadıqlarını söyləyə bilmərik. Belə bir fikir əsla düzgün deyil. Əlbəttə, mübarizənin hər dövrdə müəyyən formada olduğunu yaddan çıxarmamalıyıq. Mübarizə bəzən



---

۱- [۳۷] Maidə/۵۹.

۲- [۳۸] Əl-Kafi, c. ۱, səh: ۱۸۹.

mədəni, elmi, siyasi işlərlə, təşkilatlanma, partiya işləri ilə, bəzən də qanlı əməliyyatlarla, açıq döyüşlə və hərbi fəaliyyətlərlə olur. Mübarizə hər zaman bir (formada həyata keçir. (۱۹۸۷

Kimsə etiraz edə bilər ki, imamlar ilahi elmlə hakimiyyətə gəlməyəcəklərini bilə-bilə onun uğrunda necə mübarizə apara bilərdilər?! Bəli, imamların həyatı göstərdi ki, onlar hakimiyyətə gəlib istədikləri və üzərlərinə düşən şəkildə İslam cəmiyyəti və İslam quruluşu qurmaq imkanı əldə etmədilər. Bəs onlar bunu bildikləri və ilahi ilhamla bundan xəbərdar olduqları halda necə bu işi görmək istəyirdilər?! Cavabda deməliyik ki, məqsədə çatmayacağını bilmək vəzifəni yerinə yetirməyə mane olmur. Siz Peyğəmbərin həyatına baxın. Əziz Peyğəmbər (s) Ühud döyüşündə məğlub olacağını, dağ keçidini tapşırdığı döyüşçülərin orada dayanmayacağını və qənimət tamahından oradan enəcəklərini bilirdi. Peyğəmbər (s) Bəni-Səqif qəbiləsini hidayət etmək və məkkəlilərin təhlükəsindən uzaqlaşmaq üçün Taifə gedəndə onların onu daş parçaları ilə qarşılayacaqlarını bilirdi, ayağını qanadacaq qədər daş vuracaqlarından və qayıtmağa məcbur olacağından xəbərdar idi. İmamlar bütün bunları bilirdilər. Əmirəlmöminin (ə) bilirdi ki, ramazan ayının ۲۱-də şəhadətə qovuşacaq, amma eyni zamanda ramazan ayından bir qədər qabaq Müaviyəyə qarşı döyüşü davam etdirmək üçün Kufənin kənarında böyük bir düşərgə saldı. Əmirəlmömininin (ə) bilməsi onun adi gedişata uyğun çalışmamasına bais olsaydı, düşərgə salmaz, qoşun toplamazdı. İnsanları Kufədən kənarda bir araya gətirdi və orada saxladı. Nə üçün? Nə faydası vardı? İmamların hakimiyyətə gəlməyəcəklərini bilmələri onların fəaliyyətinə mane olmamalı, çalışmalı, mübarizə aparmalı, nə baş verəcəyini bilməyən adam kimi bütün (işləri görməlidirlər. (۱۹۸۵

## İmamətin dörd dövrü

İmamət Peyğəmbərin (s) vəfatından - yəni hicri tarixi ilə ۱۱-ci ilin səfər ayından İmam - Həsən Əsgərinin (ə) vəfatına

yəni ۲۶۰-cı ilin rəbiüləvvəl ayına qədər davam etdi. Bu müddətdə imamət təxminən dörd dövrü yaşadı və imamların hakim siyasi qüvvələr qarşısında mövqeyi baxımından .hər dövr bəzi xüsusiyyətlərlə yadda qaldı

Birinci dövr sükut, yaxud imamın hakimiyyətlə əməkdaşlıq dövrüdür. İslamdan zərbə görmüş güclü xarici düşmənlərin və etiqadı möhkəmlənməmiş yeni müsəlmanların olduğuna görə, körpə İslam cəmiyyətində ixtilafa və ikitirəliyə əsla taqət yox idi. Bu cəmiyyətdə ən kiçik parçalanma onun bünövrəsini təhdid edə bilərdi. Digər tərəfdən, haqdan yayınma İslam məktəbinə, İslam cəmiyyətinə ən xeyirxah və məsuliyyətli insan olan Əmirəlmöminin (ə) kimi bir şəxsin dözməyəcəyi həddə deyildi. Bəlkə də məhz buna görə Peyğəmbər (s) özünün bu nümunəvi şagirdinə qabaqcadan belə .hadisələr zamanı səbirli olmağı tapşırmışdı

Bu dövr əziz Peyğəmbərin (s) hicrətin ۱۱-ci ilindəki vəfatı ilə Əmirəlmömininin (ə) ۳۵-ci ildəki xilafəti arasındakı ۲۵ ili əhatə edir. O həzrət misirlilərə ünvanladığı məktubda bu fasilə dövrünün əvvəlində öz vəziyyətini izah edərək yazır ki, əvvəlcə bütün cinahlardan kənara çəkildim, sonra isə bəzi qrupların İslamdan dönərək onu məhv etmək çağırışı etdiklərini gördüm. Qorxdum ki, İslama və müsəlmanlara kömək etməsəm, bunun ziyanları xilafəti itirməkdən də böyük olsun. Buna görə ayağa (qalxdım və fəaliyyətə başladım.(۱

Əlinin bu ۲۵ illik həyatı İslama və müsəlmanlara qarşı xeyirxahlıqdan irəli gələn fəaliyyət, yardım və dəstəkdən ibarətdir. O həzrətin dövrün xəlifələrinə verdiyi, Nəhcül-bəlağədə və digər hədis və tarix kitablarında qeyd olunan siyasi, hərbi, ictimai .və digər tövsiyələri bu amilə inkaredilməz faktlar sayılır

İkinci dövr imam hakimiyyəti dövrüdür. Bu dövr Əmirəlmömininin (ə) dörd il doqquz aylıq və Həsən ibn Əlinin (ə) bir neçə aylıq xəlifəlik dövründən ibarətdir. Bu dövr



---

.Nəhcül-bəlağə, məktub: ۶۲ [۳۹] -۱

inqilabçı bir hökumət üçün qaçılmaz olan bütün qüsurlara, çoxlu məşəqqət və problemlərə rəğmən, İslam hakimiyyətinin ən parlaq illəri sayılır. Bu dövrdə insani üsulların, mütləq ədalətin və cəmiyyətin həyatında İslamın müxtəlif cəhətlərinə riayət olunmasının, həmçinin qətiyyətin, çəkinməzliyin və cəsarətin tarixin bütün .dönəmlərindən artıq olduğu danılmaz məsələdir

İmamların həyatının bu dövrü ondan sonrakı ik əsrdə Şiə imamlarının həmişə dəvət etdiyi və uğrunda çalışdığı hökumət və ictimai quruluş üçün örnək idi. Şiələr bu dövrü əziz xatirə kimi yad etmiş, onun həsrətini çəkmiş, sonrakı rejimləri onunla müqayisə edərək qınamışlar. Bu dövr eyni zamanda yetkinləşməmiş, yaxud haqdan uzaqlaşdırılmış cəmiyyət və xalq arasında tam islami və inqilabi bir hökumətin vəziyyətini göstərən və o zamandan etibarən imamları uzunmüddətli metodlara, çevrədaxili ağır və tələbkar kadr hazırlığına vadar edən ibrətamiz bir dərs və təcrübə .idi

Üçüncü dövr İmam Həsənin (ə) ۴۱-ci ildəki sülhü ilə İmam Hüseynin (ə) ۶۱-ci ildəki şəhadəti arasındakı dövrdür. Sülh bağlanandan sonra Şiənin yarımgizli fəaliyyəti başlandı və münasib zamanda hakimiyyəti Peyğəmbər (s) ailəsinə qaytarmağı məqsəd seçən proqramlara start verildi. Adi proqnozlara görə bu çox da qeyri-mümkün görünmürdü, Müaviyənin şər dolu həyatı bitəndən sonra ona ümid bəslənirdi. Buna əsasən, üçüncü dövrü İslam hökuməti və İslam rejimi qurmaq üçün .qısamüddətli quruculuq dövrü adlandırmaq olar

Nəhayət dördüncü dövr təqiblər dövrü və həmin məqsəd üçün uzunmüddətli proqramlar zamanıdır. İki əsrə yaxın sürən bu dövrdə müxtəlif mərhələlərdə qələbə və məğlubiyyətlər olmuş, ideoloji sahədə qəti zəfər çalınmış, dövrə uyğun yüzlərlə taktika işlədilmiş, ideal İslam adamının ixlasına, fədakarlığına və üstünlük (göstəricilərinə minlərlə nümunə təqdim olunmuşdur. (Sadiq rəhbər, səh: ۱۶-۱۹

İmamların həyatında yetərincə diqqət yetirilməyən ən mühüm məsələ gərgin siyasi mübarizə amilidir. İslam xilafətinin açıq şəkildə şahlıq əlamətləri ilə qarışdığı və despotizmə çevrildiyi birinci əsrin ikinci yarısından Əhli-beyt imamları öz siyasi mübarizələrini şəraitə uyğun üsullarla gücləndirdilər. Bu mübarizənin ən böyük məqsədi İslam quruluşu və imamətə əsaslanan hakimiyyət qurmaq idi. Şübhəsiz ki, dinin vəhy ailəsinə xas görüşlərlə təfsiri, eləcə də İslam təlimlərindən və din hökmlərindən təhrifləri aradan qaldırmaq da Əhli-beytin mübarizəsi üçün mühüm məqsəd sayılırdı. Lakin qəti faktlara əsasən, Əhli-beytin mübarizəsi bu işlərlə məhdud olmurdu və onda ən böyük məqsəd Əli (ə) hökuməti qurmaqdan və ədalətli İslam quruluşu yaratmaqdan başqa bir şey deyildi. İmamların və onların tərəfdarlarının məşəqqət və fədakarlıq dolu həyatlarının ən böyük səbəbi bu məqsəd idi. İmamlar həzrət Səccadın (ə) dövründən və Aşura hadisəsindən sonra bu məqsəd üçün .uzunmüddətli işlərə başladılar

Aşura hadisəsi ilə İmam Rzanın (ə) vəliəhdliyi arasındakı ۱۴۰ illik dövrün hamısında Əhli-beyt imamlarına bağlı olan Şiə cərəyanı həmişə xilafətin ən böyük və ən təhlükəli düşməni sayılmışdır. Bu müddətdə dəfələrlə münasib şəraitlər yarandı, Əli (ə) hərəkatı adlandırmalı olduğumuz Şiə mübarizəsi böyük qələbələrə yaxınlaşdı, amma hər dəfə son qələbə qarşısında maneələr yarandı, çox zaman bu hərəkatın əsas mərkəzi və mənbəyi olan imama düşmən tərəfindən ən böyük zərbə vuruldu; onlar həbs olundular, yaxud şəhadətə yetirildilər. Növbə sonrakı imama çatanda da təzyiq və repressiya elə bir həddə idi ki, uyğun şərait yaratmaq üçün yenidən uzun zamana .ehtiyac yaranırdı

İmamlar bu hadisələrin güclü fırtınası arasında ağıl və şücaətlə şiəliyi kiçik, lakin dərin və möhkəm cərəyan kimi ağır və təhlükəli keçidlərdən keçirdilər. Əməvi və Abbasi xəlifələri heç zaman imamı məhv etməklə imamət cərəyanını bitirə bilmədilər. Bu kəsərli xəncər həmişə xilafət aparatının

(kənarında sancılmış qaldı və daimi təhdid kimi onların rahatlığını pozdu. (۱۹۸۴

səh:۵۲

## İşarə

Əmirəlmömininin (ə) həyatı müxtəlif şəraitlərdə və müxtəlif cəhətlərdən bütün nəsillər üçün əbədi və unudulmaz bir dərsdir; istər fərdi işlərdə, istər ibadətdə, münacatda, istər zahidliyində, istər daim Allahı yada salmaqda, istər nəfslə, şeytanla və müxtəlif maddi istəklərlə mübarizədə. Əmirəlmömininin (ə) bu cümləläri bəşər aləmində hələ də rezonans doğurmaqdadır: Ey dünya! Məndən qeyrisini aldat!(١) Ey dünya bəzəkləri, ey cazibədar gözəlliklər, ən güclü insanları da tələyə salan istəklər, gedin Əlidən (ə) qeyrisini aldadın. Əli (ə) bundan daha böyük, daha uca və daha güclüdür. Ayıq insanların hər biri Əmirəlmömininin (ə) həyatının bütün anlarından – Allahla .əlaqəsindən və mənəviyyatından unudulmaz dərslər öyrənirlər

Əlinin (ə) cihadı haqq və ədaləti bərqərar etmək, ucaltmaq üçün idi. Əziz Peyğəmbər (s) elçilik missiyasını üzərinə götürdüyü ilk saatlardan öz kənarında hələ yeniyetmə çağını yaşayan mübariz, mücahid, mömin və fədakar bir insan gördü. O, Əli (ə) idi. Peyğəmbərin (s) səmərəli ömrünün son saatlarına qədər İslam quruluşu yaratmaq və onu qorumaq uğrunda mübarizə əzmi bir an da onu rahat buraxmadı. Nə qədər mübarizə apardı, təhlükələrə dözdü, haqq və ədaləti bərqərar etmək üçün yorulmadan çalışdı. Heç kəs meydanda qalmayanda o qalır, heç kəs səhnəyə qədəm qoymayanda o qoyur, çətinliklər nəhəng dağ kimi Allah yolunun mübariz və mücahidlərinə ağırlıq edəndə onun möhkəm qaməti digərlərini ürəkləndirirdi. Onun üçün həyatın mənası Allahın bəxş etdiyi fiziki, psixoloji imkanlardan, iradədən və malik olduğu hər bir şeydən haqq sözünün ucalması üçün istifadə etmək, haqqı yaşatmaq .idi. Əlinin (ə) iradəsi, qolu və cihadı ilə haqq yaşadı



---

.Yenə orada, hikmət: ۷۷ [۴۰] -١

Ağıllı insanlar üçün dəyərli olan haqq, ədalət, insaniyyət və bu kimi məfhumların bu gün dünyada yaşaması, günbəgün güclənməsi və möhkəmlənməsi bu mübarizə və fədakarlıqlara görədir. Əgər bəşər tarixində çox nadir olan Əli ibn Əbu Talib (ə) kimilər olmasaydılar, bu gün insani dəyərlər mövcud olmazdı, bu sözlər bəşəriyyətə gözəl görünməzdi, bəşərin uca amal, məqsəd, mədəniyyət və sivilizasiyası olmazdı, bəşəriyyət vəhşi və yırtıcı bir heyvana çevrilərdi. Uca amalların qorunmasına görə bəşəriyyət Əmirəlmömininə (ə) və onun kimi uca insanlara borcludur. O mübarizələrin .nəticəsi budur

Əmirəlmömininin (ə) həyatının başqa bir cəhəti hakimiyyət sahəsindədir. Bu böyük və müdrik insan nəhayət hakimiyyət kürsüsündə oturduğu qısa dövrdə elə işlər gördü ki, tarixçi, yazıçı və sənətkarlar illərlə yazsalar, sənət əsərlərinə köçürsələr də, az demiş və az təsvir etmiş olarlar. Əmirəlmömininin (ə) hakimiyyəti dövründəki həyat tərzi də .başqa bir aləmdir. Əli (ə) ümumiyyətlə hakimiyyətin mənasını dəyişdirdi

O, ilahi hakimiyyətin, Quran ayələrinin, Kafirlərə qarşı sərt, bir-birinə isə mərhəmətli(۱) ayəsinin və mütləq ədalətin təcəssümü idi. O, yoxsulları özünə yaxınlaşdırır, zəiflərə qayğı göstərirdi.(۲) Pulla, zorla və digər amillərlə haqsız olaraq özünü böyük göstərənlər Əlinin (ə) nəzərində yerlə-yeksan idilər. Ona görə dəyərli xüsusiyyətlər iman, təqva, ixlas və insaniyyət idi. Əmirəlmöminin (ə) bu dəyərli əsaslarla beş ildən az hakimiyyətdə oldu. Əsrlərdir Əli (ə) haqda yazırlar, amma yenə az yazmış, düzgün (təsvir edə bilməmiş, ən yaxşıları öz acizliklərini və qüsurlarını etiraf etmişlər. (۱۹۹۱

Onun ən böyük xüsusiyyəti təqvadır. Nəhcül-bəlağə təqva kitabıdır. Onun yolu, həyatı təqva yoludur. (۱۹۹۹) İnsanların eləsi də vardır ki, Allahın razılığını qazanmaq yolunda öz



---

.Fəth/۲۹ [۴۱] -۱

.İbn Əbilhədid. Şərh Nəhcül-bəlağə, c. ۱۸, səh: ۲۲۶ [۴۲] -۲

canını fəda edər(۱) ayəsi Əmirəlmömininin (ə) haqda nazil olmuşdur, təvili Əli ibn Əbu Talibdir. Ayə deyir ki, insanlar arasında əvəzsiz və ən əziz sərmayə olan canlarını Allahın razılığından ötrü bütövlüklə qurban verənlər var. Məqsədləri yalnız Allahın razılığıdır. Onlar can və həyatlarını heç bir dünyəvi məqsəd və şəxsi maraq üçün yox, yalnız və yalnız Allahın razılığını qazanmaq üçün qurban verirlər. Allah da belə bir fədakarlığın qarşısında şübhəsiz ki, layiqli cavabı əsirgəmir: Allah öz bəndələrinə qarşı çox mehribandır. Bunun kamil nümunəsi Əmirəlmömininin Əli ibn Əbu Talibdir (ə). Mən .bu cəhət haqda danışacağam

Siz Əmirəlmömininin (ə) tarixinə baxın. Uşaqlıqdan - doqquz, yaxud on üç yaşında əziz Peyğəmbərə (s) iman gətirdiyi, ayıq şəkildə həqiqəti tanıdığı, ona etiqad bəslədiyi andan ramazan ayının ۱۹-da ibadət mehrabında canını Allah yolunda fəda etdiyi, razılıqla, sevinc və həvəslə Allahın görüşünə getdiyi ana qədər sürən təxminən ۵۰-۵۳ ildə onun həyatında daim davam edən bir xətt var. Bu xətt fədakarlıq xəttidir. Əmirəlmömininin (ə) ömrünün bu ۵۳ ilində əvvəldən sona qədər fədakarlıq əlamətlərini görürsünüz. Bu bizim üçün həqiqətən dərsdir. Əlidən (ə) danışan, Əlini (ə) sevən və dünyada Əli ibn Əbu Talibi (ə) sevməklə tanınan bizlər ondan dərs götürməliyik. Yalnız Əlini (ə) sevmək, yalnız Əliyə (ə) dəyər tanımaq kifayət etmir. Qəlblərində Əli ibn Əbu Talibin (ə) dəyər və fəzilətlərini etiraf edən, Əlini (ə) məsum və pak insan kimi bizdən də artıq sevən, amma rəftarları ayrı cür olan insanlar olmuşdur. Çünki onlar bu xüsusiyyətlərə - belə fədakarlıq, mənəmlikdən uzaq durmaq, özü üçün çalışmamaq xüsusiyyətlərinə malik olmamış, hələ öz hasarlarında ilişib-qalmışdılar. Əlinin (ə) üstünlüyü özdə qalmamasıı idi. Onun üçün eqonun əhəmiyyəti yox idi, önəmli olan .vəzifə, məqsəd, Allah yolunda mübarizə və Allah idi



---

۱- [۴۳] Bəqərə/۲۰۷.

Əmirəlmömininin (ə) uşaq çağında Peyğəmbərə (s) iman gətirməsi Məkkə şəhərində məsxərə və əziyyətlərlə qarşılandı. Məkkə əhalisi mədəni və nəzakətli insanlar deyildilər, kobud, dalaşqan, xırda bir şey üstündə vuruşan, öz batil inamlarına qatı təəssübkeş insanlar idilər. Belə bir cəmiyyətdə böyük bir insan tərəfindən onun hər şeyini – etiqadlarını, adət-ənənələrini sual altına salan söz deyilir. Təbii ki, hamı ona qarşı çıxar, müxtəlif təbəqələr ona müxalif olarlar. Belə də oldu: əhali Peyğəmbərə (s) qarşı çıxdı. Belə bir insanı və belə bir sözü bütün vücudu ilə müdafiə etmək və ona .qoşulmaq isə fədakarlıq tələb edirdi. Bu, Əmirəlmömininin (ə) birinci fədakarlığı idi

Əli ibn Əbu Talib (ə) on üç il ən çətin zamanlarda Peyğəmbərin (s) yanında oldu. Düzdür, əziz Peyğəmbərin (s) mühacirəti çarəsizlikdən, Qüreyşin və Məkkə əhalisinin zülmündən baş verdi, amma işıqlı gələcəyi müjdələyirdi. Hamı bilirdi ki, bu mühacirət uğur və qələbələrə girişdir. Sanki bir hərəkat çətin dövrdən asanlıq və azadlıq dövrünə keçir. Adətən hamının tələsdiyi, ictimai məqam və postlara yiyələnməyə can atdığı məqamda Əmirəlmöminin (ə) zülmət və qaranlıq gecədə Peyğəmbərin (s) yatağında yatmağa razı oldu. Peyğəmbər (s) bu üsulla evdən və şəhərdən çıxa bilərdi. Həmin gecə bu yataqda yatanın öldürülməsi təxminən qəti və qaçılmaz idi. Biz indi bilirik ki, Əli (ə) həmin hadisədə şəhid olmadı, amma onlar bilmirdilər, gecənin qaranlığında müəyyən bir yerdə bir nəfər mütləq öldürülməli idi. Təhlükədən uzaqlaşması üçün kimsə onun yerində yatmalı idi ki, casuslar orada olduğunu zənn etsinlər. Kim buna razıdır? Əmirəlmömininin (ə) bu fədakarlığının özü fövqəladə əhəmiyyətə malikdir. Amma bu fədakarlığın zamanı onun əhəmiyyətini bir qədər də artırır. Bu, məşəqqətli dövrün bitdiyi, hakimiyyətin və rahatlığın başlandığı, Yəsrib əhalisinin iman gətirərək Peyğəmbəri (s) gözlədiyi zaman baş verir. Bunu hamı bilir. Əmirəlmöminin (ə) belə bir anda bu

fədakarlığı edir. Belə böyük işi görmək üçün bu insanda heç bir şəxsi maraq .olmamalıdır

Sonra Mədinəyə daxil olurlar, Peyğəmbərin (s) yeni hökumətinin müharibələri və gecə-gündüz mübarizələri başlayır. Belə bir hökumətin xüsusiyyəti budur: daim müharibə var. Peyğəmbərin (s) həyatının bu on ili hətta Bədr döyüşündən öncədən döyüşlə keçmişdir. Əziz Peyğəmbər (s) bu on il ərzində müxtəlif kafir qəbilələri ilə onlarla müharibə aparmışdır. Bütün bu dövrdə Əmirəlmöminin (ə) Peyğəmbərin (s) fədaisi və ən öndə gedən sərkərdəsi kimi fəaliyyət göstərir, bu təhlükəli döyüşlərin hamısında iştirak edir. Tarixdən əlavə, Əmirəlmömininin (ə) özü də söyləyir ki, mən qəhrəman sərkərdələrin qorxduğu, geri çəkilməyə məcbur olduğu yerlərdə Peyğəmbərin (s) kənarında qaldım və canımı ona sipər etdim.(١) Əmirəlmöminin (ə) ən ağır mərhələlərdə möhkəm dayandı. Onun üçün təhlükə heç bir əhəmiyyət kəsb etmirdi. Bəzi adamlar düşünürlər ki, sonradan İslama faydamız toxunsun deyə canımızı qorumalıyıq. Əmirəlmöminin (ə) heç zaman özünü belə bəhanələrlə aldatmadı, onun uca qəlbi aldanan deyildi. Əmirəlmöminin (ə) bütün təhlükəli yerlərdə .ön sırada dururdu

### Sükut və əməkdaşlıq dövrü

Məncə, əziz Peyğəmbərin (s) vəfatından sonra yaşadığı otuz il Əmirəlmömininin (ə) həyatının ən ağır dövrü olmuşdur. Böyük və əziz Peyğəmbərin (s) sayəsində mübarizə apardıqları, cihad etdikləri zaman şirin və yaxşı günlər idi. Acı günlər Peyğəmbərin (s) vəfatından sonra başladı. Bu dövrdə bəzən fitnə buludları üfüqü o qədər qaraldırdı ki, düzgün addım atmaq istəyənlər bir addım da irəliləyə bilmirdilər. Əmirəlmöminin (ə) .belə bir şəraitdə fədakarlığın ən böyük imtahanını verdi



---

.Nəhcül-bəlağə, xütbə: ١٩٧ [۴۴] -١

Əvvəla, Peyğəmbərin (s) vəfatı zamanı Əmirəlmöminin (ə) vəzifəsini yerinə yetirməklə məşğul idi. Deyə bilmərik ki, o, İslam dünyasında hakimiyyətin taleyini həll edəcək bir toplantının keçirildiyini, yaxud bunun mümkünlüyünü bilmirdi. Əmirəlmömininin (ə) problemi bu deyildi, onun üçün özü əhəmiyyət kəsb etmirdi. Xilafət məsələsi həll olunandan, xalq Əbubəkrə beyət edəndən və hər şey bitəndən sonra Əmirəlmöminin (ə) kənara çəkildi. Bu zaman ondan hakimiyyətə qarşı bir cümlə, yaxud söz eşidilmədi. İlk günlərdə haqq bildiyini və həyata keçməli olanı reallaşdırmağa çalışırdı, sonra isə xalqın beyət etidiyini, məsələnin bitdiyini və Əbubəkrin müsəlmanların xəlifəsi olduğunu görəndə narazı olsa da, İslam tarixində hakimiyyət üçün heç bir zərərin, təhlükə və təhdidin olmadığı bir insan kimi tanınır. Əmirəlmöminin (ə) çox sürməyən, bəlkə də bir neçə aya qədər davam edən birinci dönəm bitəndə deyirdi: "Bilirsiniz ki, mən xəlifəliyə başqalarından daha layiqəm". Deyirdi ki, bunu özünüz də bilirsiniz, amma Allaha and olsun, müsəlmanların işlərinin sağlam şəkildə getdiyini bilincə, kiminsə zülmə məruz qalmadığını görüncə əlimi əlimin üzərinə qoyub təslim olacağam. Yəni nə qədər ki, xalqa zülm olunmur və yalnız mənim haqqım tapdanır, heç kimlə işim .olmayacaq, heç bir etiraz etməyəcəyəm

Qısa müddətdən, bəlkə də bir neçə aydan sonra bəzi qruplar dindən çıxmağa başladılar. Bu işdə müəyyən qüvvələrin də rolu ola bilərdi. Bəzi ərəb qəbilələri Peyğəmbərin (s), İslam rəhbərinin olmadığını duyub etiraz etmək və vuruşmaq üçün bir bəhanə axtardılar, bəlkə də münafiqlər onları buna təhrik edirdilər. Hər halda, dindənçıxma tendensiyası və bunun ardınca uyğun döyüşlər başlandı. Vəziyyət belə olanda Əmirəlmöminin (ə) gördü ki, kənarda oturmaq zamanı deyil, hakimiyyəti müdafiə etmək lazımdır. Buyurur ki, xilafət məsələsi həll olunanda və Əbu Bəkr (müsəlmanların xəlifəsi(١



Yenə orada, xütbə ٧۴[۴۵] -١

seçiləndə çəkilib kənarda oturdum, sonradan xalqın bir qisminin İslamdan çıxaraq onu məhv etmək istədiyini görəndə isə işə qarışdım.(۱) Əmirəlmöminin (ə) fəal şəkildə .proseslərə qatıldı və bütün mühüm ictimai məsələlərdə iştirak etdi

Onun özü üç xəlifənin ۲۵ illik xilafəti dövründəki iştirakını vəzirlik adlandırır. Osmanın qətlindən sonra Əmirəlmömininі (ə) xəlifə seçmək istəyəndə buyurdu ki, mən əmir olmaqdansa, keçmişdəki kimi vəzir olsam yaxşıdır; icazə verin vəzir olum.(۲) O burada özünün ۲۵ illik mövqeyini vəzirlik adlandırır. Yəni cəmiyyətin idarəsində daim məqsədlərin xidmətində durur, xəlifələrə kömək edirdi. Bu da olduqca böyük fədakarlıqdır. İnsan Əmirəlmömininin (ə) necə fədakarlıq göstərdiyini düşünəndə .həqiqətən dəhşətə gəlir

Bu ۲۵ il ərzində qiyam, çevriliş, dəstə toplamaq və hakimiyyətə gəlmək haqda düşünmədi. Belə şeylər insanların beyninə gəlir. Əziz Peyğəmbər (s) dünyadan köçəndə Əlinin (ə) təxminən ۳۰-۳۲ yaşı vardı. Sonralar da gənclik, fiziki qüvvə və fəallıq dövrünü yaşayırdı. Xalq arasında hörməti, dərin düşüncəsi, çoxlu elmi və bir insan üçün mümkün olan bütün müsbət cəhətlər onda yüksək həddə mövcud idi. O, bir iş görmək istəsəydi, mütləq bacarardı. Bu ۲۵ ildə Əmirəlmöminin (ə) başda xəlifələrin durduğu İslam quruluşunun ümumi məqsədlərinə xidmətdən başqa bir hərəkət etmədi və onlardan da heç bir narazılıq görünmədi. Həm də bu dövrdə çox böyük .hadisələr baş verdi. Mən indi tarixi hadisələrin izahına keçmək istəmirəm

İkinci xəlifənin vəfatından sonra Əmirəlmömininі (ə) altınəfərlik şuraya dəvət etdilər. İmam ona qoşuldu, küsüb demədi ki, bunlar mənim tayım deyillər, Təlhə, Zübeyr, Əbdürrəhman ibn Övf və Osman hara, mən hara. Ömərin vəsiyyətinə əsasən, öz aralarından bir nəfəri xəlifə seçmək üçün altınəfərlik şura təşkil olundu. Bu altı nəfərin arasından



---

.Yenə orada, məktub: ۶۲[۴۶] -۱

.Yenə orada, xütbə: ۹۲ [۴۷] -۲

xəlifəlik üçün hamıdan çox şansı vardı. Əbdürrəhman ibn Övfün səsi təyinedici idi. Əmirəlmöminin (ə) iki səsi vardı: özü və Zübeyr. Osmanın da iki səsi vardı: özü və Təlhə. Əbdürrəhman ibn Övfün də iki səsi vardı: özü və Səd ibn Əbi Vəqqas. Odur ki, Əbdürrəhman ibn Övfün seçimi təyinedici idi. Əli (ə) ilə beyət etsəydi, xəlifə o olacaqdı, Osmanla beyət etsəydi Osman. Əvvəlcə Əmirəlmömininə (ə) təklif etdi ki, Allahın kitabı, Peyğəmbərin (s) sünnəsi və öncəki iki xəlifənin yolu ilə hərəkət etsin. İmam buyurdu ki, mən Allahın kitabını və Peyğəmbərin (s) sünnəsini qəbul edirəm, iki xəlifənin yolu ilə isə işim yoxdur, onların ictihadına deyil, öz ictihadıma əməl edəcəyəm. O, doğru və haqq bildiyindən azca güzəştə getməklə hakimiyyətə gələ bilərdi. Amma bir an da bu haqda düşünmədi və hakimiyyəti əldən verdi. Burada da fədakarlıq etdi, .özünü əsla nəzərə almadı və xeyrindən keçdi

Osmanın onikiillik hakimiyyətinin sonlarında etirazlar artdı, çoxları ona müxalif oldu. Misirdən, İraqdan, Bəsrədən və digər yerlərdən Mədinəyə toplaşıb böyük bir izdiham yaratdılar, Osmanın evini mühasirəyə alıb həyatını təhdid etdilər. Bu zaman Əmirəlmöminin (ə) yerində olan nə edərdi? Özünü xilafət haqqına sahib bilən, ۲۵ ildir öz hüququndan məhrum edilən, indiki hakimin əməllərinə də etirazı olan bir şəxs indi xəlifənin evinin mühasirəyə alındığını görür. Adi adamlar, hətta böyük şəxsiyyətlər burada nə edərlər? Təlhənin, Zübeyrin, Aişənin və bu hadisədə hər hansı formada əli olan digər şəxslərin gördüyü işi görərlər. Osmanın qətli İslam tarixinin çox mühüm hadisələrindən biridir. Nəhcül-bəlağəyə, İslam tarixinə və ədəbiyyatına baxanda Osmanın qətlinə səbəb olanların və onu öldürənlərin kimliyi tamamilə aydın olur. Sonralar Osmanla dostluq iddiasını şüar seçənlər arxadan xəncər vurdular və gizlicə təhrik etdilər. Əmr Asdan soruşdular ki, Osmanı kim öldürdü? Bir səhabənin adını çəkib dedi ki, filankəs xəncərini düzəltdi, filankəs itilədi, filankəs zəhərə buladı, başqa birisi .də zərbəni endirdi. Həqiqət də budur

Əmirəlmöminin (ə) bu hadisədə tam ixlasla dini vəzifəsinə əməl etdi. İki dəyərli gövhər və Peyğəmbərin (s) iki yadigarı olan Həsən və Hüseyni (ə) Osmanı müdafiə etmək üçün onun evinə göndərdi. Müxaliflər Osmanın evinin ətrafını sarıb içəriyə su buraxmırdılar. Əmirəlmöminin (ə) Osmana su və yemək göndərdi. Osmana qəzəblənənlərlə dəfələrlə söhbət edib onları sakitləşdirməyə çalışdı. Onlar Osmanı .öldürəndə Əmirəlmöminin (ə) qəzəbləndi

Burada da bütün insanların malik olduğu mənəm-mənəmlik, eqoistlik və şəxsi hisslər Əlidə (ə) əsla müşahidə olunmur. Osman öldürüləndə Əli (ə) hörmətli bir şəxsiyyət və xilaskar insan kimi meydana çıxıb deyə bilərdi ki, ey camaat, daha qurtuldunuz, xilas oldunuz. Xalq da onu sevərdi. O isə belə etmədi. Osmanın qətlindən sonra Əmirəlmöminin (ə) hakimiyyətə can atmadı. Bu ruh nə qədər böyükdür: Məni buraxın və başqasına müraciət edin(۱). Deyirdi ki, başqasını xəlifə seçsəniz, mən onun kənarında vəzir – yardımçı və məsləhətçi olaram. İmam bu sözləri həmin gün buyurdu, .xalq isə qəbul etmədi və Əlidən (ə) başqa bir şəxsi hakim seçə bilməzdi

## Xilafət dövrü

Bütün müsəlman aləmi Əmirəlmömininlə (ə) beyət etdi. O zamana qədər heç bir beyət belə ümumi olmamışdı. Yalnız Şam onunla beyət etmədi. Bütün İslam aləmi, böyük şəxsiyyətlər və səhabələr beyət etdilər. On nəfərdən az olan kiçik bir qrup qaldı. Əmirəlmöminin (ə) onları bir məscidə toplayıb bir-bir beyət etməmələrinin səbəbini soruşdu. Abdullah ibn Ömər, Səd ibn Əbi Vəqqas da onların arasında idi. Hər biri bir səbəb göstərib danışdılar. Bəziləri sonra beyət etdilər, bəziləri isə etmədilər. İmamın bu bir neçə nəfərlə işi olmadı. Amma Təlhə, Zübeyr kimi digər görkəmli şəxslərin hamısı onunla beyət etdilər. Beyətdən qabaq imam onlara



---

۱- [۴۸] Yenə orada.

buyurdu ki, sizin israrınızı qəbul edib xəlifə oluramsa, tanınmış şəxsiyyətləri, qədim simaları və adlı-sanlı adamları nəzərə alacağımı düşünməyin; elə bilməyin ki, mən ona-buna tabe olacaq, təqlidçilik edəcək və digərlərinin üsulu ilə işləyəcəyəm. Əsla belə olmayacaq. Mən sizi İslamdan anladığım və təyin etdiyim şəkildə idarə edəcəyəm.(١) O, bu sözləri deyəndən sonra xilafəti qəbul etdi. Əmirəlmöminin (ə) müxtəlif məsələləri nəzərə alıb güzəştə gedə və onların könlünü ala bilərdi. Amma burada da İslam prinsipləri və dəyərləri üzərində qətiyyətlə dayandı. Belə ki, qarşısında o qədər düşmən meydana çıxdı və Əli (ə) bir cəbhədə qızıl, güc və hiylə tərənnümləri ilə, bir cəbhədə mötəbər və məşhur şəxsiyyətlərlə, başqa bir cəbhədə isə zahirən abid, əslində isə İslamın həqiqətindən, ruhundan, İslam təlimlərindən və Əmirəlmömininininin (ə) məqamından xəbəri olamayan radikal və daşürəkli təkfirçilərlə .üzləşməli oldu

Əmirəlmöminin (ə) üç düşərgədə ayrı-ayrı şəkildə Nakisin (əhdi pozanlar), Qasitin (zülmkarlar) və Mariqin (dindən çıxanlar, yaxud yolunu azmışlar) qrupları ilə vuruşdu. Bu hadisələrin hər biri onun Allaha güvənməsini, fədakarlığını və xudpəsəndlikdən kənar ruhunu göstərir. O, nəhayət bu yolda şəhadətə qovuşdu. O həzrət haqqında demişlər ki, ədaləti onu qanına qəltan elədi. Əgər Əli (ə) ədaləti kənara qoyub başqa məsələləri nəzərə alsaydı, öz məqamını və şəxsiyyətini İslam dünyasının maraqlarından üstün tutsaydı, ən uğurlu və qüdrətli xəlifə olardı, heç kim onunla düşmənlik də etməzdi. Lakin Əmirəlmöminin (ə) haqq və batilin meyarıdır. Məhz buna görə kim həzrət Əlinin (ə) ardıcılıdırsa, onu qəbul edirsə, onun kimi rəftar etmək istəyirsə, haqq və kim Əlini (ə) qəbul etmirsə, batildir. Məhz buna görə Əmirəlmöminin (ə) şəxsi maraqlarının və eqosunun ən kiçik müdaxiləsi belə olmadan seçdiyi yolla hərəkət etmişdir.Əmirəlmöminin (ə) belə bir şəxsiyyətdir. Buna görə də, həqiqətən .haqqın meyarıdır



---

.Yenə orada [۴۹] -۱

Əmirəlmömininin (ə) həyatı budur: İnsanların eləsi də vardır ki, Allahın razılığını qazanmaq yolunda öz canını fəda edər(۱). Əli (ə) canını yalnız şəhadəti zamanı və ölüm anında qurban vermədi, bütün ömrü boyu həmişə öz canını Allah yolunda fəda etdi. ((۱۹۸۹

Əmirəlmöminin (ə) bu müddətdə göstərdi ki, İslamın təcrid olunduğu və İslam cəmiyyətinin kiçik olduğu dövrdə yaranmış İslam prinsipləri və İslam dəyərləri cəmiyyətin rifah, inkişaf, iqtidar və maddi təminat dövründə də icra oluna bilər. Bu, olduqca əhəmiyyətli məsələdir. İslam prinsipləri, İslam ədaləti, insansevərlik, cihad, İslam quruculuğu, İslamın əxlaq və dəyərləri Peyğəmbərin (s) dövründə ilahi vəhylə nazil oldu və onun tərəfindən İslam cəmiyyətində mümkün həddə həyata keçirildi. Amma Peyğəmbər (s) dövrünün İslam cəmiyyəti on ilə qədər yalnız Mədinə ilə məhdudlaşırdı, bir neçə min nəfər əhalisi olan kiçik bir şəhərdən ibarət idi. Sonradan Məkkə və Taifi fəth edəndə də çox məhdud sərvəti olan, kütləvi yoxsulluğun və çox az imkanların mövcud olduğu məhdud bir bölgə idi. Belə bir şəraitdə İslam dəyərlərinin .əsası qoyuldu

Peyğəmbərin (s) dünyadan köçdüyü zamandan ۲۵ il ötmüşdür. Bu ۲۵ ildə İslam ölkəsinin əhatəsi yüzlərlə dəfə artmışdır, iki dəfə, üç dəfə, on dəfə yox. İmam Əli (ə) hakimiyyətə gələndə Orta Asiyadan Şimali Afrikaya, yəni Misirə qədər geniş ərazi İslam hökumətinə tabe idi. Əvvəldə İslam dövlətinin iki böyük qonşu imperiyası olan İran və Romadan biri tamamilə devrilmişdi. O zaman İran hökuməti devrilmiş və bütün İran torpaqları İslamın ixtiyarına keçmişdi. Rum torpaqlarının əsas hissəsi – Şam, Fələstin, Mosul və digər yerlər də İslam dövlətinə tabe idi. İslam dünyası belə bir geniş sahəni əhatə edirdi, çoxlu sərvət əldə edilmişdi, daha yoxsulluq, çatışmazlıq və qəhətlik yox idi; qızıl geniş yayılmış, pul çoxalmış, sərvətlər artmış, İslam ölkəsi .varlanmışdı, çoxları həddən artıq rifah içərisində yaşayırdılar



---

۱- [۵۰] Bəqərə/۲۰۷.

Əgər Əli (ə) olmasaydı, tarix belə nəticə çıxarardı ki, İslam prinsipləri və Peyğəmbər dəyərləri yaxşı idi, amma Mədinə dövrünə, İslam cəmiyyətinin kiçik və yoxsul olduğu zamana aiddir. İslam cəmiyyəti böyüyəndən, müxtəlif sivilizasiyalarla qarışandan, İran və Romadan mədəniyyət və sivilizasiya nümunələri cəmiyyətə daxil olandan və müxtəlif xalqlar İslam dünyasına qatılandan sonra daha həmin prinsiplər ölkəni idarə edə bilməz. Əmirəlmöminin (ə) bu beş ildə öz əməli, rəftarı və hakimiyyət tərzi ilə göstərdi ki, erkən peyğəmbərlik çağının bu parlaq prinsipləri – tövhid, ədalət, insaf, bərabərlik Əmirəlmöminin (ə) kimi qüdrətli bir xəlifə tərəfindən də icra oluna bilər. Bu, tarixdə qalmış bir şeydir. Əmirəlmöminindən (ə) sonra bu üsul davam etməsə də, o göstərdi ki, İslam hakimi, cəmiyyətin müsəlman başçıları istəsələr və iradə nümayiş etdirsələr, həmin prinsipləri İslam hökumətinin, İslam coğrafiyasının genişləndiyi, müxtəlif və yeni həyat şəraitinin yarandığı dövrdə də icra edə və xalqa fayda yetirə bilərlər. Bəllidir ki, ictimai ədaləti Mədinənin ۱۰-۱۵ min nəfərlik bir cəmiyyətində bərqərar etmək hara, Əmirəlmömininin (ə) dövründəki onmilyonluq və yüzmilyonluq bir cəmiyyətdə bərqərar etmək hara! Əmirəlmöminin (ə) bu işləri gördü.

Mən Əmirəlmömininin (ə) öz sözlərində əks olunan bir neçə işini burada deyəcəyəm. Onun həyatında minlərlə belə nümunə var. Xalq gəlib israrla beyət etmək istəyir, o isə qəbul etmirdi. Xalqın israrı çoxaldı, böyüklər, kiçiklər, başçılar və qədim səhabələr dedilər ki, yox, yalnız Əli ibn Əbu Talib (ə) olmalıdır və qeyrisi mümkün deyil. Onlar gəlib israrla imamı apardılar. Buyurdu ki, onda məscidə gedək. Əmirəlmöminin (ə) minbər üzərində xütbə oxudu və öz sözünü dedi. Buyurdu ki, bu gün görkəmli və möhtərəm şəxslərin haqsız olaraq sahib olduğu malları beytülmala – ümumi xəzinəyə qaytaracağam. Bu bir neçə ildə bəzi şəxslər beytülmaldan bəzi pulları mənimsəyə bilmişdilər. Buyurdu ki, mən bunların hamısını qaytaracağam; əgər bu malları qadınlarınıza mehr etmiş,

yaxud onunla özünüzə kəniz almış olsanız belə, hamısını beytülmala qaytaracağam.(۱)
.Hamı bilsin ki, mənim yolum budur

Bir neçə gündən sonra müxalifətlər başlandı. Cəmiyyətin aztəminatlı və məhrum təbəqəsi belə bir cəmiyyəti Allahdan arzu edir, lakin nüfuzlular və bu sözün əsas müraciət tərəfləri təbii ki, narazı qaldılar. Oturub iclas keçirdilər, dedilər ki, Əli (ə) nə üçün belə etmək istəyir. Osmanın dövründə Kufənin valisi olmuş Vəlid ibn Üqbə onların tərəfindən Əmirəlmömininin (ə) yanına gəlib dedi ki, ey Əli, səninlə beyətimizin şərti var. Şərtimiz budur ki, əldə etdiyimiz pullara toxunmayasan, səndən qabaq qazandıqlarımızla işin olmasın.(۲) Vəliddən sonra Təlhə və Zübeyr gəldi. Vəlid ibn Üqbə Təlhə və Zübeyrdən fərqlidir. Vəlid yeni müsəlman olanlardandır, ailəsi İslamın və inqilabın düşməni olmuş, İslamla vuruşmuşdu. Peyğəmbərin (s) ömrünün sonlarında İslam qələbə çalanda Bəni-Üməyyənin digər üzvləri kimi o da müsəlman oldu. Təlhə və Zübeyr isə qədimdən müsəlman olanlardan, Peyğəmbərin (s) yaxın səhabələrindən idilər. Buna baxmayaraq, onlar da Əlinin (ə) yanına gəlib şikayət etdilər. Dedilər ki, sən beytülmalın bölgüsündə bizi başqaları ilə bir tutursan, bizə də bizə tay olmayanlar qədər təqaüd verirsən. Bu nə deməkdir? Nə üçün bizə xüsusi imtiyaz vermirsən? Bunlar bizim xəncərimizlə əldə olunub, İslamı qalib edən, zəhmət çəkən biz idik, indi isə bizi yeni müsəlmanlarla və fəth olunmuş ərazilərdən gələn qeyri-ərəblərlə bir (tutursan?!(۳

Əmirəlmömininin (ə) Vəlid ibn Üqbəyə cavabını görməmişəm, tarixdə qeyd olunmayıb, amma digərlərinə verdiyi cavab bəllidir. Həzrət minbər üzərindən sərt cavab verdi. Beytülmalın bərabər bölgüsünə dair buyurdu ki, bu üsulun əsasını mən qoymamışam. (Mən və siz Peyğəmbərin (s



---

.Nəhcül-bəlağə, xütbə: ۲۹ [۵۱] -۱
.Bihar əl-ənvar, c. ۳۲, səh: ۱۹ [۵۲] -۲
.Yenə orada, səh: ۲۱ [۵۳] -۳

belə etdiyini görmüşük.(۱) Mən yeni bir iş görmürəm, Peyğəmbərin (s) işini davam etdirirəm, cəmiyyətdə həmin dəyərləri, etiqad və əməl prinsiplərini bərqərar etmək .istəyirəm. Əli (ə) bunu etdi və bədəlini də ödədi

Bu işin bədəli üç müharibə idi və Əmirəlmöminin (ə) bundan qorxmadı. Təbii ki, o, xilafəti öz haqqı bilirdi, amma Peyğəmbərin (s) vəfatından sonra bu haqqı uğrunda ۲۵ il heç bir iş görmədi, kimsə danışmaq istəyəndə də sakitləşdirirdi. Əmirəlmöminin (ə) ۲۵ il bu mövzuda sükut etdi. Amma zahirən ondan əhəmiyyəti ondan az görünən bir məsələ – yəni ictimai ədalət, Peyğəmbər (s) prinsiplərinin dirçəldilməsi və Peyğəmbərin (s) yaratdığı möhkəm İslam cəmiyyəti qurmaq naminə üç müharibəyə getdi: Cəməl, Siffeyn və Nəhrəvan döyüşləri. Görün Əmirəlmömininə (ə) görə bu iş nə qədər əhəmiyyətli olmuşdur. Əmirəlmöminin (ə) böyük işi budur. Onun bu barədə başqa bir cümləsi var. Bizim Əli (ə) təlimləri ilə bir qədər tanış olmağımız pis olmaz. O buyurur ki, kimsə mömindirsə, Allah yolunda mübarizdirsə, çoxlu zəhmətlər çəkmiş, cəbhədə olmuş və böyük işlər görmüşdürsə, onun hüququna riayət etmək vacibdir. Lakin bu şəxs qanundan yayınsa və hüquq pozuntusuna yol versə, həmin vacib haqq onun cəzalandırılmamasına səbəb olmamalıdır. Odur ki, məsələləri bir-birindən ayırın. Kimsə yaxşı adamdırsa, dəyərli şəxsdirsə, yaxşı keçmişi varsa, İslam və ölkə üçün zəhmət çəkmişdirsə, çox gözəl, onun hüququ qorunmalı və ona hörmət göstərilməlidir. Lakin bu şəxs cinayət törətsə, ona göz yummaq olmaz. Əmirəlmöminin (ə) məntiqi budur. Onun şair və məddahlarından olan Nəccaşi Siffeyn döyüşündə insanları Müaviyəyə qarşı döyüşə həvəsləndirmək üçün ən yaxşı şeirlər qoşmuşdur. O, Əlini (ə) sevirdi, onun tərəfində idi, ixlas və vilayət baxımından məşhur adamdır. Bu adam ramazan ayında şərab içdi. Əmirəlmöminin (ə) bundan xəbər tutanda buyurdu ki, şərab içməyin cəzası məlumdur; onu



---

.Yenə orada, səh: ۲۲ [۵۴] -۱

gətirin və burada cəzalandırın. Əmirəlmöminin (ə) hamının gözü önündə onu cəzalandırdı, ona ۸۰ qamçı vurdu. Onun ailəsi və qəbiləsi imamın yanına gəlib dedilər ki, sən bizi rüsvay etdin, axı bu sənin tərəfdarlarından, dostlarından, bugünkü sözlə desək, siyasi blokunun üzvü idi. İmam buyurdu ki, mən bir iş görməmişəm; müsəlman bir cinayət törətdi və ona ilahi cəza vacib oldu, mən də həmin cəzanı icra etdim. Nəccaşi bundan sonra dedi ki, belədirsə, mən də gedib Müaviyə üçün şeir deyəcəyəm. Əlinin (ə) yanından gedib Müaviyənin düşərgəsinə qoşuldu. Əmirəlmöminin (ə) də demədi ki, Nəccaşi əldən çıxdı, heyfdir, onu saxlayaq. Xeyr! Gedirsə, getsin; təbii ki, qalsaydı, daha yaxşı olardı. İmam Əlinin (ə) məntiqi və yolu budur. Nəccaşinin tərəfdarlarına dedi ki, cəzalandırdıq və günahı silindi.(۱)

Əmirəlmömininlə (ə) qohum olan Bəni-Əsəd qəbiləsindən bir nəfər cinayət törətmişdi. Həmin qəbilədən olan və Əmirəlmöminini (ə) sevən bir neçə nəfər dedi ki, gedib məsələni həll edərik. Əvvəlcə İmam Həsənin (ə) yanına gəlib vasitəçi olmasını istədilər. İmam Həsən (ə) buyurdu ki, mənim gəlməyimə ehtiyac yoxdur, atam sizi tanıyır, özünüz gedin. Özləri Əlinin (ə) yanına gedib dedilər ki, vəziyyət belədir, bizə kömək et. İmam buyurdu ki, mənim ixtiyarımda olan hər hansı iş üçün razılıq verə bilərəm. Bunlar sevinib geri döndülər. Yolda İmam Həsənlə (ə) rastlaşdılar. İmam Həsən (ə) soruşdu ki, nə etdiniz. Dedilər ki, şükür Allaha, yaxşı oldu, Əli (ə) bizə söz verdi. Soruşdu ki, Əmirəlmöminin (ə) sizə nə dedi? Onlar imamın cavabını söylədilər. İmam Həsən (ə) təbəssüm edərək buyurdu ki, onun cəzalandırılacağı təqdirdə görməli olduğunuz işi görün. Əmirəlmöminin (ə) onu cəzalandırdı. Gəlib dedilər ki, ey möminlərin əmiri, nə üçün bu şəxsə qamçı vuruldu? Dedi ki, cəza mənim ixtiyarımda deyil, ilahi hökmdür. Mən demişdim ki, ixtiyarım çatanı



---

۱- [۵۵] Əl-Həyat, c. ۲, səh: ۷۱۴.

edərəm, ilahi cəza isə mənim ixtiyarımda deyil.(۱) Üstəlik, Bəni-Əsəd Əmirəlmömininin (ə) dostlarından və tərəfdarlarından idi. Əlinin (ə) həyatı belə idi.

Onun və övladlarının xörəyi, geyimi, məişət vəziyyəti haqda çox sözlər deyilmişdir. Bir rəvayətçi deyir ki, gedib Həsən və Hüseynin (ə) xörək yediklərini gördüm. Onların xörəyi çörək, sirkə və göyərtidən ibarət idi. Dedim ki, siz axı əmirsiniz, xəlifə ailəsi, Əmirəlmömininin (ə) övladlarısınız, bazarda da bu qədər məhsul var, Kufənin yaxınlığında yerləşən Rəhbə bazarında bu qədər məhsul satırlar. Sizin xörəyiniz elə budur? Onlar həmin şəxsə dedilər ki, sən Əmirəlmömininini (ə) tanımırsan; get onun həyatına bax.(۲) O həzrət öz ailəsi ilə də belə rəftar edirdi.

Zeynəb-Kübranın məsələsini eşitmisiniz. Əbu Rafedən birovuz götürmüşdü. Əqilin macərasını da eşitmisiniz. O, imamın yanına gəlib bir qədər artıq buğda istədi. Həzrət isti dəmiri ona yaxınlaşdırdı. Təbii ki, vurmadı, qorxutdu və istəyini qəbul etmədi. Öz qardaşı oğlu və kürəkəni - həzrət Zeynəbin həyat yoldaşı olan Abdullah ibn Cəfər onun yanına gəlib dedi ki, ey möminlərin əmiri, əlim boşdur, məişət əyalarını satmağa məcburam, mənə bir qədər kömək et. İmam qəbul etməyib buyurdu ki, deyirsən əmin oğurluq etsin və xalqın malını sənə versin?!

Əmirəlmöminin (ə) Peyğəmbər (s) dövrünə nisbətən inkişaf etmiş, böyümüş, sivil və sərvətli bir cəmiyyətdə hakimiyyət meyarını müəyyən etdi. Hər şey inkişaf etmişdi. Əmirəlmöminin (ə) öz rəftarı ilə isbat etdi ki, bu vəziyyətdə də həmin prinsipləri yaşatmaq olar. Bu, Əmirəlmömininin (ə) böyük uğurudur. Mənəviyyat, ədalət, cihad, cəmiyyət quruculuğu, layiqli və imanlı idarəçilik prinsipləri bunu göstərir. Siz İmam Əlinin (ə) həyatının ayrı-ayrı hissələrini il boyu onun rəvayət və sözləri şəklində eşidirsiniz.



---

۱- [۵۶] Dəaim əl-İslam, c, ۲, səh: ۴۴۳.

۲- [۵۷] Əl-Mənaqib, c. ۲, səh: ۱۰۸.

Əmirəlmömininin (ə) həyatı bunlarla doludur. Onların xülasəsi budur ki, Əmirəlmömininin (ə) bu İslam prinsiplərini bütün şəraitlərdə həyata keçirməyin mümkünlüyünü dünyaya göstərmək istəyir. Həqiqət də budur. Onun İslam prinsipləri geyim forması deyil ki, ləbbadə geyinirdisə, bu gün biz də həmin işi görməli olaq. İslam prinsipləri ədalətdən, tövhiddən, insafdan, xalqın hüququna dəyər verməkdən, yoxsullara qayğı göstərməkdən, antiislam və antidin cəbhələri qarşısında müqavimətdən, haqq və İslam əsasları üzərində təkiddən, haqqı və həqiqəti müdafiə etməkdən ibarətdir. .Bunları bütün dövrlərdə həyata keçirmək olar

Təbii ki, bu sözləri danışarkən biz əslində zirvə haqda danışırıq. Kim Əmirəlmömininə (ə) hətta bənzəməsini güman edə bilər?! Xeyr! Heç kəs Əmirəlmömininə (ə) bənzəmir. Onun nəvəsi olan məsum imam həzrət Səccada (ə) ibadətlərinin çoxluğundan danışanda buyurdu ki, bizim ibadətlərimiz hara, Əlinin (ə) ibadəti hara! Yəni o da özünü Əli (ə) ilə müqayisə edə bilmir. İmam Səccad (ə) ilə bizim dövrümüzün ən böyük abid və zahidləri arasında yerlə-göy qədər fərq var. Əmirəlmömininin (ə) örnəyi, zirvəni və istiqaməti göstərdi, meyar təyin etdi. Biz də bacardığımız yerə çatmalıyıq. İslam quruluşu ədalət, insaf, xalqa qayğı, insanların hüququna hörmət və güclünün zəifə zülmünə qarşı mübarizə quruluşudur. Tarix boyu bəşərin mühüm problemləri bunlar olmuşdur. Bəşəriyyət həmişə bu problemlərdən əziyyət çəkmişdir, hələ də çəkir. Xalqlar bu hegemonluqlara görə əziyyət çəkir və sıxıntı keçirir. İslamın, Əmirəlmömininin (ə) və Əli (ə) hökumətinin məntiqi həm cəmiyyət daxilində, həm də (beynəlxalq miqyasda bu amillərlə mübarizədir. (۲۰۰۴

## Əlinin (ə) həyatında qüdrət, məzlumluq və qələbə amilləri

İmam Əlinin (ə) şəxsiyyətində, həyatında və şəhadətində bir-biri ilə uyğunluğu .olmayan üç amil cəm olmuşdur. Bu üç amil qüdrət, məzlumluq və qələbədən ibadətdir

O həzrətin qüdrəti ən çətin hərbi işləri idarə etməkdə, beyin və düşüncələri ən uca dini və insani məsələlərə yönəltməkdə, Malik Əjdər, Əmmar, İbn Abbbas, Məhəmməd ibn Əbu Bəkr kimi böyük insanlar yetişdirməkdə və bəşər tarixində bir məktəb yaratmaqda polad iradəsindən və əzmkarlığından ibarətdir. O həzrətin qüdrət tərənnümü məntiq, düşüncə, siyasət, hakimiyyət, cəsarət və güclü qollar idi. İmam Əlinin (ə) şəxsiyyətində heç bir cəhətdən nöqsan yox idi, amma eyni zamanda tarixin ən məzlum şəxsiyyətlərdən idi, məzlumluq onun həyatının bütün sahələrində vardı. Yeniyetmə çağında məzlum idi, Peyğəmbərdən (s) sonrakı gənclik çağında məzlum idi, ahıllıq və xilafət çağında məzlum idi. Şəhadətindən sonra da uzun illər minbərlərdə onu .pislədilər, ona yalan nisbətlər verdilər. Onun şəhidliyi də məzlumcasına idi

İslam ədəbiyyatında iki nəfərə Sarəllah deyilmişdir. Bir insan nahaq yerə qətlə yetiriləndə onun ailəsi qan sahibi və qisas hüququna malik olur. Buna ərəbcə sar deyirlər. Ərəbcədən tərcümədə deyilən Allah qanı ifadəsi bu baxımdan dolğun deyil və məqsədi çatdırmır. Sar sözü intiqam haqqı deməkdir. İslam mənbələrinə görə, iki nəfərin qan sahibi və intiqam haqqına malik olan tərəfi Allahdır. Bu iki nəfərin biri İmam Hüseyn (ə), biri isə atası Əmirəlmöminindir (ə).(١) İmam Əlinin (ə) intiqam haqqı .Allaha məxsusdur

Üçüncü amil isə o həzrətin qələbəsidir. O əvvəla öz həyatında yaradılan bütün çətin əngəllərə qalib oldu; yəni sonra izah edəcəyim güclü düşmən cəbhələri Əlini (ə) diz çökürə bilmədilər, hamısı ona məğlub oldu. Şəhidliyindən sonra onun parlaq siması günbəgün həyatından dəfələrlə artıq şəkildə aydın oldu. Siz bu gün yalnız İslam dünyasına deyil, bütün dünyaya baxsanız, hətta müsəlman olmayan çoxlu şəxsiyyətlərin Əli ibn Əbutalibi (ə) tarixin böyük şəxsiyyəti



---

.Əl-Kafi, c. ۴, səh: ۵۷۶ [۵۸] -١

kimi qəbul etdiklərini və təriflədiklərini görərsiniz. Bu, sözügedən parlaq gövhərin daha da parlamasıdır. Allah-Taala o məzlumluğun qarşısında bunu Əliyə (ə) mükafat verir. Onun məzlumluğu, böyük ittiham və təzyiqlər qarşısında dözümlülüyü təbii ki, Allah-Taalanın mükafatına səbəb olur. Mükafatı da budur ki, siz bəşər tarixində hamının qəbul etdiyi belə bir parlaq sima tapmırsınız. Bu günə qədər Əmirəlmöminin (ə) barədə yazılmış kitablar arasında bəlkə də ən aşiqanə olanlarını qeyri-müsəlmanlar yazmışlar. İndi xatırlayıram ki, üç məsihi yazıçı Əli (ə) haqda həqiqətən aşiqanə tərif kitabları yazmışlar. Bu hörmət şəhadətinin ilk günündən başlandı – hamının, Şam rejiminə bağlı hakimlərin, Əmirəlmömininin (ə) xəncərindən və ədalətindən ziyan görənlərin onun əleyhinə danışdığı və təbliğat apardığı zamandan. Mən burada bir nümunə .deyəcəyəm

Abdullah ibn Ürvə ibn Zübeyrin oğlu atasının yanında Əmirəlmömininі (ə) pislədi. Müsəb ibn Zübeyrdən başqa bütün Zübeyr ailəsinin Əliyə (ə) qarşı münasibəti pis idi. Müsəb ibn Zübeyr şücaətli və səxavətli insan idi. Kufə hadisələrində, Muxtarla və sonra Əbdülməliklə bağlı hadisələrdə iştirak etmişdi. O, həzrət Səkinənin həyat yoldaşı və İmam Hüseynin (ə) birinci kürəkəni idi. Ondan başqa bu ailənin digər üzvlərinin Əliyə (ə) münasibəti pis idi. Bunu tarixdən bilmək olar. Bu adam Əlini (ə) pisləyəndən sonra atası çox da tərəfdarcasına olmasa da, mühüm məqama toxunan bir cümlə işlətdi. Oğluna dedi ki, dinin yaratdığı və kökü din üzərində qurulan heç bir şeyi dünya adamları məhv edə bilmədilər; yəni əməllərinin kökü din və iman üzərində olan Əmirəlmömininin (ə) adını məhv etmək üçün əbəs zəhmət çəkməsinlər. Sonra dedi ki, bax, Mərvan övladları hər məsələdə və hər çıxışda bacardıqları qədər Əli ibn Əbu Talibə (ə) irad bildirir, onu pisləyirlər, amma onların pisləməsi bu parlaq şəxsiyyəti daha da ucaldır və böyüdür; yəni onların sözləri xalqda əks-təsir buraxır. Qarşı tərəf ,Bəni-Üməyyədir. Üməyyə övladları öz babalarını nə qədər artıq tərifləyirlərsə

xalqın onlara nifrəti daha da artır.(١) Bu söz Əmirəlmömininin (ə) şəhidliyindən təxminən otuz il sonra deyilmişdir. Yəni Əmirəlmöminin (ə) bütün məzlumluğuna baxmayaraq, həm öz həyatında, həm də tarixdə və bəşəriyyətin xatirəsində qalib .oldu

Əmirəlmömininin (ə) beş ildən az sürən hakimiyyəti zamanı onun qarşısında üç düşmən cəbhəsi yarandı: Qasitin, Nakisin və Mariqin. Əmirəlmömininin (ə) bu sözünü həm şiələr, həm də sünnilər öz kitablarında yazmışlar: Mən Nakisin (əhdi pozanlar), Qasitin (zülmkarlar) və Mariqin (dindən çıxanlar, yaxud yolunu azmışlar) ilə vuruşmağa əmr olundum(٢). Bu adları o həzrətin özü qoymuşdur. Qasitin zülmkarlar deməkdir. Əmirəlmöminin (ə) onların adını zülmkar qoydu. Bunlar kimlər idilər? Bunlar İslamı zahirən və öz mənfəətlərinə görə qəbul etmiş şəxslər idilər. Onlar Əli (ə) hökumətini kökündən qəbul etmirdilər. Əmirəlmöminin (ə) bunlarla nə edirdisə, faydası olmurdu. Bu qrup Bəni-Üməyyənin və Şam valisi Müaviyə ibn Əbu Süfyanın ətrafına toplaşmışdı. Ən bariz şəxsiyyətləri də cənab Müaviyənin özü, sonra isə Mərvan Həkəm və Vəlid ibn Üqbədir. Bunlar Əli ilə razılaşmayan, yola getməyən bir cəbhəni təşkil edirlər. Doğrudur, Müğeyrə ibn Şöbə, Abdullah ibn Abbas və digərləri hakimiyyətinin əvvəllərində Əmirəlmömininə (ə) dedilər ki, bir müddət bunlarla işin olmasın, imam isə qəbul etmədi. Bunlar Əlinin (ə) siyasətinin zəif olduğunu deyirdilər, lakin sonrakı hadisələr göstərdi ki, özləri məsələnin məğzindən bixəbər olmuşlar. Əmirəlmöminin (ə) nə edirdisə, Müaviyə razılaşmırdı. Bu təfəkkür Əli (ə) hakimiyyətini qəbul edən bir .təfəkkür deyildi. Ondan öncəkilərin bəziləri isə bəzilərinə dözmüşdülər

Müaviyənin müsəlman olmasından Əli (ə) ilə vuruşduğu zamana qədər otuz ildən bir qədər az ötmüşdü. O və ətrafı



---

١- [٥٩] Nəsr əd-dürr, c. ٣, səh: ١٨۶.

٢- [۶٠] Bihar əl-ənvar, c. ۴۴, səh: ٣۶.

illərlə Şamda hakim olmuş, nüfuz qazanmış və ictimai dayaq yaratmışdılar. Elə bir zaman deyildi ki, bir söz deyən kimi onlara siz təzə müsəlman olmusunuz, nə deyirsiniz? – deyən olsun. Onlar artıq özlərinə yer açmışdılar. Odur ki, bunlar ümumiyyətlə Əli (ə) hakimiyyətini qəbul etməyən, hökumətin ayrı cür olmasını və öz əllərinə keçməsini istəyən cinah idi. Sonra bunu göstərdilər və İslam dünyası onların hakimiyyətini təcrübə etdi. Əmirəlmömininlə (ə) rəqabətdə bəzi səhabələrə çox xoş üz göstərən və hörmət ifadə edən Müaviyə sonra kobud rəftarlara keçdi, Yezidin dövründə isə Kərbəla hadisəsi baş verdi. Mərvan, Əbdülməlik, Həccac ibn Yusif Səqəfi və Yusif ibn Ömər Səqəfi də həmin hakimiyyətin yetirmələridir. Yəni cinayətlərini söyləməyə tarixin belə qorxduğu bu hakimlərin - misal üçün, Həccacın hökuməti Müaviyənin yetişdirdiyi və belə bir şey üstündə Əmirəlmömininlə (ə) vuruşan hökumətdir. Onların nə istədiyi əvvəldən bəlli idi. Onlar sırf dünyəvi hakimiyyətə gəlmək və hakim olmaq istəyirdilər. Hamı bu işləri Bəni-Üməyyə hakimiyyətində müşahidə etdi. Sözsüz ki, burada etiqadi və kəlami polemika açmaq istəmirik. Qeyd etdiklərim tarixdir, həm də yalnız Şiə tarixi deyil, İbn Əsirin, İbn Qüteybənin və bu kimi tarixçilərin yazdıqlarıdır. Bunlar tarixin qəti məsələlərindəndir; bunlar haqda şiə və .sünnilər arasında fikir ayrılığı yoxdur

Əmirəlmömininlə (ə) vuruşan ikinci cəbhə Nakisin cəbhəsi idi. Nakisin pozanlar deməkdir və burada məqsəd beyəti pozanlardır. Bunlar əvvəlcə Əmirəlmömininlə (ə) beyət etdilər, sonra isə beyətlərini pozdular. Bunlar müsəlman və birinci qrupdan fərqli olaraq, doğma idilər, amma Əli ibn Əbu Talibi (ə) onlara hakimiyyətdən böyük pay verənə, onlarla məsləhətləşənə, onlara vəzifə verənə, haqsız yolla əldə etdikləri mal-dövlətə toxunmayana, bunları haradan gətirmisiniz? - deməyənə qədər qəbul edirdilər. Bəli, bu qrup Əmirəlmöminini (ə) qəbul edirdi, amma bu şərtlə ki, bu məsələlərlə işi olmasın, bu mal-dövləti haradan və necə qazandıqlarını və nə üçün ,yediklərini soruşmasın. Odur ki

əvvəlcə əksəri beyət etdi. Bəziləri beyət etmədi. Cənab Səd ibn Əbi Vəqqas və başqa bir neçə nəfər əvvəldən beyət etmədilər. Cənab Təlhə, cənab Zübeyr və digər böyük səhabələr isə beyət etdilər, təslim oldular, üç-dörd aydan sonra gördülər ki, yox, bu hökumətlə yola getmək olmur, bu hökumət dost-düşmən bilmir, bu hakim özünə, ailəsinə və köhnə müsəlmanlara xüsusi üstünlük vermir; baxmayaraq ki, özü ən birinci müsəlmandır. Gördülər ki, bu hakim ilahi hökmləri icra etməkdə heç bir şeydən çəkinmir. Bunları görəndən, bu adamla dil tapmağın mümkün olmadığını anlayandan sonra ayrıldılar, gedib həqiqətən bir fitnə olan Cəməl döyüşünü başlatdılar; möminlər anası Aişəni də özlərinə qoşdular. Bu döyüşdə nə qədər adam öldürüldü. Düzdür, Əmirəlmöminin (ə) qələbə çaldı və məsələni yoluna qoydu. Bu da ikinci cəbhə idi və bir .müddət imamın vaxtını aldı

Üçüncü cəbhə Mariqin cəbhəsi idi. Mariq qaçan deməkdir. Bunlar bir oxun kamandan çıxdığı kimi dindən qaçır və uzaqlaşırlar. Bunlar dinin zahiri əməllərinə bağlı idilər, dinin adını da çəkirdilər. Bu, xəvaric qruplaşması idi. Onlar təhlükəli amil olan azğın düşüncələrə qərq olmuşdular. Dini Quranın təfsirçisi və kitab elminə alim olan Əli ibn Əbu Talibdən (ə) öyrənmirdilər, özləri istədikləri kimi yozurdular. Təbii ki, belə insanlardan hər bir cəmiyyətdə var, amma onların qruplaşması, mütəşəkkil formaya düşməsi üçün siyasət lazım idi. Bu siyasət başqa bir yerdən təmin olunurdu. Bir kəlmə danışan kimi bu qruplaşmanın üzvləri bir Quran ayəsi oxuyurdular. Onlar bəzən Əmirəlmömininin (ə) camaat namazı qıldığı yerdə ona sataşmaq məqsədi ilə bir Quran ayəsi oxuyurdular. Əmirəlmömininin (ə) minbərində də bəzən bu məqsədlə ayələr oxuyurdular. Onlar Hökm yalnız Allaha məxsusdur! devizi ilə demək istəyirdilər ki, sizin hakimiyyətinizi qəbul etmirik, Allahın hakimiyyətini istəyirik. Zahiri əməlləri belə idi, siyasi təşkilatlanmaları da Qasitin cəbhəsinin böyüklərinin, Şam hakimlərinin – Əmr As və

Müaviyənin idarəçiliyi və məsləhəti ilə həyata keçirdi, onlarla əlaqələri vardı. Çoxlu faktlar göstərir ki, Əşəs ibn Qeys düz adam deyildi. Düşüncə baxımından bir qrup zəif və zavallı adam da belələrinin arxasınca düşmüşdü. Deyilənlərə əsasən, Əmirəlmömininin (ə) qarşılaşdığı və təbii ki, qələbə çaldığı üçüncü qrup Mariqin idi. İmam Nəhrəvan döyüşündə onlara sarsıdıcı zərbə endirdi. Lakin onlardan cəmiyyətdə .vardı və nəhayət, o həzrəti şəhadətə yetirdilər

Xəvarici düzgün tanımaq lazımdır. Bəzi adamlar onları abidlərə bənzədirlər. Abid bir kənarda oturub özü üçün namaz qılır, dua oxuyur, Xəvaric isə belə deyildi. Xəvaric iğtişaş törədir, böhran yaradır, Əli (ə) ilə vuruşurdu. Onların işi kökündən səhv idi; vuruşmaları səhv və məqsədləri batil idi. Əmirəlmömininin (ə) bu üç qrupla qarşı-.qarşıya gəldi

Əmirəlmömininlə (ə) Peyğəmbərin (s) hakimiyyətlərində əsas fərq bu idi ki, Peyğəmbərin (s) dövründə iman və küfr sıraları bəlli idi. Yalnız münafiqlər qalırdı, Quran ayələri də daim insanları cəmiyyət daxilindəki münafiqlərdən çəkindirir, barmağını onlara sarı uzadır, möminləri onların qarşısında gücləndirir, onları ruhdan salırdı. Peyğəmbərin (s) dövründə İslam quruluşunda hər şey aşkar idi, bəlli cəbhələr bir-birinin qarşısında dayanmışdı; bir nəfər küfr, tağut və cahiliyyət tərəfdarı idi, bir nəfər də iman, İslam, tövhid və mənəviyyat tərəfdarı. Düzdür, orada hər cür adam vardı, lakin sıralar aydın idi. Əmirəlmömininin (ə) dövründə isə sıralar aydın deyildi. İkinci qrup olan Nakisin cəbhəsi hörmətli şəxsiyyətlər idilər. Cənab Zübeyr, yaxud cənab Təlhə kimi bir şəxsiyyət qarşısında qalan hər bir kəs tərəddüd edirdi. Zübeyr Peyğəmbərin (s) dövründə görkəmli şəxsiyyətlərdən, Peyğəmbərin (s) bibisi oğlu və ona yaxın bir şəxs olmuşdur. Hətta Peyğəmbərdən (s) sonra da Əmirəlmömininі (ə) müdafiə etmək üçün Səqifəyə etiraz edənlərdən idi. Allah hamımızın aqibətini xeyirli etsin! Bəzən dünyagirlik və müxtəlif maddi amillər insanda elə təsir buraxır, bəzi şəxsiyyətlərdə elə

dəyişiklik yaradır ki, görkəmli şəxslərə qarşı da şübhə yaranır, o ki qala adi adamlara. .O zaman həqiqətən çətin idi

Əmirəlmömininin (ə) ətrafında qalıb mübarizə aparanlar, vuruşanlar çox ayıqlıq göstərdilər. Mən Əmirəlmömininindən (ə) bu sözü dəfələrlə söyləmişəm: (Zahirən müsəlman görünən zalımlara qarşı) yalnız ayıq və dözümlü insanlar mübarizə apara bilərlər.(۱) Birinci növbədə ayıqlıq lazımdır. Belə çəkişmələrə nəzər salanda Əmirəlmömininin (ə) problemlərini anlamaq olur. Çoxları İslam iddiası altında Əmirəlmömininlə (ə) vuruşur və yanlış sözlər söyləyirlər. İslamın erkən çağında yanlış düşüncələr çox yayılırdı, amma Quran ayəsi nazil olur və açıq şəkildə o düşüncələri rədd edirdi; istər Məkkə dövründə, istər Mədinə dövründə. İnsan Mədinədə nazil olmuş Bəqərə surəsinə baxanda Peyğəmbərin (s) əsasən münafiq və yəhudilərlə müxtəlif problemlərinin şərhini görür və bəzən xırdalıqlarla da rastlaşır. Quranda hətta Mədinə yəhudilərinin o zaman Peyğəmbərə (s) qarşı işlətdikləri psixoloji üsullar da qeyd olunur: "Raina" deməyin(۲). Yenə də Məkkədə nazil olmuş mübarək Əraf surəsində xurafatla geniş mübarizə aparılır. Onlar bəzi ətləri yalan yerə haram adlandırırdılar: De: "Rəbbim yalnız aşkar və gizli alçaq işləri haram buyurmuşdur.(۳) Haram bunlardır, siz isə gedib bütlərə nəzir məqsədi ilə azad edilən, yaxud beş dəfə balalayan və sonuncu balası erkək olan dəvələri özünüzə haram etmisiniz. Quran belə düşüncələrlə açıq mübarizə aparırdı. Əmirəlmömininin (ə) dövründə isə həmin müxaliflər də Qurandan istifadə edir və Quran ayələri oxuyurdular. Əmirəlmömininin (ə) işi bu cəhətdən dəfələrlə ağır idi. Əmirəlmöminin (ə) özünün qısa hakimiyyət .dövrünü belə problemlərlə keçirdi



---

.Nəhcül-bəlağə, xütbə: ۱۷۳ [۶۱] -۱

.Bəqərə/۱۰۴ [۶۲] -۲

.Əraf/۳۳ [۶۳] -۳

Bunların qarşı tərəfində Əlinin (ə) öz cəbhəsi durur. Bu, həqiqətən güclü cəbhədir. Orada Əmmar, Malik Əjdər, Abdullah ibn Abbas, Məhəmməd ibn Əbu Bəkr, Meysəm Təmmar, Hücr ibn Ədi kimi şəxslər var. Mömin və ayıq şəxsiyyətlər ictimai rəyin yaranmasında mühüm rol oynayırlar. Əmirəlmömininin (ə) xilafətinin belə şəxsiyyətlərin məharətli fəaliyyəti cəhətindən gözəl, çəkdikləri əzab-əziyyətlər cəhətindən isə acı hissələrindən biri onların Kufə və Bəsrəyə hərəkət etməsidir. Təlhə və Zübeyr Bəsrəni tutanda Əmirəlmöminin (ə) İmam Həsəni və bəzi səhabələri göndərdi. Onların xalqla müzakirələri, məsciddə danışdıqları söhbətlər və göstərdikləri dəlillər İslamın erkən tarixinin həyəcanlı, gözəl və məzmunlu hissələrindən biridir. Məhz buna görə Əmirəlmömininininin (ə) düşmənlərinin əsas hücumları bu şəxslərə yönəlmişdi. Ən böyük təxribatlar Malik Əjdərin, Əmmar Yasirin, Məhəmməd ibn Əbu Bəkrin əleyhinə idi. Düşmənlər əvvəldən Əmirəlmömininlə (ə) bağlı məsələlərdə imtahan vermiş, möhkəm iman və ayıqlıq göstərmiş şəxslərin hamısı əleyhinə müxtəlif ittihamlar yağdırırdı. Onlara qarşı sui-qəsd hazırlanırdı və əksəri də şəhid olurdular. Əmmar döyüşdə öldürüldü, Məhəmməd ibn Əbu Bəkr və Malik Əjdər isə şamlıların hiyləsi nəticəsində şəhid edildilər, bəziləri də qaldılar və sonradan şiddətli üsullarla .qətlə yetirildilər

Əmirəlmömininin (ə) həyatı və hakimiyyəti belə keçdi. Yekun söz kimi belə deyə bilərik ki, bu hökumət qüdrətli, eyni zamanda məzlum və qalib bir hökumət idi. İmam Əli (ə) həm öz zamanında düşmənlərini diz çökürə, həm də məzlumcasına şəhadətindən sonra tarix boyu işıqlı məşəl kimi yaşaya bildi. Təbii ki, onun bu müddətdə çəkdiyi (əziyyətlər tarixin ən kədərli hadisələrindəndir. (١٩٩٩

Realist və məntiqi baxışla yanaşsaq, bəşəriyyət İslama, Qurana, peyğəmbərlərin və son peyğəmbərin təlimlərinə borclu olduğu kimi, Fatimeyi-Zəhraya (ə) da borcludur. Bu həqiqətdir. Tarix boyu həmişə belə olub, bu gün də belədir. İslam nuru və Fatimeyi-Zəhra (ə) mənəviyyatı günbəgün daha da parlayacaq və bəşəriyyət onu daha yaxşı dərk edəcək. Bizim borcumuz özümüzü bu ailəyə mənsubluğa layiq etməkdir. Təbii ki, Peyğəmbər (s) ailəsinə, onların yaxınlarına və onların vilayəti ilə məşhur olanlara mənsub olmaq çətindir. Ziyarətdə oxuyuruq ki, biz sizi sevməklə tanınırıq. Bu məsələ .bizim üzərimizə əlavə vəzifələr qoyur

Allah-Taala mübarək Kövsər surəsində əziz Peyğəmbərə (s) bol xeyir müjdəsi verib buyurdu: Həqiqətən Biz sənə Kövsər (bol xeyir) bəxş etdik.(۱) Burada kövsər sözünün təvili Fatimeyi-Zəhradır (ə). Bu, Peyğəmbərin (s) gətirdiyi din qaynağından hər gün bütün bəşəriyyətə, bütün məxluqlara çatan xeyirlər məcmusudur. Çoxları onu gizlətməyə və inkar etməyə çalışmış, amma bacarmamışlar: Kafirlərin xoşuna .(gəlməsə də, Allah öz nurunu (dinini) tamamlayacaqdır(۲

Biz özümüzü bu nur mərkəzinə yaxınlaşdırmalıyıq. Bu mərkəzə yaxınlaşmağın nəticəsi və xüsusiyyəti işıqlanmaqdır. Biz boş sevgi ilə yox, əməllə işıqlanmalıyıq; həmin sevginin, vilayətin və imanın bizə diktə etdiyi və bizdən istədiyi əməllə. Bu əməllə bu ailədən və ona bağlı olmalıyıq. Əli (ə) evində xidmətçi olmaq asan iş deyil; Salman biz Əhli-beytdəndir(۳) sözü kiçik söz deyil. Əhli-beyt tərəfdarları və şiələri olan bizlər onların bizi özlərindən və öz yaxınlarından bilmələrini



---

Kövsər/۱ [۶۴] -۱.

Səff/۸ [۶۵] -۲.

Əl-Kafi, c. ۲, səh: ۲۵۴ [۶۶] -۳.

gözləyirik. Ürəyimiz istəyir ki, Əhli-beyt bizim haqqımızda belə fikirdə olsun, amma bu asan deyil. Bu yalnız iddia ilə əldə olunmur. Bunun üçün əməl, fədakarlıq, bənzərlik və .onlar kimi əxlaqa sahib olmaq lazımdır

Siz görün Fatimeyi-Zəhra (ə) hansı yaşında bütün bu fəzilətlərə sahib oldu, hansı ömürdə bütün bu nailiyyətləri əldə etdi? Qısa ömürdə - ۱۸, ۲۰, yaxud ۲۵ il ərzində. Bütün bu fəzilətlər əbəs əldə olunmur. Allah-Taala seçilmiş bəndə olan həzrət Zəhranı (ə) sınadı. Allah-Taalanın işləri əsaslı və hikmətlidir, bəxş etdiyini hansısa səbəbdən bəxş edir. O Özünün bu xalis bəndəsinin fədakarlığını, mərifətini, ilahi məqsədlər uğrunda (qurban getdiyini bilir və məhz buna görə Öz mərhəmətini ona şamil edir. (۱۹۹۱

Bir hədisdə deyilir ki, Fatimeyi-Zəhranın (ə) nurundan səma mələklərinin gözü qamaşır.(۱) Biz bu parlaqlıqdan necə istifadə etməliyik? Biz bu parlaq ulduzun köməyi ilə onun yüksək dərəcələrə çatdığı doğru yolu - Allaha sarı gedən bəndəlik yolunu tapmalıyıq. Allah bu insanın maddi aləmdəki imtahandan yaxşı çıxacağını bildiyinə görə onun xəmirini belə yoğurdu. Allah-Taala hətta o xəmirə xüsusi lütf göstərirsə, onun bir hissəsi imtahandan necə çıxacağını bildiyinə görədir. Əslində çoxlarının xəmiri yaxşı idi, amma imtahandan çıxa bildilərmi?! Bizim Fatimeyi-Zəhranın (ə) həyatının bu hissəsinə öz xilasımız üçün ehtiyacımız var. Şiə kitablarında göstərilən hədisə əsasən, Peyğəmbər (s) buyurdu ki, Ey Fatimə, ey mənim əzizim, mən Allah qarşısında səni heç bir şeydən ehtiyacsız edə bilmərəm;(۲) yəni öz başına çarə qılmalısan. Və o, uşaqlıqdan .qısa ömrünün sonuna qədər bu işi gördü

Siz görün o həzrət necə yaşamışdır. Ailə qurmazdan öncə çox böyük bir atası olan qız uşağı idi. Amma o zaman elə işlər gördü ki, onu Ümmü-əbiha – yəni atasının anası adlandırdılar.(۳) O zaman rəhmət və nur elçisi, yeni dünyanın banisi, qlobal və həmişəyaşar inqilabın möhtəşəm rəhbəri İslam bayrağını ucaltmaqda idi. Ona əbəs yerə atasının anası demirlər. O həzrətin atasının anası səh:۷۹

---

.Bihar əl-ənvar, c. ۴۳, səh: ۱۷۳ [۶۷] -۱

.Ət-Təəccüb, səh: ۹۴ [۶۸] -۲

.Bihar əl-ənvar, c. ۴۳, səh: ۱۶ [۶۹] -۳

adlandırılması onun xidmətinə, işinə, mücahidliyinə və fəaliyyətinə görədir. O həzrət istər Məkkədə, istər çox çətin keçən Əbu Talib dərəsində, istərsə də anası Xədicənin dünyadan köçüb Peyğəmbəri (s) yalqız qoyduğu zaman atasının yanında oldu və onun dərdini bölüşdü. Qısa müddətdə baş verən iki hadisədən - Xədicənin və Əbu Talibin vəfatından sonra Peyğəmbərin (s) qəlbi sındı. Peyğəmbər (s) az vaxt ərzində bu iki şəxsiyyəti əldən verib yalqız qaldı. Fatimeyi-Zəhra (ə) o günlərdə özünü göstərdi, kiçik əlləri ilə Peyğəmbərin (s) üzündən qəm tozunu sildi. Ümmü əbiha - atasının anası, (Peyğəmbərin (s) təsəlli verəni deməkdir. Bu künyə o günlərdə yarandı. (۱۹۹۴

Həzrət Zəhranın (ə) doğum tarixinə dair fərqli rəvayətlər vardır. Bu baxımdan, o, altı, yaxud yeddi yaşında olarkən Əbu Talib dərəsinə köç məsələsi qarşıya çıxdı. Əbu Talib dərəsi dövrü İslamın erkən çağında çox çətin bir dövr sayılır. Peyğəmbərin (s) dəvəti başlanmışdı, Məkkə xalqı, xüsusən cavanlar və qullar tədricən Peyğəmbərə (s) iman gətirirdilər. Əbu Ləhəb, Əbu Cəhl və digər zalım başçılar Peyğəmbəri (s) və onun ətrafındakıları Mədinədən ixrac etməkdən başqa yol qalmadığını düşündülər. Onlar belə də etdilər: onlarla ailəni, Peyğəmbəri (s), onun qohumlarını və Əbu Talibin özünü - Əbu Talib də böyük şəxsiyyətlərdən idi - uşaqlı-böyüklü Məkkədən çıxardılar. Bəs onlar haraya getsinlər? Təsadüfən, cənab Əbu Talibin Məkkənin təxminən bir neçə kilometrliyində yerləşən bir dərədə mülkü vardı. Oranın adı Əbu Talib dərəsi idi. Ora dağ yarığı və kiçik bir dərə idi. Məkkədə gündüzlər hava isti, gecələr isə olduqca soyuq keçirdi. Siz görün nə qədər dözülməz bir vəziyyət yaranmışdı. Onlar üç il bu dərədə yaşadılar; nə qədər aclıq çəkdilər, çətinlik gördülər, Allah

bilir. Peyğəmbərin (s) çətin dövrlərindən biri bu dövr idi. Bu dövrdə əziz Peyğəmbərin (s) vəzifəsi təkcə bir cəmiyyəti idarə etmək deyildi. O, məşəqqətə düşmüş bu insanlar .qarşısında öz hərəkətini müdafiə etməyi bacarmalı idi

Bildiyiniz kimi, vəziyyət yaxşı olanda rəhbərin ətrafına yığışan insanlar da razı qalırlar. Deyirlər Allah atasına rəhmət eləsin ki, bizi belə yaxşı vəziyyətə çıxarıb. Çətinlik görəndə isə hamı deyinir ki, biz bunu istəmirdik, o buna bais oldu. Əlbəttə, güclü imanı olanlar dayanırlar. Hər halda, bütün çətinliklər Peyğəmbərin (s) çiyninə düşürdü. Çox çətin olan bu psixoloji durumunda onun dayağı və ümidi olan cənab Əbu Talib, həmçinin Peyğəmbərə (s) ən böyük psixoloji köməyi göstərən Xədiceyi-kübra bir həftənin içində dünyadan köçdülər. Çox qəribə bir vəziyyət yarandı: Peyğəmbər (s) .tək-tənha qaldı

Mən bilmirəm siz indiyədək bir işçi qrupun başçısı olmusunuzmu və bir toplumun məsuliyyətinin nə demək olduğunu bilirsinizmi? Belə bir şəraitdə insan doğrudan da çarəsiz qalır. Bu şəraitdə Fatimeyi-Zəhranın (ə) roluna baxın. Tarixi məlumatlar arasında bu məqamları tapmaq lazımdır. Lakin təəssüf ki, belə məsələlər üçün fəsil ayırmırlar. Fatimeyi-Zəhra (ə) Peyğəmbərə (s) bir ana, müşavir və təbib kimi olub və məhz buna görə ona "Ümmü əbiha", yəni atasının anası demişlər. Bu, o zamana, yəni bu qızın altı-yeddi yaşı olan vaxta aiddir. Əlbəttə, ərəb cəmiyyətlərində və isti yerlərdə qızlar fiziki və psixoloji cəhətdən daha tez inkişaf edirlər - məsələn, bizim indiki ١٠-١٢ yaşlı qızlarımız qədər. Bu, məsuliyyət hissidir. Bu, bir gənc üçün örnək ola bilməzmi: öz ətrafına qarşı tez məsuliyyət hiss edib fəaliyyətə başlamaq, malik olduğu böyük potensialı xərcləmək, yaşı misal üçün, əllini ötmüş və təqribən qocalmış atasının qəm-kədərini bölüşmək?! Bu, bir gənc üçün dərs ola bilməzmi?! Bu, çox əhəmiyyətli (məsələdir. (١٩٩٨

Belə bir dünyada əziz Peyğəmbər (s) elə bir qız tərbiyə edir ki, əlinin Allah rəsulu .tərəfindən öpülməsinə layiq olur

Peyğəmbərin Fatimeyi-Zəhranın (ə) əlini öpməsini duyğusal səbəblə izah etmək əsla düzgün deyil. Öz qızı olduğuna və onu sevdiyinə görə əlini öpdüyünü düşünmək çox səhv və çox bəsit yanaşmadır. Məgər Allah vəhyi ilə hərəkət edən belə bir dəyərli, ədalətli və hikmətli şəxsiyyət əyilib qızının əlini öpər?! Xeyr! Burada məqsəd başqadır. Bu onu göstərir ki, bu gənc qız, dünyadan köçərkən on səkkizdən iyirmi beşə qədər - on səkkiz də deyiblər, iyirmi beş də - yaşı olan bu xanım insani paklığın zirvəsində (durmuş və qeyri-adi bir şəxs olmuşdur. Bu, İslamın qadına baxışıdır. (١٩٩١

Fatimeyi-Zəhranın (ə) mənəvi məqamı onun cihadına, inqilabına və ictimai məqamına nisbətən dəfələrlə yüksəkdir. O, bir insan, gənc bir qadın, əslində isə möhtəşəm bir varlıq, parlaq ilahi nur, saleh bəndə, üstün və seçilmiş bir insandır. Əziz Peyğəmbər (s) Əmirəlmömininə (ə) buyurdu ki, qiyamət günü sən mömin kişiləri cənnətə doğru aparacaqsan, Fatimə də mömin qadınları. O, Əlinin (ə) tayı və bərabəridir. İbadət mehrabında duranda Allahın minlərlə yaxın mələyi ona salam verir və müqəddəs Məryəmə müraciət etdikləri şəkildə deyirlər: Ey Fatimə! Həqiqətən Allah səni seçmiş, pak və bütün qadınlardan üstün etmişdir.(١) Fatimeyi-Zəhranın (ə) mənəvi məqamı .belədir

Bir qadın gənclik çağında elə mənəvi məqama nail olur ki, bəzi hədislərə əsasən, mələklər onunla danışır və həqiqətləri ona göstərirlər. Onun bir ləqəbi mühəddəsədir - yəni mələklərin danışdığı və həmsöhbət olduğu şəxs. Bu, xilqətin və dünyanın bütün qadınları qarşısında mənəvi məqam və uca zirvədir. Fatimeyi-Zəhra (ə) bu böyük zirvədə durub bütün dünya qadınlarına müraciət edir, onları bu yola səsləyir. Tarix boyu – istər qədim cahiliyyətdə, istər iyirminci əsrin cahiliyyətində qadını təhqir etməyə, aşağılamağa, onu zahiri zinətlərə və bəzəklərə vurğun kimi təqdim etməyə, ,modaya, paltara, bəzək-düzəyə, qızıl-zinət əşyalarına bağlamağa



---

.Yenə orada, səh: ٢۴ [٧٠] -١

həyatın eyş-işrətinə alışdırmağa və bu yola sövq etməyə çalışan şəxslərin məntiqi Fatimeyi-Zəhranın (ə) mənəviyyat günəşinin istiliyindən qar kimi əriyir, məhv olur. İslam dəyərli və üstün şəxsiyyət olan Fatiməni (ə) qadın nümunəsi və örnəyi kimi təqdim edir. Onun zahiri yaşayışından, cihad və mübarizə həyatından, elmi natiqliyindən, fədakarlığından, evdarlığından, analığından, mühacirətindən, bütün siyasi, hərbi və inqilabi işlərdə iştirakından və böyük kişiləri təzimə vadar edən hərtərəfli üstünlüklərindən əlavə, uca mənəvi məqamı, rükusu, səcdəsi, ibadəti, duası, münacatı, ruhani mahiyyəti, mənəvi parlaqlığı, Əmirəlmöminin (ə) və Peyğəmbərlə (s) bərabər mənəvi həyatı olmuşdur. Qadın budur. İslamın göstərdiyi qadın örnəyi budur. ((۱۹۹۰

Fatimeyi-Zəhranın (ə) həyatında diqqətəlayiq bir məqam var. Biz o həzrətin mənəvi məqamlarına toxunmaq istəmirik, bu məqamları anlayıb dərk etməyə qadir də deyilik. Həqiqətən insani mənəviyyat və bəşər təkamülü zirvəsində duran belə bəndələri yalnız Allah tanıyır, məqamlarını görür. Fatimeyi-Zəhranı (ə) Əmirəlmöminin (ə), böyük atası və məsum övladları tanıyırdılar. O dövrün və sonrakı dövrlərin insanları və bu dövrdə yaşayan bizlər onun mənəvi nurunu görə bilmərik. Parlaq mənəviyyat nuru hər kəsin gözünə görünməz, bizim yaxıngörən və zəif gözlərimiz o parlaq insaniyyət nurunu görməyə qadir deyil. Bu baxımdan Fatimeyi-Zəhranın (ə) mənəvi məqamları haqda danışmırıq. Lakin o həzrətin adi həyatında mühüm bir məqam var. Bu məqam həm əri və övladları ilə rəftarında və ailə daxilində müsəlman bir qadının, həm də Peyğəmbərin (s) vəfatından sonrakı mühüm siyasi hadisələrdə mübariz, qeyrətli və yorulmaz bir insanın vəzifələrini yerinə yetirməsidir. O, məscidə gəlib çıxış edir, mövqe bilidirir, müdafiə edir və danışır. O, sözün əsl mənasında yorulmaz və dözümlü bir mücahid, həm də eyni zamanda bir abid, qaranlıq gecələrdə namaz qılan, ibadət edən, Allah qarşısında təzim göstərən bir insandır. Bu gənc

Bu üç cəhətə birgə malik olmaq Fatimeyi-Zəhranın (s.ə) həyatının parlaq cəhətidir. O həzrət bu üç sahəni bir-birindən ayırmadı. Bəzi adamlar elə bilirlər ki, ibadət, dua və zikrlə məşğul olurlarsa, siyasi fəaliyyət göstərə bilməzlər. Bəzi adamlar elə bilirlər ki, siyasətlə məşğul olan, Allah yolunda mübarizə aparan qadın ev qadını ola, analıq və evdarlıq vəzifələrini yerinə yetirə bilməz; belə bir kişi də ev və ailə kişisi ola bilməz. Elə bilirlər bunlar bir-birinə ziddir, halbuki İslama görə bu üç xüsusiyyyətin bir-biri ilə .ziddiyyəti yoxdur və kamil bir insanın şəxsiyyətində bir-birini tamamlayırlar

.qadın qədim ilahi övliyalar kimi Allahla raz-niyaz və Allaha ibadət edir

Siyasi və ictimai mübarizə cəhətindən həzrət Zəhranın (ə) şəxsiyyəti mühüm və böyükdür. Belə ki, dünyanın bütün siyasi və inqilabçı qadınları onun qısa və dərin həyatından dərs götürə bilərlər. Bu qadın inqilab evində doğuldu, bütün uşaqlıq çağını böyük, unudulmaz və qlobal bir mübarizə halında olan atanın ağuşunda keçirdi. Bu xanım uşaq ikən Məkkə mübarizəsinin çətinliklərini daddı, Əbu Talib dərəsində yaşadı, Məkkə dövrünün çətinliyini, qorxusunu və müxtəlif acılarını duydu. Mədinəyə hicrət edəndən sonra bütün həyatı Allah yolunda cihadda keçən bir insanın həyat yoldaşı oldu. Fatimeyi-Zəhra (ə) və Əmirəlmömininin (ə) on bir ilə yaxın müştərək həyatları dövründə heç bir il, bəlkə də heç bir yarım il olmadı ki, bu ər Allah yolunda cihad etməsin, döyüşə getməsin, bu böyük və fədakar xanım da mücahid bir insanın, əsgərin və döyüş meydanının daimi sərkərdəsinin ləyaqətli həyat yoldaşı kimi vəzifələrini yerinə yetirməsin. Deməli, Fatimeyi-Zəhranın (ə) həyatı qısa olsa və təxminən iyirmi ildən artıq sürməsə də, bu yaşayış cihad, mübarizə, fəaliyyət, inqilabi iş, inqilabi dözüm, dərs, çıxış, nübüvvəti, imaməti və İslam quruluşunu müdafiə və nəhayət şəhadətdən ibarət olan geniş bir dəryadır. Bu, Fatimeyi-Zəhranın (ə) çox əzəmətli, fövqəladə, həqiqətən bənzərsiz olan və istər bu gün, istərsə də

gələcəkdə bəşəriyyətin xatirəsində parlaq və müstəsna bir nöqtə olan cihad həyatıdır. ((۱۹۹۰

Fatimeyi-Zəhra (ə) həm də böyük bir alimdir. Əllamə Məclisi deyir ki, Fatimeyi-Zəhranın (ə) Peyğəmbərin (s) vəfatından sonra Mədinə məscidində söylədiyi nitqi güclü natiqlər və böyük alimlər izah etməlidirlər; yəni bu qədər dərin məzmunludur. Fatimeyi-Zəhranın (ə) bu çıxışı üslub zərifliyi baxımından Nəhcül-bəlağənin ən gözəl və ən dərin sözləri kimidir. Fatimeyi-Zəhra (ə) Mədinə məscidində xalq qarşısında bədahətən bu nitqi söyləmiş, ən yaxşı, ən gözəl və ən güclü ifadələrlə bəlkə də bir saat .söhbət etmişdir

Bizlər bədahətən nitq söylədiyimizə görə bu sözlərin nə qədər əzəmətli olduğunu anlayırıq. ۱۸, ۲۰, uzaqbaşı ۲۴ yaşlı bir qız bütün müsibətlərinə və çətinliklərinə rəğmən, məscidə gəlir və izdiham qarşısında hicabla çıxış edir. Əlbəttə, o həzrətin yaşı dəqiq məlum deyil. Çünki doğulduğu ilə dair fikir ayrılıqları mövcuddur. Bu çıxışın bütün .sözləri tarixdə qeyd olunmuşdur

Ərəblər güclü yaddaşları ilə məşhur idilər. Bir nəfər ۸۰ beytlik bir qəsidə oxuyurdu, məclis bitəndən sonra ۱۰ nəfər onu alıb yazırdı. Dövrümüzədək gəlib çatan bu qəsidələr çox zaman belə qalmışdır. Şeirlər ictimai yerlərdə oxunur və qeyd olunurdu. Bu çıxış və hədislər də çox zaman belə qalıb; oturub yazıb, əzbərləyib və günümüzədək saxlayıblar. Boş sözlər tarixdə qalmayıb; hər söz qalmır. O qədər söz deyilib, o qədər çıxışlar edilib, o qədər fikirlər irəli sürülüb, şeirlər söylənib, amma qalmayıb və heç kəs onları yada salmır. Tarixin bu çıxışı öz ürəyində saxlaması və üstündən ۱۴۰۰ il keçəndən sonra oxuyan hər bir insanın ona pərəstiş etməsi onun (möhtəşəmliyini göstərir. Məncə bu, gənc bir qız üçün örnəkdir. (۱۹۹۸

Fatimeyi-Zəhranın (ə) həyatı hər cəhətdən fəal, çalışqan, psixoloji tərəqqi və təkamül yolunda keçmiş həyatdır. Onun gənc həyat yoldaşı daim cəbhədə və döyüşdədir, Fatimeyi-Zəhra (ə) isə bütün problemlərə rəğmən, müsəlmanların

müraciət etdiyi şəxsdir. İnsanların problemlərini həll edən Peyğəmbər (s) qızı bu şəraitdə çox başucalığı ilə ailəni idarə edir, Həsən (ə), Hüseyn (ə) və Zeynəb kimi övladlar tərbiyə edir, Əli (ə) kimi həyat yoldaşını qoruyur və Peyğəmbər (s) kimi bir atanın razılığını qazanır. Fəthlər başlayanda və qənimətlər gələndə Peyğəmbər qızı .digər qız və qadınların istədiyi dünya ləzzətlərinə və dəbdəbəyə üz tutmur

Fatimeyi-Zəhranın (ə) ibadəti nümunəvi bir ibadətdir. İslam dünyasının abid və zahidlərindən olan Həsən Bəsri Fatimeyi-Zəhra (ə) haqda deyir: “Peyğəmbərin qızı o qədər ibadət edir və mehrabda dayanırdı ki, ayaqları şişirdi”.(١) İmam Həsən Müctəba (ə) buyurur ki, bir cümə gecəsi anam səhərə qədər ibadət etdi; gecədən dan yeri sökülənə qədər ibadətlə məşğul oldu. O deyir: “Eşitdim ki, həmişə mömin kişi və qadınlar üçün, xalq üçün, İslam dünyasının ümumi məsələləri üçün dua etdi. Səhər olanda dedim ki, ey anam, özün üçün bir dua etmədin, gecədən səhərə qədər başqalarını dua etdin. Cavabda buyurdu: “Əvvəl başqaları, sonra özümüz”.(٢) Bu, yüksək ruhiyyədir. O həzrətin müxtəlif sahələrdə mübarizəsi də nümunəvidir; İslamı, imaməti, vilayəti müdafiə etməkdə, Peyğəmbəri (s) dəstəkləməkdə, İslamın ən böyük əsgəri və həyat yoldaşı olan Əmirəlmömininə (ə) baxmaqda. Əmirəlmöminin (ə) Fatimeyi-Zəhra (ə) barədə buyurub ki, bu xanım məni qəzəbləndirmədi və bir dəfə də sözümdən çıxmadı.(٣) Bütün böyüklüyünə və əzəmətinə rəğmən, Fatimeyi-Zəhra (ə) .evdə İslamın istədiyi kimi bir xanım və həyat yoldaşıdır

İbadəti, nitqi, elmi, düşüncəsi, ağlı, cihadı, mübarizəsi, bir qız kimi, bir həyat yoldaşı kimi və bir ana kimi rəftarı, yoxsullara yardımı – hər şeyi öz yerində idi. Peyğəmbər (s) yoxsul bir qocanı Əmirəlmömininin (ə) evinə göndərib deyir



---

.İbn Şəhr Aşub. Əl-Mənaqib, c. ٣, səh: ٣۴١ [٧١] -١

.Bihar əl-ənvar, c. ۴٣, səh: ٨١-٨٢ [٧٢] -٢

.Yenə orada, səh: ١٣۴ [٧٣] -٣

ki, get istəyini onlardan al. Fatimeyi-Zəhra (ə) Həsən və Hüseyni (ə) bir heyvan dərisinin üzərində yatızdırırdı, ondan övladlarının yatağı kimi istifadə edirdi. O, evdə başqa bir şeyin olmadığını görüb həmin dərini yoxsula verib deyir ki, bunu sat və pulundan istifadə et. Bu, Fatimeyi-Zəhranın (ə) hərcəhətli şəxsiyyətidir. Bu, örnəkdir. .Müsəlman qadının örnəyi budur

Müsəlman qadın elm, mənəvi və əxlaqi özünüislah uğrunda çalışmalı, hər bir növdən olan cihad və mübarizədə öncül olmalı, dünyanın bərbəzəyinə və dəyərsiz dəbdəbəyə etinasız yanaşmalı, iffəti və paklığı yüksək həddə olmalı, yad və veyil nəzərləri öz-özünə uzaqlaşdırmalı, evdə həyat yoldaşının və övladlarının aramlığına, ailənin asayişinə və həyatın dincliyinə səbəb olmalı, şəfqətli və mehriban ağuşunda, həmçinin məna və sevgi dolu sözləri ilə psixoloji cəhətdən sağlam övladlar tərbiyə etməli, komplekssiz, xoş əhval-ruhiyyəli, psixi və sinir cəhətindən sağlam insanlar yetişdirməli, cəmiyyətin kişi və qadın şəxsiyyətlərini ərsəyə gətirməlidir! Ana hər bir qurucudan mühüm və dəyərlidir. Ən böyük alim çox mürəkkəb elektron cihaz ixtira edə bilər, qitələrarası raketlər və kosmik gəmilər düzəldə bilər, amma bunların heç biri böyük insan yetişdirmək qədər əhəmiyyətli deyil. Ana insan yetişdirir. Və müsəlman (qadının örnəyi budur. (١٩٩٢

## İşarə

İmam Həsən Müctəbanın (ə) dövrü, o həzrətin Müaviyə ilə sülhü, yaxud sülh adlanan məsələ erkən çağ İslam inqilabının ümumi prosesində taleyüklü və misilsiz bir hadisə idi. Ondan sonra buna bənzər hadisə baş verməmişdir. Bu cümləni bir qədər izah etmək və sonra əsas mətləbə keçmək istəyirəm. İslam inqilabı - yəni İslam təfəkkürü və Allah-Taalanın göndərdiyi İslam adlı əmanət birinci dövrdə bir hərəkat, mübarizə və böyük inqilab prosesi kimi özünü göstərdi. Bu, Allah rəsulunun Məkkədə uyğun düşüncəni elan etdiyi, tövhid və İslam düşmənlərinin də vuruşduğu və inkişafına mane olduğu zamana aiddir. Peyğəmbər (s) mömin qüvvələrin köməyi ilə bu hərəkatı idarə etdi, Məkkədə çox ağıllı, güclü və mütərəqqi bir mübarizə başlatdı. Bu hərəkat və .mübarizə on üç il sürdü. Bu birinci mərhələ idi

On üç ildən sonra bu təfəkkür Peyğəmbərin (s) təlimləri, şüarları, idarəçiliyi, fədakarlığı və digər amillər sayəsində hakimiyyətə və bir ümmətin ictimai-siyasi quruluşuna çevrildi. Bu, Allah rəsulunun Mədinəyə hicrət etdiyi, oranı özünə mərkəz seçdiyi, orada İslam hökuməti qurduğu və İslamın hərəkatdan hökumətə çevrildiyi zamana aiddir. .Bu ikinci mərhələ idi

Bu proses əziz Peyğəmbərin (s) həyatının on ilində, ondan sonra beş xəlifə dövründə və İmam Müctəbanın (ə) təxminən altı ay sürən xilafətinə qədər davam etdi. Bu zaman İslam hökumət formasında idi, bir ictimai sistem hakim idi; yəni hökumət, ordu, siyasi, mədəni və hüquqi işlər, xalqın iqtisadi münasibətləri idarə olunur və sürətlə inkişaf edirdi. Bu proses həmin formada davam etsəydi, bütün yer üzünü əhatə edərdi. İslam .dini buna qabiliyyətli olduğunu göstərdi

İmam Həsənin (ə) dövründə müxalif cərəyan güclü inkişaf edib bir maneəyə çevrilə bildi. Bu cərəyan İmam Müctəbanın (ə) dövründə deyil, illər öncə yaranmışdı. Əgər etiqadi məsələləri kənara qoyub yalnız tarixi faktlara əsaslansaq, iddia

edə bilərik ki, o heç İslam dövründə də yaranmamışdı, Peyğəmbərin (s) hərəkatı zamanı, yəni Məkkə dövründə mövcud olan qüvvələrin davamı idi. Osmanın hakimiyyətə gəlməsi ilə xilafət Bəni-Üməyyənin əlinə keçəndən sonra görmə qabiliyyətini itirmiş Əbu Süfyan yaxın adamları ilə bir məclisdə oturmuşdu. Soruşdu ki, burada kimlər var. Cavabı eşidib hamısının özlərinki olduğunu, məclisdə yad adamın olmadığını biləndən sonra onlara müraciətlə dedi: Xilafəti top kimi bir-birinizə ötürün.(١) Yəni xilafətin başqasına keçməsinə qoymayın. Bunu sünni və şiə tarixçilər yazmışlar. Bunlar etiqadi məsələlər deyil və biz ümumiyyətlə etiqadi baxımdan danışmırıq. Mən məsələlərə bu aspektdən yanaşmağı xoşlamıram, yalnız tarixi cəhətləri deyirəm. Əbu Süfyan o zaman müsəlman idi, lakin Məkkənin fəthindən sonra, yaxud fəthinə yaxın müsəlman olmuşdu. Qürbət və zəiflik çağında deyil, İslamın qüdrətlənməsindən sonra bu dini qəbul etmişdi. Bu cərəyan İmam Müctəbanın (ə) dövründə zirvə həddinə çatdı və Müaviyə ibn Əbu Süfyanın timsalında onun qarşısına çıxdı. Bu cərəyan münaqişəyə başladı, İslam hökumətinin - yəni hakimiyyət İslamının qarşısını aldı, problemlər yaratdı və İslam hakimiyyəti prosesinin inkişafına praktik .maneəyə çevrildi

İmam Həsənin (ə) sülhünə dair dəfələrlə demişik, kitablarda da yazmışlar ki, hətta İmam Əlinin (ə) özü də İmam Həsən Müctəbanın (ə) yerində olsaydı, həmin şəraitdə başqa bir iş görə bilməzdi. Heç kəs deyə bilməz ki, İmam Həsənin (ə) filan işi şübhəlidir. Xeyr! O həzrətin işləri güclü məntiqi əsaslara tamamilə uyğundur. Allah rəsulunun ailəsində ən cəsur görünən kimdir? Dini qorumaq üçün düşmən qarşısında ən qeyrətli görünəni kim olmuşdur? Hüseyn ibn Əli (ə). O həzrət bu sülhün bağlanmasında İmam Həsənlə (ə) ortaq idi. Sülhü yalnız İmam Həsən (ə) bağlamadı, o və İmam Hüseyn (ə) ,birgə bu işi gördülər. Lakin İmam Həsən (ə) öndə idi



---

.Təbrisi. Əl-İhticac, c. ١, səh: ٢٣۴ [٧۴] -١

İmam Hüseyn (ə) isə onun arxasında. İmam Hüseyn (ə) qardaşının sülh ideyasının tərəfdarlarından idi. Xüsusi bir məclisdə dəliqanlı və cəsur səhabələrdən biri İmam Həsənə (ə) etiraz edəndə İmam Hüseyn (ə) ona qarşı çıxdı.(١) Heç kəs deyə bilməz ki, İmam Hüseyn (ə) İmam Həsənin (ə) yerində olsaydı, bu sülh baş tutmazdı. Xeyr! Bu sülh imzalananda İmam Hüseyn (ə) İmam Həsənin (ə) yanında idi. Əgər İmam Hüseyn (ə) tək olsaydı da, həmin şəraitdə eyni işi görər və sülh müqaviləsini imzalayardı.

### Tarixin ən möhtəşəm və qəhrəman güzəşti

Sülhə səbəb olan amillər vardı və onlar bu sülhü qaçılmaz edirdi. O zaman şəhadət də imkansız idi. Mərhum Şeyx Razi Ali-Yasin mənim ١٩۶٩-cu ildə tərcümə etdiyim və çap olunmuş Həsən sülhü kitabında sübut edir ki, ümumiyyətlə şəhadətin yeri deyildi. Hər bir öldürülmək şəhadət deyil, bunun bəzi şərtləri var. Həmin şərtlər o zaman yox idi və İmam Həsən (ə) öldürülsəydi, şəhid olmayacaqdı. O şəraitdə kiminsə yaxşı bir hərəkət edib öldürülməsi, sonra isə adının intihar yox, şəhadət qoyulması imkansız idi.

Sülh barədə müxtəlif cəhətlərdən söhbət etmişik. İndi söhbət bundan gedir ki, İmam Həsən Müctəbanın (ə) sülhündən sonra İslamın və İslam hakimiyyətinin adı xilafət, mahiyyəti isə şahlıq olan çirkin yola daxil olmaması üçün ağıllı və sayıq tədbirlər görüldü. Bu, İmam Həsən Müctəbanın (ə) hünəri idi. İmam Həsən Müctəba (ə) Məkkədən başlayaraq İslam hökuməti ilə nəticələnmiş, Əmirəlmömininin (ə) və onun dövrünə çatmış ortodoks İslam cərəyanının hakimiyyət formasında deyil, başqa bir məcrada, ən azı yenidən hərəkat formasında davam etməsini təmin etdi. Çünki hakimiyyət formasında davam etməsi artıq mümkün deyildi. Bu, İslamın üçüncü mərhələsidir. İslam bu mərhələdə yenidən hərəkata çevrildi; yəni həqiqi, ortodoks, zülmlə barışmayan, təslimçiliyi



---

١- [٧۵] İbn Əbilhədid. Şərh Nəhcül-bəlağə, c. ١۶, səh: ١۵.

qəbul etməyən, təhrifdən və müəyyən istəklərə alət olmaqdan uzaq olan İslam hərəkat formasında olsa belə, qalsın, yaşasın. Yəni bir mərhələni arxada qoyub hakimiyyətə gəlmiş İslam-inqilab təfəkkürü İmam Həsənin (ə) dövründə geriyə qayıdıb yenidən bir hərəkat oldu. Əlbəttə, bu dövrdə bu hərəkatın işi Peyğəmbərin (s) zamanından dəfələrlə ağır idi. Çünki şüarlar əyinlərinə din paltarı geyinən, əslində isə dinsiz olanlar tərəfindən səsləndirilirdi. Hidayətçi imamların problemi bu idi. Mən imamların həyatından və hədislərindən bu qənaətə gəlmişəm ki, onlar İmam Həsənin (ə) sülhündən sonra daim bu hərəkatı yenidən Əli (ə) hökumətinə və İslam hakimiyyətinə çevirməyə çalışmışlar. Bu barədə rəvayətlər də vardır. Ola bilsin kimsə bununla razılaşmasın və ayrı fikirdə olsun, amma mənim qənaətim budur. İmamlar istəyirdilər ki, hərəkat yenidən hakimiyyətə və ortodoks İslam cərəyanına çevrilsin, .nəfsə bulaşmayan İslam cərəyanı iş başına gəlsin. Lakin bu çətin iş idi

Hərəkatın ikinci dövründə - yəni Süfyani, Mərvani və Abbasi sülalələrinin xilafəti çağında xalqın ehtiyacı olan ən mühüm məsələ bu idi ki, müxtəlif sözlər arasında əsl Quran İslamının əlamətlərini görsünlər, tanısınlar və səhv etməsinlər. Dinlər əbəs yerə ağıl və təfəkkür üzərində bu qədər təkid göstərməyiblər. Qurani-kərimdə insanların təfəkkürü və düşünməsi üzərində əbəs yerə bu qədər təkid göstərilməmişdir; özü də dinin ən əsas mövzusu olan tövhid barədə. Tövhid yalnız bundan ibarət deyil ki, deyək Allah var, birdir və iki deyil. Bu, tövhidin formasıdır, məzmunu isə Allah övliyalarının qərq olduğu sonsuz okeandır. Tövhid olduqca geniş bir vadidir. Amma bu geniş vadidə mömin, müsəlman və təkallahlılardan ağıl və təfəkkürlə hərəkət etmələrini istəmişlər. İnsanı ağıl və təfəkkür inkişaf etdirə bilər. Əlbəttə, ağıl müxtəlif mərhələlərdə vəhy nurundan və Allah övliyalarının təlimlərindən qidalanır, lakin hər halda, inkişaf edən .odur. Ağılsız heç bir yerə çatmaq olmaz

Yeddinci əsrə qədər Abbasi xilafəti davam edirdi. Abbasi xilafətinin devrilməsindən sonra müəyyən yerlərdə xilafət adlı hakimiyyətlər quruldu; məsələn, Misirdə Məmalik dövründə, Osmanlı məmləkətində və digər yerlərdə. Abbasi xilafətinin sonuna qədər müsəlman xalqın bu məsələni bilməyə ehtiyacı vardı: ağlı meyar seçib görsünlər ki, reallıq İslamın, Quranın, ilahi kitabın və qəti hədislərin hakimiyyətə dair fikri ilə .uyğundur, yoxsa yox. Bu çox mühüm məsələdir

Mərvani, Süfyani və Abbasi xilafətləri İslam dəyərlərinin öz həqiqi məzmunundan uzaqlaşdığı dövrdür. Formalar qaldı, məzmunlar isə cahil və şeytani məzmunlara çevrildi. Ağıllı, abid, mömin, azad, yanlış düşüncələrdən uzaq, Allah qarşısında kiçilən və təkəbbürlülər qarşısında təkəbbürlü insanlar yetişdirən bir sistem – bunun ən yaxşı nümunəsi Peyğəmbər (s) dövründə İslam idarə üsulu idi – dünyagir, nəfsə və ehtiraslara uyan, yaltaq, mənəviyyatsız, şəxsiyyətsiz, fasiq və azğın insanlar yetişdirən sistemə çevrildi. Təəssüf ki, bütün Əməvi və Abbasi xilafəti dövründə belə idi. Tarix kitablarında bu haqda bəzi məsələlərə toxunulmuşdur; onları söyləsək, çox çəkər. Bu, Müaviyənin dövründən başlandı. Tarixçilər Müaviyəni məşhurlaşdıraraq yazmışlar ki, o, yumşaq, dözümlü insan idi, müxaliflərinə danışmaq və istədikləri sözü söyləmək imkanı verirdi. Müəyyən dövrdə və əvvəllərdə bəlkə də belə bir şey olmuşdur, lakin bunun kənarında onun şəxsiyyətinin digər cəhətlərindən az yazmışlar. Az yazmışlar ki, o, insanları, başçıları, görkəmli və tanınmış şəxsiyyətləri öz əqidə və imanlarından dönməyə, hətta haqqa qarşı mübarizə aparmağa necə vadar edirdi. Bunları çox yazmamışlar. Amma yenə də tarixdə qeyd olunmuşdur və bizim indi bu .barədə bildiklərimizi bəzi tarixçilər yazmışlar

Həmin sistemdə yetişənlər xəlifənin istəyinin əksinə olan heç bir sözü dillərinə gətirmirdilər. Bu necə cəmiyyətdir?! Bu necə insandır?! Fəsadları aradan qaldırmaq və ilahi cəmiyyət səh:٩٢

qurmaq istəyən insanlarda bunun harası ilahi və islami iradədir?! Məgər belə bir şey !?mümkündür

Cahiz, ya da Əbülfərəc İsfahani yazır ki, Müaviyə xəlifə olduğu dövrdə bir dəfə atla Məkkəyə gedirdi. Dövrün tanınmış şəxslərindən biri də onun yanında idi. Müaviyənin başı onunla söhbətə qarışmışdı. Onların arxasınca atlılar gəlirdilər. Müaviyə mənsub olduğu Əməvi qəbiləsinin cahiliyyət dövründəki üstünlüklərindən danışıb deyirdi ki, o zaman atam Əbu Süfyan elə etdi, belə etdi və sair. Bu zaman yolda uşaqlar oynayır və daş atırdılar. Bu arada bir daş Müaviyənin yanındakı adamın alnına dəydi və onu qanatdı. O bir söz demədi və Müaviyənin sözünü kəsmədi. Qan onun üzünə və saqqalına axdı. Başı söhbətə qarışmış Müaviyə birdən bu kişiyə sarı çevrildi və üzünün qanadığını görüb dedi ki, alnından qan axır. O adam Müaviyəyə dedi ki, nə, qan, mənim üzümdən?! Guya diqqəti o qədər Müaviyədə olub ki, bu daşın dəyməsini, alnının yaralanmasını və qanın axmasını bilməyib. Müaviyə dedi ki, maraqlıdır, alnına daş dəyib, amma sən anlamamısan? Dedi ki, yox, xəbərim olmayıb. Əlini vurub dedi ki, hə, doğrudan da qandır. Sonra Müaviyənin canına, yaxud müqəddəslərə and içdi ki, söhbətin şirinliyindən qanın axdığını anlamayıb. Müaviyə soruşdu ki, beytülmaldan bəxşiş payın nə qədərdir? Dedi ki, filan qədər. Müaviyə dedi ki, sənə qarşı haqsızlıq .edirlər, bunu üç dəfə artırsınlar. Müaviyə rejiminə hakim ənənə bu idi

O dövrdə kim başçılara və xəlifələrə yaltaqlanırdısa, yuxarı başa keçirdi, işlər ləyaqətə görə bölünmürdü. Ümumiyyətlə ərəblər əsil-nəsəbə çox əhəmiyyət verirlər; filankəs filan ailədəndir, ata-babaları filanlkəslərdir və s. Bunlar isə heç əsil-nəsəbə də fikir vermirdilər. Əbdülməlikin və onun bəzi oğullarının dövründə Yusif ibn Ömər Səqəfi adlı birisi İraqda uzun müddət hakim oldu, illərlə valilik etdi. Bu adam kompleksli və bədbəxt bir insan idi, alçaqboylu, cansız biri idi və bu onda kompleks yaratmışdı. Özünə paltar tikdirmək üçün dərziyə parça verəndə soruşurdu ki, bu parça mənə bəs

edərmi? Dərzi parçaya baxıb, bu parça sizin ölçünüz qədərdir, hətta artıq da qalar - desəydi, tez parçanı alır və dərzini cəzalandırırdı. Dərzilər bunu anlamışdılar. Buna görə də dərzilərə parça verib uyğun sualı ünvanlayanda baxıb deyirdilər ki, yox, bu parça sizə yetməz, amma mən çalışıb birtəhər sizin əyninizə çıxararam. O, dərzinin yalan söylədiyini bilsə də, bundan xoşu gəlirdi. Bu qədər axmaq idi. Zeyd ibn Əlini (ə) Kufədə şəhadətə yetirən bu şəxsdir. Belə bir şəxs illərlə xalqın malına və namusuna hakim oldu. Nə düz-əməlli əsil-nəsəbi vardı, nə savadı, nə də dərrakəsi, amma hakimiyyətin zirvəsinə sadiq olduğuna görə bu vəzifəyə təyin olunmuşdu. Bunlar bir .quruluş üçün ən böyük təhdidlərdir

Bu proses beləcə davam etdi. Bunun kənarında antidəyər hakim cərəyanla heç vaxt razılaşmayan əsl müsəlmanlıq, dəyər İslamı və Quran İslamı da davam etdi. Onun real nümunələri hidayətçi imamlar və onların yanında olan bir çox müsəlmanlar idilər. İmam Həsən Müctəbanın (ə) sayəsində İslam hərəkatının bu dəyər cərəyanı İslamı qorudu. İmam Müctəba (ə) bu sülhü imzalamasaydı, həmin dəyər və hərəkat İslamı qalmaz, məhv olardı. Çünki Müaviyə hər halda hakim olacaqdı. Vəziyyətə görə, İmam Həsən Müctəbanın (ə) qalib gəlməsi mümkün deyildi. Bütün amillər bunun əleyhinə idi. Həm də təbliğat imkanlarına malik olduğuna görə Müaviyənin qələbəsi qaçılmaz idi. Onu yaxşı müsəlman kimi göstərmək mümkün idi. İmam Həsən (ə) sülh etməsəydi, Peyğəmbər (s) ailəsinin bütün dayaqları dağılardı, İslamın əsl dəyər sistemini qoruyacaq bir kəs qalmazdı, hər şey tamamilə məhv olardı, İslamın adı unudulardı və Aşuraya növbə də çatmazdı. İmam Müctəba (ə) Müaviyə ilə döyüşü davam etdirsəydi və bu, Peyğəmbər (s) ailəsinin şəhadəti ilə nəticələnsəydi, İmam Hüseyn (ə) də bu hadisədə öldürülərdi, dəyərli səhabələr də, hücrlər də. Hamı məhv edilərdi, fürsətlərdən istifadə edib İslamı özünün dəyər formasında qoruyacaq heç kim qalmazdı. Əsl İslamın yaşamasında İmam Müctəbanın (ə) böyük əməyi olmuşdur. ((١٩٩٠

Unutmaq lazım deyil ki, sülh məcburiyyətdən yarandı, amma hər halda imzalandı. Əslində isə İmam Həsən (ə) bunu sevmirdi. O öz əməli ilə Müaviyənin hakimiyyətinin təməlini zəiflətdi. Bu sülhün özü və İmam Həsənin (ə) şəraiti ilahi bir hiylə idi: Onlar hiyləyə əl atdılar, Allah da onların hiyləsinə qarşılıq verdi(۱). Əgər İmam Həsən (ə) vuruşsaydı, böyük ehtimalla bu döyüşdə Müaviyənin casusları tərəfindən satın alınan səhabələrinin əli ilə öldürüləcəkdi. Müaviyə də deyəcəkdi ki, mən öldürmədim, öz səhabələri öldürdülər. Sonra ona matəm də saxlayacaq və Əmirəlmömininin (ə) səhabələrini tar-mar edəcəkdi. Bundan sonra daha şiəlik adlı bir şey qalmayacaqdı ki, iyirmi ildən sonra Kufədə baş qaldırıb İmam Hüseyni (ə) oraya dəvət etsinlər. Ümumiyyətlə bir şey qalmazdı. İmam Həsən (ə) Şiənin özülünü qorudu ki, ۲۰-۲۵ ildən (sonra hakimiyyət Əhli-beytə qayıtsın. (۲۰۰۰

İmam Həsən (ə) Müaviyə ilə sülh müqaviləsini imzalayandan sonra nadan və məlumatsız insanlar müxtəlif formalarda onu qınadılar. Bəzən onu möminləri xar edən(۲) adlandırır və deyirdilər ki, siz öz sülhünüzlə Müaviyəyə qarşı vuruşan cəsur və fədakar mömintləri xar və təslim etdiniz. Bəzən də nisbətən hörmətli və mərifətli sözlər işlədirdilər, məzmunsa eyni idi. İmam Həsən (ə) bu etiraz və qınaqlar qarşısında bəlkə də bütün cümlələrindən səlis və güclü olan bir cümlə buyurdu. Buyurdu ki, nə bilirsən, bəlkə bu sizin üçün bir sınaq və Müaviyə üçün müəyyən zamana qədər möhlətdir.(۳) .Bu cümlə Quran ayəsindən iqtibas olunmuşdur

Bu cümlə aydın şəkildə göstərir ki, İmam Həsən (ə) gələcək haqda düşünürdü və o gələcək İmam Həsənə (ə) görə məqbul olmayan haqsız hakimiyyətin kənarlaşmasından və özünün nəzərdə tutduğu hökumətin iş başına gəlməsindən başqa bir şey ola bilməzdi. Ona görə bunlara deyir ki, siz işin



---

.Ali-İmran/۵۴ [۷۶] -۱

.Tühəf əl-üqul, səh: ۳۰۸ [۷۷] -۲

.Bihar əl-ənvar, c. ۴۴, səh: ۵۶ [۷۸] -۳

.fəlsəfəsindən xəbərsizsiniz, nə bilirsiniz, bəlkə bu işdə bir məsləhət vardır

Sülhün əvvəlində Şiə qruplarının başçılarından ikisi – Museyib ibn Nəcəbə və Süleyman ibn Sürəd bir dəstə müsəlmanla İmam Müctəbanın (ə) yanına gəlib dedilər ki, bizim çoxlu qüvvəmiz var, Xorasandan, İraqdan və digər yerlərdən olan döyüşçüləri sizin ixtiyarınızda qoyuruq və Müaviyəni Şama qədər təqib etməyə hazırıq. İmam Həsən (ə) bunları təklikdə görüşə çağırdı, onlarla bir qədər danışdı. Onlar bayıra çıxandan sonra .sakitləşərək döyüşü buraxdılar və yoldaşlarına da aydın bir cavab vermədilər

Müasir Misir alimi) Taha Hüseyn iddia edir ki, bu görüş əslində Şiə mübarizələrinin) əsas təməlini qoydu. Demək istəyir ki, İmam Həsən (ə) bunlarla oturub məsləhətləşdi .və həmin görüşdə böyük Şiə təşkilatını yaratdılar

Buna əsasən, İmam Həsənin (ə) həyatında və sözlərində bu məsələ aydın görünür. Baxmayaraq ki, o dövrdə belə bir qiyama şərait yox idi; xalqın yetkinliyi az, düşmənin təbliğat və maliyyə imkanları isə olduqca çox idi. İmam Həsən (ə) düşmənin istifadə etdiyi üsullardan istifadə edə bilməzdi. Onun düşmən qədər imkanı yox idi və çoxlu (pullar verib qeyri-sağlam insanları ətrafına toplaya bilmirdi. (İslamın keşikçisi, say: ۶

Həzrət Sadiqdən (ə) nəql olunan bir hədisdə deyilir ki, ilahi təqdirə əsasən, yetmişinci ildə - yəni Əmirəlmömininin (ə) şəhadətindən otuz və İmam Hüseynin (ə) şəhadətindən on il sonra hakimiyyət Əhli-beytə (ə) qayıdacaqdı.(۱) Lakin belə böyük nəticə nə zaman hasil olar? Xalq öz iradə və qərarı ilə buna hazırlıq gördükdə. Çünki Allah-Taalanın heç kimlə qohumluğu yoxdur. Xalqın üzərinə düşən iş görülmədi. İmam Həsən (ə) və İmam Hüseyn (ə) öz üzərlərinə düşəni yerinə yetirdilər, digər aparıcı şəxslərin – Abdullah ibn Cəfərin, Abdullah ibn Abbasın və digərlərinin üzərinə düşən iş isə



---

Əl-Kafi", c. ۱, səh. ۳۶۸[۷۹] -۱

görülmədi. Hətta sonradan Kərbəlaya gəlib İmam Hüseynlə (ə) birgə vuruşanlar da cənab Müslimin zamanında üzərlərinə düşən işi yerinə yetirmədilər, səhlənkarlıq etdilər. Belə olmasaydı, Müslim bəlli aqibətlə üzləşməzdi. Orada məsələni bitirməli .idilər, amma bitirmədilər və bu işlər Kərbəla hadisəsinə səbəb oldu

İmam Sadiq (ə) sonra buyurur ki, İmam Hüseyn (ə) şəhid olanda Allah-Taalanın insanlara qəzəbi artdı və hakimiyyəti ۱۴۰-cı ilə qədər təxirə saldı.(۱) Yəni yetmiş il də gecikdi. Həmin zaman Bəni-Abbas hakimiyyət başında idi. Bəlli olur ki, İmam Həsənin (ə) sülhü böyük bir iş üçün hazırlıq idi və imamlar bu məqsədi tərk etməmişdilər. Vilayət və hökumət məsələsi məgər kiçik məsələ idi?! Dinin əsası və mərkəzi bu idi, (lakin daha bu şərait yaranmadı. (۲۰۰۰

Bu sülh haqqında çox sözlər deyilmişdir. Mən bu gün İmam Həsənin (ə) sülhünə yeni bir yöndən yanaşmaq istəyirəm. Bu hadisə çox həssas tarixi bir dönəmin başlanğıcı olduğuna görə İslam tarixinin sıradan bir siyasi hadisəsi deyil, daha böyük əhəmiyyətə malikdir. İslam tarixində - Peyğəmbərin (s) dövründə, Peyğəmbərdən (s) sonra, Əmirəlmömininin (ə), imamların dövründə, Bəni-Üməyyə və Bəni-Abbas xilafətləri zamanı çoxlu hadisələr baş vermişdir. İslam tarixi müxtəlif hadisələrlə doludur. Amma İmam Həsənin (ə) sülhü kimi bütün İslam tarixi üçün təyinedici olan hadisələr azdır. Mən İslam tarixində və ümumi İslam prosesində uzun əsrlər belə təyinedici təsiri olan yalnız bir-iki başqa hadisə tanıyıram. Bu hadisə bu baxımdan böyük əhəmiyyətə .malikdir

Bu hadisə İslam xilafətinin şahlığa çevrilməsindən ibarətdir. Diqqət yetirsək, bu çox məzmunlu və dərin cümlədir. Xilafət bir növ üsul-idarədir, şahlıq isə başqa növ. Bunların bir-biri ilə fərqləri bir-iki deyil. Bunlar müsəlmanlara hökmranlıqda, ölkənin və -İslam cəmiyyətinin idarəsində bir



---

.Yenə orada [۸۰] -۱

birindən tam fərqli sistemlərdir. Bu hadisədə İslam tarixinin və İslam həyatının böyük qatarı istiqamətini dəyişdirdi. Bəzən yoldəyişən məmur şimala doğru gedən qatarın istiqamətini ۱۸۰ dərəcə dəyişdirib cənuba sarı istiqamətləndirir. Təbii ki, bu həmin anda hiss olunmur, sonra geriyə baxanda müşahidə olunur. Mən bu hadisəni belə .dəyərləndirirəm

İmam Həsənin (ə) sülhündən sonra bir cərəyan öz yerini başqa bir cərəyana verdi, hakimiyyət bir cinahdan başqa bir cinaha keçdi. Bu iki cinahın fərqləri nədən ibarət idi? Yerlərini dəyişdirən bu iki cərəyan hansı xüsusiyyətlərə malik idilər? Bu birinci məsələdir. İkinci məsələ budur ki, hakimiyyəti ələ keçirən batil qüvvələrin hakimiyyətə gəlmək üsulları hansılar idi? Üçüncü məsələ budur ki, hakimiyyəti əldən verən haqq qüvvələrinin, yəni İmam Həsən (ə) cinahının batil cinah qarşısında müqavimət üsulları hansılar idi? O hansı üsul və metodlardan istifadə edirdi? Dördüncüsü məğlubiyyətin təhlilidir. Haqq cinahı nə üçün məğlub oldu? Bunu necə təhlil etmək olar? Beşincisi qalib qrupun məğlub qrupla rəftarına aiddir. Çox ibarətamiz məsələlərdən biri budur. Altıncısı məğlub qrupun qalib qrup qarşısında rəftarı necə idi? Onlar hansı siyasəti və .strategiyanı seçdilər və bunun nəticəsi nə oldu? Yeddinci isə aqibət və sonucdur

İki cinahın səciyyələrinə gəlincə, onların hər birinin çoxlu xüsusiyyətləri vardı. Bir-bir saysam, çox uzanar; mən xülasə etmişəm: İmam Həsənin (ə) haqq cinahı birinciliyi dinə verirdi, onun üçün əsas məsələ din idi. Yəni din həm xalqın imanında, etiqadında və əməlində qalsın, xalq imanda və əməldə dinə etiqadlı və sadiq olsun, həm də din cəmiyyətin idarəsində meyar seçilsin. Onlar üçün əsas məsələ cəmiyyətin din hakimiyyəti altında idarə olunması və İslam quruluşunun yaranması idi, hakimiyyətdə olmaq ikinci, üçüncü və dördüncü dərəcəli məsələ idi. Əsas məsələ bu idi ki, quruluş və cəmiyyət dini qanunlarla idarə olunsun, insanların qəlbində iman yaşasın və güclənsin. Birinci cinahın əsas səciyyəsi bu idi. İkinci cinah üçün birinci dərəcəli məsələ isə nəyin

bahasına olursa-olsun hakimiyyəti ələ keçirmək idi. İkinci cinaha hakim siyasət bundan ibarət idi. Onlar üçün əsas məsələ nəyin bahasına və hansı yolla olursa-olsun .hakimiyyəti ələ keçirmək və onu saxlamaq idi

Bu, dünya siyasətçilərinin də adətən idtifadə etdikləri üsuldur. Onlar üçün dəyər və prinsiplər birinci dərəcəli əhəmiyyət kəsb etmir. Nəzərdə tutduqları prinsipləri qoruya bilsələr, qoruyurlar, bacarmasalar, kənara qoyurlar. Onlar üçün əsas məsələ hakimiyyəti saxlamaqdır. Önəmli olan budur. Bu çox həssas və mühüm meyardır. Hər iki cinahın dinin zahiri məsələlərinə əməl etməsi mümkündür. Necə ki, Əmirəlmömininlə (ə) Müaviyə arasındakı döyüşdə belə idi. Siffeyn döyüşündə imamın qoşununun bir hissəsində çaşqınlıq yarandı. Bəzi adamların beyinlərində bir şübhə oyanır, özləri həll edə bilmir, sanballı bir şəxsə də müraciət etmirlər, sonra həmin şübhəni yaymağa və öz ətraflarında yanlış düşünən bir çevrə yaratmağa başlayırlar. Şübhəyə düşmüş belə adamların bir neçəsi dedi ki, biz nə üçün bir-birimizlə vuruşmalıyıq; onlar da namaz qılırlar, biz də; onlar da Quran oxuyurlar, biz də; onlar da Peyğəmbərin (s) adını çəkirlər, biz də. Beləliklə onlarda döyüşə qarşı tərəddüd yarandı. Əmmar Yasir İslamın erkən tarixində ayıqlıq baxımından xüsusi adamlardandır. O, həmin gün çox şübhəli və zərif məsələləri təhlil edir, insanları maarifləndirirdi. İslam tarixində Əmmar Yasirin ampluası budur. Biz Malik Əjdəri xəncəri və şücaəti ilə tanıyırıqsa, Əmmar Yasiri də sözü, düşüncəsi, dəqiq baxışı və tarixdə çox təsirli maarifçiliyi ilə tanımalıyıq. Həzrət Əlinin (ə) dövründə Əmmar Yasirin olmadığı, iştirak etmədiyi şübhəli yerlər azdır. Bu şəxsiyyət bu baxımdan möhtəşəm rol .oynamışdır

Əmmar Yasir bəzi adamlarda şübhə oyandığından xəbərdar olan kimi özünü çatdırıb həqiqətləri bəyan etdi. Onlara başa saldı ki, məsələ yalnız zahiri işlərdən, onun da, sənin də namaz qılmandan ibarət deyil. O, Allaha and içib dedi ki, mən başqa bir döyüşdə də bu iki bayrağı bir-birinin qarşısında görmüşəm. Əmirəlmömininin (ə) bu gün ucaltdığı bu bayraq səh:٩٩

Bədr döyüşündə bu gün Müaviyənin ucaltdığı bayrağın qarşısında ucalmışdı. Bədr döyüşündə də bu iki bayraq – Bəni-Haşim və Bəni-Üməyyə bayraqları bir-birinə qarşı dayanmışdı. Bu bayrağın altında əziz Peyğəmbər (s) və Əmirəlmöminin vardı, o bayrağın altında isə Müaviyə və atası. Bunların ixtilafları köklü ixtilafdır, zahiri .məsələlərə baxmayın. O beləliklə bu insanları şübhədən çıxarırdı

Bəzən hakimiyyətə birinci dərəcəli önəm verən bu cinah İslamın zahiri məsələlərinə də riayət edir. Bu dəlil deyil. Məsələnin mahiyyətinə baxıb diqqətlə ayırd etmək lazımdır ki, hansı cinah haraya uyğundur. Bu birinci məsələ. Yəni bu iki cinahın səciyyəsi budur: bir tərəfdə hakimiyyətə, bir tərəfdə isə prinsiplərə, dəyərlərə, İslam əsaslarına və İslamın təməl təfəkkürlərinə rəğbət vardır; yəni İslam dəyərlərini qəbul etmək, onlar üçün çalışmaq, mübarizə aparmaq. Bir tərəfdə müsbət fundamentalizm və prinsipial dəyərləri qorumaq var, bir tərəfdə isə hakimiyyətə gəlmək, nəyin bahasına olursa-.olsun hakimiyyəti ələ keçirmək. Bu birinci məsələ

Batil cinahın hansı metodlardan istifadə etməsi də çox diqqətəlayiq məsələdir. Ümumiyyətlə, batil metodlar bir neçə amilin sintezidir. Yəni Müaviyənin hakimiyyəti qorumağa və gücləndirməyə dair planı bir neçə hissədən təşkil olunmuşdu. Bu hissələrin hər birinin müəyyən funksiyası vardı. Bu amillərin biri güc işlətməkdir. Bəzi yerlərdə çox zorakı vasitələrdən istifadə edilir. Şər qüvvələrin ən effektiv üsullarından biri puldur. Başqa bir amil təbliğat, dördüncüsü siyasətcillik, siyasi loyallıqdır. .Müaviyənin metodları bunlar idi

Müaviyənin şiddət və zorakılığı bəzən elə bir həddə çatır ki, Peyğəmbər (s) səhabəsi olan Hücr ibn Ədini də qətlə yetirir. Bu ona baha başa gəlir, amma öldürür. Rüşeyd Həcərini təqib edir və nəhayət öldürür. Atasının kim olduğu bilinməyən, zalım, vəzifəpərəst və qəddar bir adam olan Ziyadı Şiə və vilayət təfəkkürünün mərkəzi olan Kufəyə vali

təyin edir və ona istədiyi işi görməyə icazə verir. Tarixçilər yazmışlar ki, o ən xırda gümanla insanları tutub zindanlara salır, işgəncə verir, Peyğəmbər (s) ailəsi və məğlub cinahla əməkdaşlıqda ittiham olunan hər bir kəsi öldürür, məhv edirdi.(۱) Şiəliyin və Peyğəmbər (s) ailəsinin hakimiyyətinin paytaxtı olan Kufə və İraqda vəziyyət belə idi. .Müaviyə bəzən belə şiddət göstərirdi

Bəzən də bir qarı Müaviyəni söyməyə, pisləməyə və cinayətlərindən danışmağa başlayır. Müaviyə isə ona hörmət və sevgi göstərir, heç bir söz demir. Görmə qabiliyyətini itirmiş Ədi ibn Hatəm Müaviyənin yanına gəlir. Müaviyə deyir ki, Ədi, Əli (ə) səninlə insaflı davranmadı. Sən iki övladını Əlinin (ə) mənimlə döyüşlərində əldən verdin, amma o özünün iki övladını - Həsən və Hüseyni (ə) qoruyub saxladı. Ədi ibn Hatəm ağlayıb dedi ki, Müaviyə, mən Əli (ə) ilə insaflı rəftar etmədim. Əli (ə) şəhid olub Allaha qovuşdu, mən isə hələ sağam.(۲) Bəzən Müaviyənin iştirak etdiyi məclislərdə Əhli-beytə bağlı olanlardan kimsə Əliyə (ə) qarşı ən kiçik təhqir eşidib şücaət və qüdrətlə açıq şəkildə Müaviyəyə və onun tərəfdarlarına hücum edir, Müaviyə isə gülüb mehribanlıq nümayiş etdirir, hətta bəzən ağlayır və deyirdi ki, doğrudur. Sizin üçün inanılmaz görünə bilər, amma bu həqiqətdir. Təbliğat belədir. Təbliğat tarix boyu batilin istifadə etdiyi ən zəhərli və ən təhlükəli vasitələrdən olmuşdur. Haqq cinahı heç zaman batil cinahı kimi təbliğatdan istifadə edə bilməz. Çünki təbliğatın tam şəkildə beyinləri dəyişməsi üçün aktyorluğa, yalan və hiyləyə ehtiyacı var. Haqq cinahı yalan və hiylə tərəfdarı deyil, batil cinah üçün isə heç bir məhdudiyyət yoxdur. Əhəmiyyətli olan budur ki, bir məsələ xalqın gözündə ayrı cür görünsün. Bunun üçün bütün .vasitələrdən istifadə edirlər və etdilər



---

.Bihar əl-ənvar, c. ۴۴, səh: ۲۱۴ [۸۱] -۱

.Əd-Dərəcat ər-Rəfiə, səh: ۳۶۰ [۸۲] -۲

Bunu dəfələrlə eşitmisiniz: Əmirəlmöminin (ə) mehrabda şəhid ediləndə Şam əhalisi təəccübləndi ki, Əli (ə) mehrabda nə edirmiş? Mehrab namaz qılanların yeridir. Bəzi adamlar buna inanmırlar, amma bu həqiqətdir. Müaviyənin və ondan öncə böyük qardaşı Yezid ibn Əbu Süfyanın Şamda vali olduğu illərdə elə təbliğat aparmışdılar ki, bundan ayrısını düşünə bilməzdilər. Bəni-Üməyyə və Müaviyənin xeyrinə və Peyğəmbər (s) ailəsinin əleyhinə təbliğat aparmışdılar. Bu həqiqətdir ki, hicrətin ١٠٠-cü ilinə, şəhadətindən təxminən ٥٠ il sonraya qədər İslam dünyasında minbərlər üzərində İmam Əlini (ə) lənətləmişlər. Buna görə deyirəm ki, İslam dünyasında lənət məsələsi Müaviyənin ənənəsi və əxlaqıdır. Bəzi qüvvələr səhabələri lənətləməkdə şiələri ittiham edir və qınayırlar. Bu işi onlar və Müaviyə görmüşdür. Allahın rəsulundan sonra insanların ən fəzilətlisi(١), ən birinci müsəlman(٢) və Peyğəmbərin (s) ən yaxın səhabəsi olan Əmirəlmöminin Əli ibn Əbu Talibi (ə) Ömər ibn Əbdüləzizin xilafətinə qədər on illərlə minbərlərdə pisləmiş və lənətləmişlər. O, xəlifə olandan sonra bunu qadağan etdi. Əbdülməlik ibn Mərvandan sonra oğulları Vəlid və Süleyman bir-birinin ardınca təxminən ١٢-١٣ il hakimiyyətdə oldular. Onlardan sonra Ömər ibn Əbdüləziz xəlifə seçildi. Təxminən iki ildən sonra isə Əbdülməlikin daha iki oğlu - Yezid və Hişam xilafət kürsüsündə oturdular. Ömər ibn Əbdüləziz bunun qarşısını aldı, heç kəsi Əmirəlmöminini (ə) lənətləməyə qoymadı. O zamana qədər isə lənətləyirdirlər. Bir iş .bu idi. Bəli, camaat əvvəlcə təəccüblənirdi, sonra isə yavaş-yavaş alışdı

Tarixdə oxudum ki, Müaviyənin və onun canişinlərinin hakimiyyətinin İslam dünyasında Əhli-beyti məzəmmət və Əhli-beyt düşmənlərini tərif edən hədis qoşmağa və ayə təfsir etməyə məcbur etmədikləri bir qiraətçi, hədisşünas



---

.Əl-Kafi, c. ١٥, səh: ٢٠١ [٨٣] -١

.Əvalim əl-ülum vəl-məarif, c. ١١, səh: ٣٨٣ [٨۴] -٢

və rəvayətçi qalmadı. Məşhur rəvayətçilərdən və Peyğəmbər (s) səhabələrindən olan Səmürə ibn Cündəb Peyğəmbərin (s) qəzəbləndiyi bir şəxsdir. Məşhur əhvalatda deyilir ki, onun bir ailəyə məxsus torpaqda bir xurma ağacı vardı. O, ağacına baş çəkmək üçün həmin ailəyə xəbər vermədən ailə-uşağın oturduğu yerdə birdən-birə həyətə girirdi. Onlar Peyğəmbərə (s) şikayət etdilər. Peyğəmbər (s) dedi ki, xurma ağacını ev sahibinə sat. Dedi ki, satmıram, öz ağacımdır və ağacıma baş çəkmək istəyirəm. Buyurdu ki, mənə sat. Bunu da qəbul etmədi. Dedi filan qədər pul verərəm, yenə qəbul etmədi. Buyurdu ki, cənnətdə bir ağac verərəm; yəni əslində ona cənnət vəd etdi. Dedi ki, satmıram, mən məhz bu ağacımı istəyirəm. Belə olanda Peyğəmbər (s) ev sahibinə dedi ki, get bunun ağacını kəs, at bayıra, götürüb aparsın. İslamda mülk və mal bəhanəsi ilə xalqa əziyyət vermək yolverilməzdir.(۱) Bizim fiqh qaydalarımızdan olan məşhur La zərər hədisi bu adama aiddir. Səmürə ibn Cündəb Müaviyənin dövrünə qədər yaşadı. Bəxtə baxın, Müaviyə də o zaman səhabələri axtarırdı. Peyğəmbər (s) səhabələri cəmiyyətdə möhtərəm sayılırdılar. Müaviyə onları öz ətrafına topladı, bunu da çağırdı. Ona dedi ki, İnsanların eləsi vardır ki, onun dünya həyatı haqqındakı sözləri sənin xoşuna gələr. O, qəlbində olana da (dili ilə ürəyinin bir olmasına) Allahı şahid göstərər. Halbuki, o, düşmənlərin ən qəddarıdır(۲) ayəsini Əli ibn Əbu Talibə (ə) aid etməni istəyirəm. Çünki Müaviyə Əmirəlmömininin (ə) sözlərindən xəbərdar idi və dünyaya dair Nəhcül-bəlağədə də qeyd olunmuş güclü xütbələrinin güclü təsir .buraxdığını bilirdi

Bu gün kimsə hər hansı mövzuda son dərəcə səlis, gözəl və sənətkarcasına bir şeir, kitab, yaxud məqalə yazsa, təbii ki, həmin mövzu oturuşar, əsərin müəllifi də xalqın gözündə ucalar. Əmirəlmömininin (ə) sözlərini isə bizim tanıdığımız



---

۱- [۸۵] Mən la yəhzuruhu əl-fəqih, c. ۴, səh: ۳۳۴.

۲- [۸۶] Bəqərə/۲۰۴.

sənət əsərlərinin həqiqətən heç biri ilə müqayisə etmək olmaz, bunlardan olduqca yüksəkdə durur, bir gözəllik tərənnümüdür. Əmirəlmömininin (ə) Nəhcül-bəlağədəki sözlərinin hamısı İslam dəyərlərindən, İslam təlimlərindən ibarətdir. Bu, Müaviyə üçün əsla dözüləsi və qəbulediləsi deyildi, həm də Əmirəlmömininin (ə) hörmətini artırırdı. O, Əmirəlmömininin (ə) dünyanı məzəmmət edən zahidanə kəlamlardan qurtulmaq istəyirdi. Buna dedi ki, gəl bu ayənin Əli ibn Əbu Talib (ə) haqda nazil olduğunu söylə. Yəni Əli ibn Əbu Talib (ə) dünya haqqında elə danışır ki, sən təəccüblənirsən, Allaha and da içir, amma İslamın və Allahın ən qatı düşməni odur. De ki, bu ayə Əli (ə) haqda nazil olmuşdur. Başqa bir ayə də var: İnsanların eləsi də vardır ki, Allahın razılığını qazanmaq üçün öz canını fəda edər(١). Ona dedi ki, bunun da İbn Mülcəm haqda nazil olduğunu söylə. Müaviyənin buna çox ehtiyacı vardı. Bu, təbliğat üçün ona çox lazım idi. Səmürə ibn Cündəb uşaqlığından əsgər olmuş, hələ həddi-büluğdan öncə döyüşlərdə iştirak etmişdi. Peyğəmbər (s) səhabələrindən olan və Peyğəmbərin (s) kənarında döyüşmüş belə bir şəxs bu ayəni Əmirəlmömininin (ə) əleyhinə təfsir etməli, onun haqqında nazil olduğunu söyləməli idi. Səmürə ibn Cündəb pis və daşürəkli adam idi, amma vicdanı qəbul etmədi, bu işdən boyun qaçırdı. Müaviyə belə işlərdən ötrü vasitəçilik edən adamlarına dedi ki, deyin pul sarıdan nigaran olmasın, ona əlli min dirhəm pul verəcəyik. Əlli min dirhəm o zaman böyük pul idi. Əlli min misqal gümüş ozamankı qiymətlərə görə beş min misqal qızıl demək idi. Bu böyük rəqəm idi. Ona dedilər ki, sənə əlli min pul verəcək. Dedi ki, xeyr, mən qəbul etmirəm. Bəzi təhlilçilər deyirlər ki, Səmürə ibn Cündəb artistlik edib qiyməti qaldırmaq istəyirdi, vicdanı narahat deyildi; Müaviyənin buna ehtiyaclı olduğunu bilib çənə vururdu. Ya belə idi, ya da həqiqətən vicdanı qəbul etmirdi. Mən orasını bilmir və Səmürənin günahlarını götürmək



---

١- [٨٧] Bəqərə/٢٠٧.

istəmirəm. Qəbul etməyəndə qiyməti qaldırdılar yüz min dirhəmə. Yenə də qəbul etmədi. Yüz əlli min və iki yüz min dirhəm etdilər, yenə də qədul etmədi. Dəqiq yadımda deyil, güman ki, üç yüz, yaxud beş yüz min dihəmə qədər böyük bir rəqəm .alındı, amma yenə qəbul etmədi

Müaviyə vasitəçilik edənə dedi ki, bu ağılsız beş yüz minin nə qədər olduğunu bilmir?! Deyin beş yüz min dirhəmi gətirsinlər, nə qədər olduğunu görsün, görək sonra qəbul edəcək, yoxsa yox. Xəzinədar beş yüz min dirhəmi gətirdi. O zaman pulları kisələrə yığırdılar. Hamballar ağır pul kisələrini daşıyıb bir-birinin üzərinə yığdılar və otağın tavanına qədər çatdı. Dedilər ki, beş yüz min dirhəm budur; qəbul edirsən, yoxsa yox. Bu pullara baxıb çox böyük sərvət olduğunu gördü, razılaşdı, ayəni deyilən şəkildə təfsir etdi və kitablarda qaldı. İslam dünyasında belə səhv, rüsvayçı və çərən sözlərin əksəri məhv edildi, sonralar alimlər bunları kənara tulladılar, amma yenə də bəzisi qaldı, bəzi adamların beynində təsir buraxdı. Müaviyə bu işi görürdü, təbliğat aparırdı. .Bunlar Müaviyənin hakimiyyətdən ötrü istifadə etdiyi metodları təşkil edir

Haqq cinahı da bu batil düşmən qarşısında bikar oturmamışdı, onların da öz üsulları vardı. Xülasə şəkildə desək, bu üsullar birinci növbədə qüdrətli müqavimət və fəaliyyətdən ibarətdir. Bəzi adamlar elə bilirlər ki, İmam Həsən Müctəba (ə) vuruşmağa qorxdu. Xeyr! İmam Həsən Müctəba (ə) qətiyyətlə döyüşə qərar vermişdi. O, ən cəsur insanlardandır. Mən müxtəlif hadisələrdə İmam Müctəbanın (ə) qəhrəmanlıqlarını araşdırarkən onların olduqca çox olduğunu gördüm. Əmirəlmömininin (ə) döyüşlərində həzrət Əlinin (ə) özü İmam Həsən (ə) və İmam Hüseynin (ə) təhlükəli yerlərdə vuruşmasına mane olurdu. Bəzi səhabələr deyirdilər ki, Məhəmməd ibn Hənəfiyyəni nə üçün irəliyə göndərirsən, o da oğlundur, İmam Həsəni (ə) və İmam Hüseyni (ə) isə göndərmirsən. Buyururdu ki, Peyğəmbərin (s) nəslinin (kəsilməsindən qorxuram, bunlar Peyğəmbərin (s

yeganə varisləridir. Döyüşdə təhlükə hiss edir və bunları qorumağa çalışırdı. Onları sevdiyinə görə belə etmirdi, təbii ki, digər övladlarını da sevirdi. Əlinin (ə) özü təhlükəli döyüşlərə girən adam idi, qorxusu yox idi. Lakin bunlar Peyğəmbər (s) övladları idilər və Əmirəlmöminin (ə) onları təhlükəyə atmaq istəmirdi. Bunlar bu səbəbdən Əmirəlmömininin (ə) döyüşlərində çox öndə olmayıblar. Bu baxımdan onların adları həmin dövrün cəsurları sırasında qeyd olunmamışdır, lakin İmam Həsən (ə) İrana qarşı İslam döyüşlərindən iştirak etmiş, Əmirəlmömininin (ə) əmri ilə Osmanın evini qiyamçılardan qoruyanda və digər çox əhəmiyyətli hadisələrdə iştirak etmişdir. Cəməl və Siffeyn döyüşlərində də İmam Həsən Müctəbanın (ə) üzərinə olduqca önəmli işlər düşmüşdür. Mən xüsusən Siffeyn və Cəməl döyüşlərində İmam Həsənin (ə) adını çox görmüşəm, İmam Hüseynin (ə) adını isə az. Yəni İmam Həsən Müctəba (ə) döyüşlərdə hətta İmam Hüseyindən (ə) artıq iştirak etmişdir. O, müharibədə, siyasətdə və nitqdə güclü idi. İnsan İmam Həsən Müctəbanın (ə) mübahisələrini oxuyanda heyrətə gəlir. Bu qədər güclü və qüdrətlidir. Sülh məsələsində və ondan sonra İmam Həsəndən (ə) elə qətiyyətli və güclü sözlər nəql olunmuşdur ki, bəzi nümunələrdə həzrət Əlinin (ə) sözlərindən də güclü və sərt olduğu nəzərə çarpır. Mən Əmirəlmömininin (ə) sözlərində düşmənlərə qarşı belə qüdrət və sərtliyi az görmüşəm. Bəlkə də ona görə ki, Əmirəlmöminin (ə) bu qədər həyasız və xəbis düşmənlərlə yaxın ünsiyyətdə olmamışdır. Deyilənlərə əsasən, İmam Həsənin (ə) işlərində heç bir qüsur yoxdur. Qüsur dövrün şəraitindədir. Onun üsullarından biri mümkün həddə müdafiə üçün qüdrətli müqavimət göstərməkdir. Bəzi yerlərdə qüdrətli müqavimət ziyanla tamamlanır. Üsulu dəyişmək və üsul seçimində manevr etmək mühüm və lazımlı .məsələdir

İkincisi təbliğatdır. Haqq cinahında təbliğatın olduqca böyük əhəmiyyəti var. Lakin qeyd etdiyim kimi, təbliğat məsələsində haqq cinahı üçün məhdudiyyətlər var; hər bir üsul

və metoddan istifadə edə bilmir, yalnız haqqı və həqiqəti söyləyirlər. Xalqın zehnində özünün xoşladığı bəzi məsələlər var, batil cinahı onları xalqın sevdiyi şəkildə bəyan etməkdən çəkinmir, haqq cinahı isə acı da olsa, haqqı söyləyir. Əmirəlmöminin (ə) öz səhabələri ilə danışanda bəzən elə acı danışır ki, insan təəccüb edir. Biz üsullarımızı həmin üsullara oxşatmağı sevsək də, bəzi yerlərdə hətta təəccüb edirik. Müaviyə heç vaxt bunu etmirdi. Müaviyə xalqa yaltaqlanırdı. Müaviyə nəyin bahasına olursa-olsun, xalqın dəstəyini qazanmağa çalışırdı. Əli ibn Əbu Talib (ə) isə bu işi görmürdü. Bu o demək deyil ki, bunu bilmirdi. Əslində bu, təqvanın, dəyərlərin ziddinədir və Əli ibn Əbu Talibin (ə) özü buyurub ki, təqva məsələsi olmasaydı, mən Müaviyədən zirək olardım.(١) Həqiqət də budur. Əlinin (ə) əsil-nəsəbi, Peyğəmbərə (s) yaxınlığı, böyük nailiyyətləri, güclü beyni və ruhu vardı. Məlum məsələdir ki, o, Müaviyədən bilikli, .peşəkar və zirəkdir və çox işlər görə bilər, lakin haqq icazə vermir

Başqa bir üsul dəyərləri qorumağa isrardır. Haqq cinahında böyük əhəmiyyət kəsb edən amillərdən biri budur, nəyin bahasına olursa-olsun dəyərləri qorumağa israrlıdırlar və məktəbin qorunduğu həddə qədər geri çəkilirlər. Bunu da diqqətdən qaçırmayın. Yəni haqq tərəf müqavimətinin məktəbin özünün təhlükəyə düşməsi ilə nəticələndiyini görəndə geri çəkilməyə utanmır. İmam Hüseyn (ə) buyurdu ki, mən məğlubiyyəti qəbul edərəm, amma cəhənnəm oduna daxil olmaram.(٢) Bəzi adamlar müəyyən yerlərdə hansısa işi görməyi eyib saydıqlarına görə ilahi əzaba düçar olarlar. Eyib niyə olur?! Əsas budur ki, insan Allahın razılığını qazansın, vəzifəsini yerinə yetirsin; bir sözdən dönmək, bir xətdən qayıtmaq və bir mövqedən geri çəkilməklə olsa belə. Allah nəyi istəyirsə, nədən razıdırsa, o da olmalıdır. Baxın, bu, imamların (həyatında bir qaydadır. İmam Həsənin (ə



---

.Əl-Kafi, c. ٨, səh: ٢۴ [٨٨] -١

.Bihar əl-ənvar, c. ٧۵, səh: ١٢٨ [٨٩] -٢

həyatında da belədir. İmam Həsən (ə) zərurəti və reallığı nəzərə alıb Müaviyə ilə sülhü qəbul etdi, halbuki o vaxta qədər daim qoşun göndərir, döyüşə həvəsləndirir, qüvvə cəlb edir, məktub yazır və güclü bir döyüş üçün lazım olan hər bir işi görürdü. Sonra isə mümkün olmadığını görüb sülhü qəbul etdi və bu zaman hətta yaxın dostları da ondan üz çevirdilər... İmam Həsən (ə) sülhü qəbul edəndən sonra ürəklərində müharibəni istəməyən çoxları sevindilər. Amma bəlkə onlar da İmam Həsəni (ə) qınamağa başladılar ki, sən nə üçün sözündən döndün. Mən adlarını çəkmək istəmirəm; hətta yaxın adamlar, böyük səhabələr və bəzi dəyərli şəxslər də İmam Həsənə (ə) .xoşagəlməz sözlər dedilər. O həzrət isə məktəbi qorumaq üçün geri çəkildi

Növbəti məsələ haqq cinahının məğlubiyyətinin təhlilidir. İmam Həsənin (ə) məğlubiyyətinin səbəbi ümumi ayıqlığın zəifliyindən ibarət idi. Əsas səbəb bu və imanın maddi maraqlara qarışması idi. Xalq olduqca avam idi, imanı da maddi məsələlərə qarışmışdı. Onlar üçün maddiyyat birinci dərəcəli əhəmiyyətə malik idi. Dəyərlərin zəifləməsi İmam Həsənin (ə) sülhündən təxminən on beş il öncədən tədricən başlamışdı, ayrıseçkilik və digər bu kimi məsələlər yaranmışdı. Bütün bunlar .İmam Həsənin (ə) müqavimət göstərə bilməməsinə bais oldu

Qalib tərəfin məğlub tərəflə rəftarına gəlincə isə, İmam Həsəni (ə) və tərəfdarlarını həbs etmək, yaxud öldürmək əvəzinə zahirdə çox hörmətlə davrandılar, imamla görüşdülər, çox hörmət bildirdilər, əslində isə şəxsiyyəti məhv etməyə və zəiflətməyə başladılar. Şəxsiyyəti məhv etməyi planlaşdırıb şəxsi qorudular. Onların üsulu bu idi və .qeyd etdiyim kimi, bunu təbliğatda prioritet seçdilər

Məğlub tərəf qalib tərəfə nə etdi? Onlar bu strategiyanı seçdilər ki, çox qarışıq, fitnəli, təhlükəli və zəhərli bir şəraitdə bir haqq çevrəsi formalaşdırsınlar və İslamı qorumağın əsas şərti kimi onu idarə və inkişaf etdirsinlər. Fikirləşdilər ki, bütün cəmiyyəti düzgün İslam təfəkküründə saxlaya

bilmiriksə, zəif və tənəzzüldə olan böyük bir çevrəyə enerji sərf etmək yerinə, düzgün xətdə olan güclü çevrəni məhdud dairədə qoruyaq; o yaşasın və əsl İslamın təminatçısı olsun. İmam Həsən (ə) bu işi gördü, məhdud bir çevrə yaratdı, daha doğrusu, onu idarə etdi. Bu çevrə Əhli-beyt səhabələri və Şiə cinahıdır. Bunlar İslam tarixi və repressiya dövrləri boyunca qaldılar və İslamın yaşamasına səbəb oldular. Bunlar olmasaydı, hər şey kökündən dəyişərdi. Bu imamət çevrəsi və Əhli-beyt baxışı .həqiqi İslamın yaşamasını təmin etdi

Sonuca gəlincə isə, qalib və güclü qrup İslam dünyası tərəfindən qınaq obyektinə çevrildi, məğlublar və zəif sayılanlar isə qalib və fateh oldular. Bu gün baxsanız, görərsiniz ki, İslam dünyasında mövcud fikirlər aşağı-yuxarı İmam Həsən Müctəbanın (ə) və Əmirəlmömininin (ə) təbliğ etdikləridir, Müaviyənin, ondan sonra Yezidin, daha sonralar Əbdülməlikin, Mərvanın və digər Əməvi xəlifələrinin təbliğ etdiklərii deyil. Onların fikirləri tamamilə məğlub və məhv oldu, tarixdə qalmadı. Onların düşüncəsini Nasibilik adlandırmaq olar. Nasibilik güman ki, bu gün İslam dünyasında tərəfdarı qalmayan bir firqədir. Nasibilər Peyğəmbər (s) ailəsini söyənlər, onların müsəlman olmasını qəbul etməyənlərdir. Onların fikri bu idi. Əgər Müaviyə fateh və qalib olsaydı, bu gün İslam dünyasına həmin təfəkkür hakim olardı, halbuki əksinə, Əmirəlmömininin (ə) və İmam Həsənin (ə) düşüncəsi hakimdir. Bəzi ikinci dərəcəli məsələlərdə fikirlər eynilə qalsa da, ümumilikdə belədir. Deməli, İmam Həsən (ə) və onun cinahı qalib oldu. Bu, bütün İslam tarixində təsiri baxımından İmam Həsənin (ə) .sülhünə qısa baxış idi

## İşarə

Əziz ilahi bir din kimi İslamı təhdid edən bütün təhlükələr İslamın meydana çıxdığı zaman, yaxud ondan öncə Allah tərəfindən proqnoz edilmiş və o təhlükələrə qarşı tədbir vasitəsi bu dinin özündə nəzərdə tutulmuşdur; sağlam bir bədənin xəstəliklərə qarşı müqavimət gücü özündə olduğu kimi. Sanki mühəndis bir maşın düzəltmiş və təmir alətlərini də onun içinə qoymuşdur. Hər bir şey kimi İslamı da bəzi təhlükələr təhdid edir. Buna qarşı tədbir görmək lazımdır və Allah-Taala bu tədbir vasitəsini İslamın özündə yaratmışdır. Bəs o təhlükə nədir? İslamı iki əsas təhlükə təhdid edir: .biri xarici düşmənlər, digəri isə daxildən məhvolma təhlükəsidir

Xarici düşmən bayırdan müxtəlif silahlarla bir quruluşun varlığını, təfəkkürünü, ideoloji təməllərini, qanunlarını və hər şeyini hədəf seçəndir. Bayırdan nə deməkdir? Mütləq ölkə və quruluşun xaricindən yox, ölkənin daxilində də ola bilər. Özlərini quruluşa yad bilən və ona qarşı çıxan düşmənlər var. Bunlar özgədirlər, yaddırlar. Bunlar quruluşu məhv etməyə və dağıtmağa çalışırlar; xəncərlə, odlu silahla, ən müasir texnikalarla, informasiya hücumları ilə, pulla və ixtiyarlarında olan hər bir şeylə. Bu bir növ .düşməndir

İkinci düşmən və təhdid isə daxildən məhvolma təhlükəsidir. Bu daha yadlara məxsus deyil, doğmaların təhdididir. Bir quruluşda doğmalar yorğunluq, düzgün yolu dərk etməkdə səhvə yol vermək üzündən, nəfsə məğlub olmaq, maddi gözəlliklərə uymaq və onları böyük saymaq kimi amillərdən irəli gələrək birdən-birə daxildə təhdid yarada .bilirlər. Bunun təhlükəsi birinci amildən də artıqdır

Hər bir quruluş, hər bir təşkilat üçün bu iki düşmən - xarici və daxili təhdid mövcuddur. İslam hər iki təhdidə qarşı yol göstərmiş və cihad təyin etmişdir. Cihad xarici düşmənlərə məxsus deyil: "Kafir və münafiqlərlə cihad et".(١) Münafiq



---

.Tövbə/٧٣ [٩٠] -١

özünü quruluşun daxilinə salır. Odur ki, bunların hamısı ilə cihad etmək lazımdır. Cihad quruluşa müxalif və düşmən olduğuna görə ona hücum etmək istəyənlərə qarşı edilir. Həmçinin daxili parçalanma ilə mübarizə üçün çox dəyərli olan əxlaq təlimləri mövcuddur. Bu təlimlər dünyanı həqiqi şəkildə insana tanıtdırır: "Bilin ki, dünya həyatı oyun-oyuncaq, bərbəzək, bir-birinizin qarşısında öyünmək, mal-dövləti və oğul-uşağı çoxaltmaqdan ibarətdir"(١). Yəni dünyanın zinət və ləzzətləri sizə lazım olsa da, onlardan istifadə etməyə məcbur olsanız da, həyatınız onlarla əlaqədar olsa da, bilin ki, bunları mütləqləşdirmək, bu ehtiyacların arxasınca gözübağlı hərəkət etmək və məqsədləri unutmaq çox təhlükəlidir.

Əmirəlmöminin (ə) döyüş meydanlarının aslanıdır. Adama elə gəlir ki, onun sözlərinin yarıdan çoxu cihad, döyüş və qəhrəmanlıq haqdadır. Nəhcül-bəlağənin xütbə və rəvayətlərinə baxanda isə görürük ki, o həzrətin əksər tövsiyələri əxlaqa, təqvaya, gözütoxluğa, dünyanı kiçik saymağa, mənəvi və bəşəri dəyərləri uca tutmağa aiddir.

İmam Hüseynin (ə) işi xarici düşmənə, ilahi çevrədən xaricdə və ona müxalif olan düşmənə qarşı – yəni bu düşmən sərhədlər xaricində olmaya da bilər - cihadla yüksək və bənzərsiz həddə nəfsə qapılmağa, fərdi və ictimai azğınlıqlara qarşı cihadı birləşdirməkdir. Yəni Allah-Taala bilir ki, bu hadisə qarşıya çıxacaq. Buna görə də yüksək səviyyəli bir nümunə təqdim olunmalı və örnək göstərilməli idi. Necə ki, ölkə çempionları məşğul olduqları idman növündə digərlərinin həvəslənməsinə bais olurlar. Sözsüz ki, bu, izah etmək üçün kiçik bir misaldır. Aşura macərası hər iki cəbhədə böyük bir cihaddan ibarətdir; həm xarici düşmənlə, yəni azğın xilafət aparatı və ona yapışmış dünyagirlərlə, əziz Peyğəmbərin (s) insanların xilası üçün istifadə etdiyi hakimiyyəti İslam və Peyğəmbər (s) yolunun əks istiqamətinə aparmaq istəyən şəxslərlə mübarizə cəbhəsində, həm də daxili cəbhədə, yəni o səh:١١١

---

١- [٩١] Hədid/٢٠.

.zaman cəmiyyətin ümumi şəkildə getdiyi daxili fəsadla mübarizədə

Mənim fikrimcə, ikinci amil daha əhəmiyyətlidir. Müəyyən müddət ötmüş, əvvəldəki çətinliklər arxada qalmış, fəthlər baş vermiş, qənimətlər əldə olunmuş, ölkənin əhatəsi genişlənmiş, xarici düşmənlərin təhlükəsi dəf edilmiş, ölkəyə çoxlu sərvətlər gəlmişdi; bəziləri varlanmış, bəziləri zadəgan təbəqəsi yaratmışdılar. İslamın zadəganlığı məhv etməsindən bir müddət sonra İslam dünyasında yeni aristokratlar təbəqəsi vücuda gəldi. Bəzi qüvvələr İslam adı ilə, İslam postları ilə – filan səhabənin oğlu, Peyğəmbərin (s) filan dostunun oğlu, Peyğəmbərin (s) filan qohumunun oğlu olaraq özlərinə yaraşmayan işlərə qurşandılar. Bunların bəzisinin adı tarixdə qeyd olunmuşdur. Elələri tapıldı ki, qızlarının mehri üçün əziz Peyğəmbərin (s), Əmirəlmömininin (ə) və erkən İslam çağı müsəlmanlarının dediyi ۴۸۰ dirhəmdən ibarət olan sünnə mehrinin yerinə bir milyon dinar – yəni bir milyon misqal xalis qızıl təyin etdilər. Kimlər? Böyük səhabələrin, (misal üçün, Müsəb ibn Zübeyrin və digərlərinin oğulları. (۱۹۹۳

**.Hadisələr Peyğəmbərin (s) vəfatından ۱۰ ildən az bir zamandan sonra başlandı**

Öncə İslamda parlaq keçmişi olanlar – Peyğəmbərin (s) müharibələrində iştirak etmiş şəxslər və digər səhabələr xüsusi imtiyazlardan bəhrələndilər. Beytülmaldan daha artıq bəhrələnmə o imtiyazlardan biri idi. Deyirdilər ki, onları digərləri ilə bərabər tutmaq düzgün deyil. Bu birinci iş idi. Yayınma ilə nəticələnən hərəkətlər belə kiçik nöqtədən başlayır və hər bir addım sonrakını daha da sürətləndirir. Yayınmalar belə başlandı, nəhayət, Osmanın xilafətinin ortalarında pik həddə çatdı. Üçüncü xəlifənin dövründə Peyğəmbərin (s) böyük səhabələri dövrün ən varlı adamlarından sayıldılar. Diqqət yetirirsiniz? Yəni adları məşhur olan bu hörmətli səhabələrin – Təlhənin, Zübeyrin, Səd ibn Əbu Vəqqasın və digərlərinin hər birinin Bədrdə, Hüneyndə, Ühüddə qalın bir kitab dolu parlaq keçmişləri vardı. Bu adamlar milyonçuların birinci sırasında .yer aldılar

Onların biri öldükdən sonra qalmış qızılları varisləri arasında bölmək istəyəndə əvvəlcə külçə formasına saldılar və sonra balta ilə qırıb bölməyə başladılar; balta ilə kiçik parçalara bölünən odun kimi. Qızılı adətən misqalla ölçürlər. Görün nə qədər olub ki, onu balta ilə sındırırmışlar. Bunlar tarixdə qeyd olunmuşdur, yalnız şiə kitablarında yazılmayıb. Bunlar hamının yazmağa və qeyd etməyə çalışdığı həqiqətlərdir. Onlardan qalan dirhəm və dinarların miqdarı fantastik idi. (۱۹۹۶)

Cəmiyyətin daxildən çürüməsi dedikdə bunu nəzərdə tuturuq; yəni cəmiyyətdə özlərinin dünyagirlik və şəhvətpərəstlikdən ibarət olan və təəssüf ki, həm də öldürücü olan yoluxucu əxlaq xəstəliklərini tədricən cəmiyyətə köçürən insanlar peyda olurlar. Məgər belə bir vəziyyətdə kiminsə Yezid ibn Müaviyə rejiminə qarşı çıxmağa ürəyi, cürəti, yaxud hövsələsi olar?! Məgər belə bir şey baş verər?! Yezidin ozamankı zülm və fəsad dolu rejiminə qarşı mübarizə aparmağı kim ağlından keçirər?! Belə bir şəraitdə möhtəşəm Hüseyn (ə) qiyamı baş verib həm düşmənə, həm də adi müsəlmanlar arasında məhvə aparan rahatçılıq və fəsadçılıq ruhiyyəsinə qarşı mübarizə apardı. Bu mühüm məsələdir. (۱۹۹۳)

## İmam Hüseynin (ə) qiyamında məqsəd

Bu hadisəyə diqqətlə baxdıqda bu bir neçə ay ərzində – Mədinədən çıxıb Məkkəyə gəldiyi və Kərbəlada şəhadət şərbətini içdiyi zamana qədər həzrət Əbu Abdullahın (ə) hərəkətində bəlkə də yüzdən artıq mühüm dərs saymaq olar. Bu hərəkətdə hətta minlərlə dərs olduğunu deyə bilərik. Demək olar ki, o həzrətin hər bir işarəsi bir dərsdir. Amma dəqiq bölgü aparsaq, hər biri bir ümmət, bir tarix, bir ölkə, insanın öz tərbiyəsi, cəmiyyətin idarəsi və Allaha yaxınlaşmaq üçün dərs olan yüz mövzu və başlıq əldə etmək olar. Hüseyn ibn Əli (ə) məhz buna görə dünya müqəddəsləri arasında günəş kimi nur saçır. Əgər peyğəmbərlər, övliyalar, imamlar, şəhidlər və saleh adamlar ay və ulduz kimi olsalar, bu həzrət dünyaya nur saçan günəş kimi parlayır. Qeyd etdiyim yüz

dərsi qoyaq kənara, mən indi İmam Hüseynin (ə) hərəkətində və qiyamında mövcud olan bir əsas dərsdən danışmaq istəyirəm. Digərləri ikinci dərəcəli, bu isə birinci dərəcəlidir. İmam Hüseyn (ə) nə üçün qiyam etdi? Bu, dərsdir. İmam Hüseynə (ə) deyirdilər ki, Mədinə və Məkkədə sizə hörmət edirlər, Yəməndə hamı şiədir, kənarda sizin Yezidlə, Yezidin də sizinlə işi olmayacaq bir yerə gedin, bu qədər müridiniz, şiələriniz var, yaşayın, ibadət və təbliğ edin, nə üçün qiyam edirsiniz? Məqsəd nədir? Əsas sual və əsas dərs budur. Demirik ki, heç kim bunu deməyib. İnsafla desək, bu sahədə çox işlənmiş və çoxlu sözlər deyilmişdir. İndi bizim demək istədiyimiz söz isə .fikrimizcə, bu məsələyə dair yeni qənaət və yeni baxışdır

Bir qrup belə düşünür ki, Əbu Abdullahın (ə) məqsədi azğın Yezid rejimini devirmək, bütün ictimai və siyasi sahələrdə Peyğəmbər (s) yolunun və imamətin icrası ilə İslam hökuməti qurmaq olmuşdur. Bu söz səhv deyil, amma yarıgerçəkdir. Bu sözdə məqsəd belə də ola bilər: o həzrət hökumət qurmaq üçün qiyam etdi, amma bunun imkansız olduğunu görsəydi, deyəcəkdi ki, daha olmadı, qayıdaq. Məqsəd budursa, səhvdir. Hakimiyyət məqsədi ilə hərəkət edən şəxs bunun mümkün olduğu yerə qədər gedir, uyğun ehtimalın mövcud olmadığını gördükdə isə vəzifəsi qayıtmaqdır. Məqsəd hökumət qurmaqdırsa, insan mümkün olana qədər getməli, mümkün olmayan yerdə isə qayıtmalıdır. Əgər bu qiyamda həzrətin məqsədinin düzgün Əli (ə) hökuməti qurmaq olduğunu deyən şəxsin məqsədi budursa, bu, düzgün deyil. Çünki imamın .hərəkətlərinin məcmusu bunu göstərmir

Bir qrup insan da düşünür ki, Əbu Abdullahın (ə) məqsədi hakimiyyətə gəlmək deyildi. Çünki o, Yezidi devirib hakimiyyətə gələ bilməyəcəyini bilirdi. O ümumiyyətlə şəhid olmaqdan ötrü qiyam etdi. Bu söz də bir zaman dillər əzbəri idi. Bəzi şəxslər bunu gözəl poetik ifadələrlə söyləyirdilər. Həzrətin şəhid olmaqdan ötrü qiyam etməsi iddiası yeni söz

deyil, hətta bəzi böyük alimlərimiz də bunu buyurmuşlar. Onlara görə, İmam Hüseyn (ə) buyurub ki, yaşamaqla bir iş görmək olmur, gedib şəhid olmaqla bir iş görək. Dini əsaslarda və İslam ədəbiyyatında belə bir şey də yoxdur ki, get özünü ölümə at. Bizdə belə bir şey yoxdur. Bizim müqəddəs şəriətdə tanıdığımız, hədislərdə və Quran ayələrində gördüyümüz şəhadətin mənası budur ki, insan vacib olan, yaxud tərcih edilən müqəddəs məqsədə çatmağa çalışsın və o yolda özünü ölümə atsın. Bu, düzgün İslam şəhadətidir. Lakin insanın ümumiyyətlə gedib öldürülüm – deyə yola düşməsi, yaxud "mənim qanım zalımın ayağını sürüşdürəcək və o yıxılacaq!" kimi poetik ifadə (İslama aid deyil). Bunlar belə əzəmətli hadisəyə aid deyil. Bunda da həqiqətin bir hissəsi var, amma imamın məqsədi bu deyil. Deməli, nə demək olar ki, bu qiyamda məqsəd hakimiyyətə gəlmək olmuşdur, nə də demək olar ki, o, şəhid olmaq üçün qiyam etmişdir. Əslində "məqsəd hakimiyyət idi" və yaxud "məqsəd şəhadət idi" deyən şəxslər məqsədlə nəticəni səhv salmışlar. Məqsəd bunlar deyildi. İmam Hüseynin (ə) başqa bir məqsədi vardı, lakin o məqsədə çatmaq üçün hərəkət tələb olunurdu. Həmin hərəkət də bu iki nəticənin birinə səbəb olacaqdı: hakimiyyət, yaxud şəhadət. İmam Hüseyn (ə) bunların hər ikisinə hazır idi; həm hökumət işlərini hazırlamışdı və hazırlayırdı, həm də şəhadət işlərini. Hər biri ola bilərdi, amma heç biri məqsəd deyildi, .hər ikisi nəticə idi. Məqsəd başqa bir şey idi

Məqsəd nədir? Əvvəlcə məqsədi qısa şəkildə və bir cümlə ilə söyləyirəm, sonra izah edəcəyəm. İmam Hüseynin (ə) məqsədinin nədən ibarət olduğuna dair deməliyik ki, o həzrətin məqsədi din vacibləri arasında böyük bir əməli yerinə yetirmək idi. Bu işin İslamın düşüncə, dəyər və əməl sistemində mühüm yeri vardı və ondan öncəyə qədər heç kəs onu yerinə yetirməmişdi; nə Peyğəmbər (s), nə Əmirəlmömininin (ə), nə də İmam Həsən Müctəba (ə). Bu vacib əməl olduqca əhəmiyyətli və çox əsaslı olsa da, İmam Hüseynin (ə) dövrünə qədər ona əməl olunmamışdı. Əməl

olunmamasının səbəbini də deyəcəyəm. İmam Hüseyn (ə) bu vacib əməli yerinə yetirməli idi ki, bütün tarix üçün dərs olsun. Məsələn, Peyğəmbər (s) hökumət qurdu və bu işlə təkcə hakimiyyətin hökmünü gətirmədi, həm də bütün İslam tarixi üçün örnək göstərdi. Yaxud Peyğəmbər (s) Allah yolunda cihad etdi və bu, müsəlmanların və bütün bəşər tarixi üçün əbədi dərs oldu. Bu vacib əməl də İmam Hüseynin (ə) vasitəsi ilə .yerinə yetirilməli idi ki, müsəlmanlar üçün və bütün tarix üçün əməli dərs olsun

Nə üçün bu işi İmam Hüseyn (ə) görməlidir? Ona görə ki, bu vacib əməlin görülməsinə şərait İmam Hüseynin (ə) dövründə yarandı. Əgər bu şərait İmam Hüseynin (ə) dövründə deyil, misal üçün, İmam Əli ən-Nəqinin (ə) dövründə yaransaydı, bu işi o görəcək, İslam tarixinin böyük qurbanı o olacaqdı. Əgər İmam Həsən Müctəbanın (ə), yaxud İmam Sadiqin (ə) dövründə yaransaydı, onlar buna əməl edəcəkdilər. Bu şərait İmam Hüseyndən (ə) öncə yaranmadı; İmam Hüseyndən (ə) sonra da qeyb dövrünə .qədər yaranmadı

Deməli, məqsəd bir vacib əməli yerinə yetirməkdən ibarət idi. Bu vacib əməli yerinə yetirmək təbii şəkildə iki haldan biri ilə nəticələnəcəkdi: Biri budur ki, İmam Hüseyn (ə) hakimiyyətə gələcəkdi. Təbii ki, o bunu istəyirdi və buna hazır idi. O, hakimiyyətə gəlsəydi, cəmiyyəti Peyğəmbərin (s) və Əmirəlmömininin (ə) dövründəki kimi qüdrətlə idarə edəcəkdi. Biri də budur ki, bu vacib əməli yerinə yetirmək hakimiyyətə gəlməklə deyil, şəhadətə qovuşmaqla nəticələnəcəkdi. İmam Hüseyn (ə) buna da hazir idi. Allah İmam Hüseyni (ə) və digər imamları elə yaradıb ki, bu iş üçün qarşıya çıxacaq ağır şəhadətə hazırdırlar. Sözsüz ki, Kərbəla müsibətləri böyük müsibətlərdir. İndi məsələni .bir qədər izah edim

İslam peyğəmbəri və Allahın göndərdiyi hər hansı peyğəmbər özü ilə bir sıra hökmlər gətirir. Bu hökmlərin bəzisi fərdi olub insanın islahı üçündür, bəzisi isə ictimaidir və dünyanı abadlaşdırmaq, idarə etmək, cəmiyyəti ayaqda

saxlamaq üçündür. Peyğəmbərimizin (s) gətirdiyi bu hökmlər məcmusuna İslam deyilir. İslam dini əziz Peyğəmbərin (s) müqəddəs qəlbinə nazil oldu, namaz, oruc, zəkat, maddi yardım, həcc və ailə hökmlərini, fərdi münasibətləri, Allah yolunda cihadı, hakimiyyət məsələlərini, İslam iqtisadiyyatını, hökumət başçısı ilə xalqın münasibətlərini və xalqın hökümət qarşısındakı vəzifələrini gətirdi. İslam bunların hamısını bəşəriyyətə təklif etdi, əziz Peyğəmbər (s) hamısını insanlara çatdırdı. Sizi cənnətə yaxınlaşdıran və cəhənnəmdən uzaqlaşdıran hər bir işə dəvət etdim(١). Əziz Peyğəmbər (s) insanı və bir cəmiyyəti səadətə çatdıran hər bir şeyi bəyan etdi; təkcə .bəyan yox, hətta onlara əməl və onları icra etdi

Peyğəmbər (s) zamanında İslam hökuməti və İslam cəmiyyəti quruldu, İslam iqtisadiyyatı icra olundu, İslam cihadı bərpa olundu, İslam zəkatı alındı; bir İslam ölkəsi və İslam quruluşu ərsəyə gəldi. Bu quruluşun mühəndisi və bu qatarın lokomotivi əziz Peyğəmbər (s) və onun yerində oturan şəxsdir. Xətt də aydın və bəllidir. İslam cəmiyyəti və müsəlman şəxs bu xətt üzərində, bu istiqamətdə və bu yolla hərəkət etməlidir. Əgər belə bir hərəkət baş tutsa, o zaman insanlar kamiliyyə çatar, saleh və mələk kimi olarlar, insanlar arasında zülm, pislik, fəsad, ixtilaf, yoxsulluq və cəhalət ortadan götürülər, bəşər tam xoşbəxtliyə nail və Allahın kamil bəndəsi olar. İslam əziz Peyğəmbər (s) vasitəsi ilə bu sistemi gətirib ozamankı cəmiyyətdə icra etdi. Harada? Adı Mədinə olan, sonra da Məkkənin və digər bir neçə şəhərin qoşulduğu bir bölgədə. Burada bir sual ortaya çıxır. O da budur ki, Əgər əziz Peyğəmbərin (s) rels üzərinə çıxardığı bu qatarı bir əl, yaxud bir hadisə relsdən çıxarsa, vəzifə nədir? Əgər İslam cəmiyyəti yoldan yayınsa və bu yayınma elə bir həddə çatsa ki, bütün İslamın və İslam ?maarifinin yayınma təhlükəsi yaransa, vəzifə nədir



---

.Əl-Kafi, c. ٢, səh: ٧۴ [٩٢] -١

İki növ yayınma və azğınlıq var. Çox zaman xalq fəsada düçar olur, lakin İslam hökmləri məhv olmur. Bəzən isə xalq fəsada uğrayanda hökumətlər də fəsada uğrayırlar, alimlər və din natiqləri də. Azğın insanlardan əsla düzgün din təbliğ olunmaz. Onlar Quranı və həqiqətləri təhrif edirlər, yaxşıları pis, pisləri yaxşı, bəyənilməz işi bəyənilən, bəyənilən işi bəyənilməz göstərir, İslamın xəttini ۱۸۰ dərəcə dəyişdirirlər. İslam cəmiyyəti və quruluşu belə bir hala düşsə, vəzifə nədir? Düzdür, Peyğəmbər (s) vəzifənin nə olduğunu buyurmuşdu; Quran da buyurmuşdu: Sizdən hər kəs dinindən dönsə, (bilsin ki) Allah (onun yerinə) elə bir tayfa gətirər ki, (Allah) onları, onlar da (Allahı) sevərlər(۱). Bu badərə çoxlu ayələr, hədislər və sizin üçün İmam Hüseynin (ə) dilindən danışacağım hədis var. İmam Hüseyn (ə) Peyğəmbərin (s) bu hədisini xalqa söylədi. Peyğəmbər (s) buyurmuşdu: Lakin Peyğəmbər (s) bu ilahi hökmə əməl edə bilərdimi? Xeyr! Çünki Allahın bu hökmü cəmiyyətin yoldan çıxdığı zaman icra oluna bilər. Allahın cəmiyyətin yoldan çıxdığı zaman üçün təyin etdiyi hökmü var; sapqınlığın yüksək həddə çatıb İslamın özü üçün təhlükə yaratdığı cəmiyyətlərdə Allahın təyin etdiyi vəzifə var. Allah insanı heç bir hadisə qarşısında vəzifəsiz qoymur. Peyğəmbər (s) bu vəzifəni buyurmuş, Quran və hədis demişdir. Lakin Peyğəmbər (s) bu vəzifəyə əməl edə bilməz. Nə üçün əməl edə bilməz? Ona görə ki, bu vəzifəyə cəmiyyətin yoldan çıxdığı zaman əməl olunmalıdır. Cəmiyyət Peyğəmbərin (s) və Əmirəlmömininin (ə) dövründə o şəkildə yoldan çıxmamışdı. İmam Həsənin (ə) dövründə, Müaviyənin hökumət başçısı olduğu zaman o sapqınlığın çoxlu əlamətləri yaransa da, hələ elə həddə çatmamışdı ki, bütün İslamın təhrifi qorxusu olsun. Bəlkə də bir dövrdə belə bir vəziyyət yarandı, amma o zaman bu işi görməyə imkan və əlverişli şərait yox idi. İslamın bu hökmünün əhəmiyyəti hökumətin özündən az deyil. Çünki hökumət cəmiyyətin idarəsi deməkdir. Əgər



---

۱- [۹۳] Maidə/۵۴.

cəmiyyət tədricən yoldan çıxsa, fəsada uğrasa və Allahın hökmü dəyişilsə, vəziyyəti dəyişdirmə və həyatı yeniləmə hökmü, bugünkü sözlə desək, inqilab hökmü olmasa, bu hökumət nəyə yarayar?! Deməli, azğın cəmiyyəti əsl xəttinə qaytarmağa dair hökmün əhəmiyyəti hökumət hökmünün əhəmiyyətindən az deyil. Bəlkə bunun əhəmiyyəti kafirlərlə cihaddan da, bir İslam cəmiyyətində adi formada yaxşı işlərə dəvət etməkdən və pis işlərdən çəkindirməkdən də artıqdır; bəlkə də demək olar ki, hətta Allahın böyük ibadətlərindən və həcdən də artıqdır. Nə üçün? Ona görə ki, bu .hökm ölmək ərəfəsində olan, yaxud ölmüş İslamın yaşamasını təmin edir

Yaxşı, bu hökmü kim yerinə yetirməli, bu vəzifəni kim icra etməlidir? Peyğəmbərin (s) canişinlərindən biri; lakin bu şərtlə ki, şərait münasib olsun. Çünki Allah-Taala faydası olmayan bir işi vacib etmir. Şərait münasib olmasa, nə etsələr, faydasız olar və təsir bağışlamaz. Şərait əlverişli olmalıdır. Şəraitin əlverişli olmasının da xüsusi mənası var. Deyə bilmərik ki, təhlükə varsa, şərait münasib deyil. Xeyr, söhbət bundan getmir. Şərait münasib olmalıdır - yəni insan bilməlidir ki, bu işi gördükdə nəticə hasil olacaq, söz xalqa çatdırılacaq, xalq başa düşəcək və səhvə düşməyəcək. Bu kiminsə əməl etməli olduğu həmin vəzifədir. İmam Hüseynin (ə) dövründə sözügedən sapqınlıq və bu vəzifəyə münasib şərait yaranmışdı. Deməli, İmam Hüseyn (ə) Allahın vacib buyurduğu bu əməli yerinə yetirməli idi. Müaviyədən sonra elə bir adam hökumət başına gəlmişdi ki, heç zahirdə də İslam hökmlərinə əməl etmir, şərab içir, pis işlər görür, açıq şəkildə cinsi fəsad və cinayət törədir, Quranın əleyhinə danışır, açıq şəkildə Quranın və dinin ziddinə şeir deyir və İslama qarşı çıxır. Onun adı müsəlmanların başçısı olduğundan İslam adını silmək istəmir. O, İslama əməl etmir, İslamı sevmir və ona ürək yandırmır. Dayanmadan üfunətli su axıdıb ətrafı bulaşdıran bir bulaq kimi, onun vücudundan da bütün İslam cəmiyyətinə üfunət seli axır. Fəsad içində olan hakim belədir. Hakim zirvədə durduğundan onun əməlləri həmin yerdə

qalmır, adi camaatın əksinə olaraq, axır və hər yeri bürüyür. Cəmiyyətdə daha uca mövqeyə malik olanın fəsadı və zərəri daha çox olur. Adi insanların fəsadı özlərinə, yaxud bəzi ətraflarına zərər yetirir, başda oturanın fəsadı isə hamıya. Həmçinin saleh insan olsa, yaxşı işləri də hər şeyə təsir edir. Belə fəsadlara malik olan şəxs Müaviyədən sonra müsəlmanların xəlifəsi – Peyğəmbərin (s) canişini olmuşdur. !?Bundan böyük sapqınlıq ola bilərmi

Şərait də münasibdir. Şəraitin münasib olması nə deməkdir? Yəni təhlükə yoxdur? Xeyr! Təhlükə var. Məgər hakimiyyətin başında duran şəxsin öz müxaliflərinə təhlükəsi olmaya bilər?! Hər halda, bu bir döyüşdür. Siz onu taxtdan salmaq istəyirsinizsə, o oturub tamaşa edəcək?! Bəllidir ki, o da sizə zərbə vuracaq. Deməli, təhlükə var. Şəraitin münasib olmasının mənası budur ki, İslam cəmiyyəti İmam Hüseynin (ə) sözünün o zaman və tarix boyu insanlara çatmasını mümkün etsin. Əgər İmam Hüseyn (ə) Müaviyənin dövründə qiyam etsəydi, onun məqsədi və mesajı dəfn olunardı. Bu, Müaviyənin dövründəki şəraitə görədir. Siyasət elə idi ki, insanlar haqq sözün haqlılığını eşidə bilmirdilər. Buna görə, o həzrət Müaviyənin xəlifə olduğu on ildə də imam idi, amma şəraitin münasib olmadığına görə bir söz demədi, bir iş görmədi və qiyam etmədi. Ondan öncə İmam Həsən (ə) vardı, o da şəraitin münasib olmadığına görə qiyam etmədi. Bu o demək deyil ki, İmam Hüseyn (ə) və İmam Həsən (ə) bu işə uyğun deyildilər. İmam Həsənlə (ə) İmam Hüseynin (ə), İmam Hüseynlə (ə) İmam Səccadın (ə), İmam Əli ən-Nəqinin (ə) və İmam Həsən Əsgərinin (ə) fərqi yoxdur. Təbii ki, bu mübarizəni aparmaq baxımından o həzrətin məqamı digərlərindən üstündür, amma onlar imamət məqamı baxımından eynidirlər. Bu şərait onların hansının dövründə yaransaydı, eyni işi görər və eyni məqama nail olardılar. Bəli, İmam Hüseyn (ə) də belə bir vəziyyət qarşısında qalmışdı. Deməli, bu vəzifəni yerinə yetirməli idi; şərait münasibdir və heç bir üzr yoxdur. Odur ki, Abdullah ibn Cəfər, Məhəmməd

ibn Hənəfiyyə və Abdullah ibn Abbas – bunlar avam deyildilər, hamısı dinşünas, alim və ağıllı insanlar idilər – İmam Hüseynə (ə) “ağa, təhlükəlidir, getməyin” – dedikdə bildirmək istəyirdilər ki, vəzifəni yerinə yetirmək üçün təhlükə yarandıqda o vəzifə boyundan düşür. Onlar anlamırdılar ki, bu vəzifə təhlükəyə görə boyundan düşən vəzifə deyil. Bu vəzifə həmişə təhlükəlidir. Ola bilərmi insan zahirən elə iqtidarlı bir hakimiyyətin əleyhinə qiyam etsin və təhlükə olmasın?! Məgər belə bir şey .mümkündür?! Bu vəzifə həmişə təhlükəlidir

İmam Hüseynin (ə) dövründə görülən işin kiçik forması bizim imamımızın dövründə görüldü. Lakin orada şəhadətlə nəticələndi, burada isə hakimiyyətlə. Bu da odur, fərqi yoxdur. İmam Hüseynin (ə) məqsədi bizim böyük imamımızın məqsədi ilə bir idi. Bu məsələ Hüseyn (ə) təlimlərinin əsasıdır. Hüseyn (ə) təlimləri Şiə təlimlərinin böyük bir .hissəsini təşkil edir. Bu mühüm şərt və İslam təməllərindən biridir

Deməli, məqsəd İslam cəmiyyətini düzgün xəttə qaytarmaqdan ibarət idi. Nə zaman? Yolun dəyişildiyi, kimlərinsə cəhalətinin, zülmünün, istibdadının və xəyanətinin müsəlmanları yoldan çıxardığı və şəraitin də münasib olduğu zaman. Tarixin dövrləri fərqlidir. Bəzən əlverişli şərait olur, bəzən yox. İmam Hüseynin (ə) zamanında var idi; bizim zamanımızda da var idi. İmam Xomeyni də həmin işi gördü. Məqsəd bir idi. Lakin insan bu məqsəd uğrunda çalışanda, İslamı, İslam cəmiyyətini və İslam quruluşunu özünün düzgün mövqeyinə qaytarmaq üçün batil hökumətin və mərkəzin əleyhinə qiyam edəndə bəzən hakimiyyətə gəlir, bəzən də bu qiyam hakimiyyətlə deyil, şəhadətlə nəticələnir. Bəs bu zaman vacib olmur? Niyə ki?! Şəhid edilsə də, vacibdir. Şəhid edilsə, daha qiyamın faydası yoxdur? Niyə ki?! Əsla fərq etmir. Bu qiyam hər iki halda faydalıdır; istər şəhadətlə nəticələnsin, istər hakimiyyətlə. Lakin bunların hər .birinin bir növ faydası var. Hər halda, işi görmək və hərəkət etmək lazımdır

İmam Hüseyn (ə) bu işi görən birinci adam idi. Ondan öncə bu iş görülməmişdi. Çünki ondan qabaq – Peyğəmbərin (s) və Əmirəlmömininin (ə) dövründə belə bir vəziyyət yaranmamışdı. Bəzi hallarda yaranmışdısa da, şərait münasib olmamışdı. İmam Hüseynin (ə) dövründə isə hər ikisi vardı. Aşura hərəkatında əsas məsələ budur. Deməli, qısa şəkildə deyə bilərik ki, İmam Hüseyn (ə) İslam quruluşunu və cəmiyyətini yeniləməkdən, yaxud İslam cəmiyyətində yaranmış böyük yayınmalar qarşısında qiyam etməkdən ibarət olan böyük vacib əməli yerinə yetirmək üçün qiyam etdi. Onun yolu qiyam, yaxşı işlərə dəvət etmək və pis işlərdən çəkindirmək, hətta bu vacib əməl üçün böyük bir nümunədir. Bu iş bəzən hakimiyyətə gəlməklə nəticələnir, bəzən də şəhadətlə. İmam Hüseyn (ə) bunların hər ikisinə hazır idi. Bəs biz hansı dəlilə əsasən ?bu sözü deyirik

Biz İmam Hüseynin (ə) öz sözlərindən bu nəticəyə gəlirik. Mən həzrət Əbu Abdullahın (ə) sözlərindən bir neçəsini seçmişəm. Bu məzmunu çatdıran sözləri isə daha çoxdur. Mədinə şəhərinin hakimi Vəlid gecə vaxtı imamı çağırıb dedi ki, Müaviyə dünyadan köçmüşdür, siz Yezidə beyət etməlisiniz. Həzrət ona buyurdu ki, qalsın sabaha, gedək fikirləşək, görək biz xəlifə olmalıyıq, yoxsa Yezid? Ertəsi gün Mərvan imamı Mədinənin küçələrində görüb dedi ki, Əbu Abdullah, sən özünü ölümə verirsən, nə üçün xəlifəyə beyət etmirsən? Gəl beyət et, özünü ölümə atma, əziyyətə salma. Həzrət onun cavabında bu cümləni buyurdu: "Biz Allahınıq və Allaha sarı qayıdacağıq. Yezid kimi birisi ümmətin hakimi olacaqsa, İslamla vidalaşmaq lazımdır".(۱)Söhbət Yezidin özündən getmir, onun kimi kim olursa-olsun. Həzrət demək istəyir ki, indiyədək nə oldusa, dözüləsi idi, lakin indi söhbət İslam dininin və quruluşunun özündən gedir. Bu, Yezid kimi birisinin hakimiyyəti ilə məhv olacaq. O, sapqınlıq



---

Bihar əl-ənvar", c. ۴۴, səh. ۳۲۵-۳۲۶[۹۴] -۱

təhlükəsinin ciddi təhlükə olduğuna işarə vurur. Məsələ İslamın özü üçün təhlükədən .ibarətdir

Həzrət Əbu Abdullah (ə) həm Mədinədən, həm də Məkkədən xaric olanda qardaşı Məhəmməd ibn Hənəfiyyə ilə söhbət etmişdir. Məncə bu vəsiyyətnamə Məkkə görüşünə aiddir. Məhəmməd ibn Hənəfiyyə zilhiccə ayında Məkkəyə gəlmişdi. Həzrət orada qardaşına bir vəsiyyətnamə yazdı. Orada Allahın birliyinə və digər məsələlərə şəhadətdən sonra deyilir: "Mən nə azğınlığa, nə təkəbbürlülüyə, nə də fəsad və zülm törətməyə görə qiyam edirəm". Yəni kimlərsə səhvən düşünməsin, təbliğatçılar şayiə yaymasınlar ki, Hüseyn (ə) də hakimiyyəti ələ keçirmək, özünü göstərmək, eyş-işrət, zülm və fəsad üçün qiyam edən şəxslər kimi mübarizəyə və döyüşə gedir. Bizim işimiz bu tipdən deyil. Bu işin adı islah etməkdir. Bu, İmam Hüseyndən (ə) öncə görülməyən vacib əməldir. Bu islah qiyam yolu ilə baş verir. Xüruc - qiyam deməkdir. Həzrət bu vəsiyyətnamədə bunu qeyd edir. Yəni əvvəla qiyam etmək istəyirik və bizim bu qiyamımız da islah üçündür, mütləq hakimiyyətə gəlmək, yaxud şəhid olmaq üçün deyil. Xeyr! Biz islah etmək, düzəltmək istəyirik. Əlbəttə, islah etmək kiçik iş deyil. Bəzən şərait elə olur ki, insan hakimiyyətə gəlir və özü işləri idarə edir, bəzən də bu işi görə bilmir, mümkün olmur və şəhid olur. Eyni zamanda bunların hər ikisi islah üçün qiyamdır. Sonra buyurur: "Mənim bu hərəkətdə məqsədim cəddimin ümmətini islah etmək, yaxşı işlərə dəvət və pis işlərdən çəkindirməkdir. Mən cəddimin və atamın yolu ilə getmək istəyirəm".(۱) Bu islah yaxşı işlərə dəvət etməyin və pis işlərdən .çəkindirməyin real nümunəsidir

İmam Məkkədə iki məktub yazmışdır: biri Bəsrə şəhərinin, biri də Kufə şəhərinin böyüklərinə. Həzrət Bəsrə böyüklərinə yazdığı məktubda deyir ki, mən bidəti ortadan götürmək və sünnəni dirçəltmək istəyirəm, çünki sünnəni öldürmüş və bidəti dirçəltmişlər. Mənim arxamca gəlsəniz, dorğu yola



---

.Yenə orada, səh: ۳۲۹ [۹۵] -۱

qovuşarsınız. Yəni mən İslamı, Peyğəmbər (s) sünnəsini və İslam quruluşunu diriltməkdən ibarət olan böyük vəzifəni yerinə yetirmək istəyirəm.(۱) Kufə əhalisinə yazdığı məktubda isə buyurdu ki, İslam cəmiyyətinin imamı, rəhbəri və başçısı günah, xəyanət, fəsad sahibi və Allahdan uzaq bir şəxs ola bilməz. O, Allahın kitabına əməl edən adam olmalıdır; yəni cəmiyyətdə buna əməl etməlidir, nəinki özü xəlvət bir otaqda yalnız namaz qılsın. O, kitaba əməl etməyi cəmiyyətdə dirçəltməli, ədaləti bərqərar etməli, haqqı cəmiyyətdə qanuna çevirməlidir. Yəni haqq dini cəmiyyətin qayda-qanunu etməli, batili kənara qoymalı, nəyin bahasına olursa-olsun, özünü Allahın doğru yolunda qorumalı, maddi və şeytani gözəlliklərin əsiri olmamalıdır. .Vəssəlam.(۲) Görürük ki, burada məqsədi müəyyən edir

İmam Hüseyn (ə) Məkkədən xaric oldu. Onun yolda hər bir mənzildə müxtəlif məzmunlu söhbətləri qeyd olunmuşdur. İmam hara gedirsə, Hürr ibn Yezid də onunla birgə hərəkət edirdi. Onlar Beyzə adlı bir yerə çatdılar. Bəlkə də istirahətdən öncə, yaxud bir qədər istirahət edəndən sonra ayağa qalxıb düşmən ordusuna müraciətlə buyurdu: "Ey insanlar həqiqətən Allahın rəsulu (s) buyurmuşdur: "Kim Allahın haramını halal edən, Allahın əhdini pozan, Peyğəmbər (s) sünnəsinə qarşı çıxan, Allahın bəndələri ilə günah və ədavətlə davranan zalım bir hökmdarla üzləşsə, əməli və ya sözü ilə ona etiraz etməsə, Allahın haqqıdır ki, bu şəxsi də o zalımı daxil etdiyi yerə (cəhənnəmə) daxil etsin".(۳) Yəni Allah-Taala bu sakit, laqeyd və passiv şəxsi qiyamətdə o zalımı düçar etdiyi taleyə düçar edəcək, onunla bir sıraya və bir cinaha qoyacaq. Qabaqca qeyd etdi ki, bu məsələnin hökmünü Peyğəmbər (s) buyurmuşdur. Bu qeyd etdiyimiz nümunələrdən biridir. Peyğəmbər (s) İslam quruluşunun yoldan yayındığı təqdirdə



---

۱- [۹۶] Bihar əl-ənvar, c. ۴۴, səh: ۳۴۰.

۲- [۹۷] Yenə orada, səh: ۳۳۴.

۳- [۹۸] Yenə orada, səh: ۳۸۲.

nə etməyin lazım olduğunu müəyyənləşdirmişdi. İmam Hüseyn (ə) də Peyğəmbərin (s) .həmin sözünə istinad edir

Bəs vəzifə nədir? Vəzifə sözlə və əməllə vəziyyəti dəyişdirməkdir. İnsan belə bir vəziyyəti gördükdə və sözsüz ki, şərait münasib olsa, bu əməlin qarşısında qiyam etmək və addım atmaq vacibdir; nəticə nə olursa-olsun; öldürülsün, sağ qalsın, zahirən uğur qazansın, yaxud qazanmasın. Bu vəziyyətin qarşısında qalan hər bir müsəlman qiyam etməlidir. Bu, Peyğəmbərin (s) buyurduğu vəzifədir. Sonra İmam Hüseyn (ə) buyurdu ki, mən bu qiyama və bu işə bütün müsəlmanlardan daha layiqəm;(۱) çünki mən Peyğəmbər (s) oğluyam. Əgər Peyğəmbər (s) bu dəyişdirmə işini bütün müsəlmanlara vacib etmişdirsə, bəllidir ki, Peyğəmbər (s) oğlu, Peyğəmbər (s) elminin və hikmətinin varisi olan Hüseyn ibn Əliyə (ə) digərlərindən daha vacib və daha uyğundur. Buyurur ki, və mən bunun üçün hərəkət etdim. İmam burada da öz .qiyamının səbəbini bəyan edir

Dörd nəfərin İmam Hüseynə (ə) qoşulduğu Əzyəd mənzilində buyurdu ki, and olsun Allaha, mən Allahın bizim vasitəmizlə istədiyi xeyri arzulayıram; istər öldürülək, istər zəfər çalaq.(۲) Yəni istər qələbə çalsınlar, istər öldürülsünlər, fərqi yoxdur, vəzifə vəzifədir və icra olunmalıdır. Buyurdu ki, mən Allah-Taalanın bizim üçün nəzərdə tutduğunun xeyrimizə olduğuna ümidvaram; istər öldürülək, istər qələbə çalaq, fərqi yoxdur. Biz vəzifəmizi yerinə yetiririk. Kərbəla torpağına daxil olandan sonra birinci çıxışında isə belə buyurdu: “Görmürsünüz ki, daha haqqa əməl olunmur və batildən (çəkinilmir?!...(۳

İmam Hüseyn (ə) bir vacib əməli yerinə yetirmək üçün qiyam etdi. Bu vacib əməl tarix boyu müsəlmanların hər birinə aiddir. İslam quruluşunun köklü bir fəsada düçar



---

.Yenə orada [۹۹] -۱

.Əyan əş-Şiə, c. ۱, səh: ۵۹۷ [۱۰۰] -۲

.Bihar əl-ənvar, c. ۴۴, səh: ۳۸۱ [۱۰۱] -۳

olduğunu və İslam hökmlərinin bütünlüklə təhrif ehtimalını gördükdə hər bir müsəlman qiyam etməlidir; sözsüz ki, münasib şəraitdə, yəni bu qiyamın təsir bağışlayacağı bilindiyi zaman. Sağ qalmaq, öldürülməmək və əziyyət görməmək şərt deyil. Bunlar şərtlərdən sayılmır. İmam Hüseyn (ə) buna görə qiyam etdi və bu vacib (əməli yerinə yetirdi ki, hamıya dərs olsun. (۱۹۹۵

Hüseyn ibn Əli (ə) öz işi ilə xalqın vicdanını oyatdı. İmam Hüseynin (ə) şəhadətindən sonra çoxsaylı qiyamlar baş verdi. Düzdür, onlar yatırıldılar, amma mühüm olan bir hərəkətin düşmən tərəfindən yatırılması deyil. Bu acıdır, amma ondan da acı olan budur ki, bir cəmiyyət düşmən qarşısında heç bir reaksiya verməyəcək həddə çatsın. .Bu, çox təhlükəlidir

Hüseyn ibn Əli (ə) elə bir iş gördü ki, bütün tağut dövrlərində, erkən İslam çağından uzaq olsalar da, zalım və azğın rejimə qarşı mübarizə iradəsi İmam Həsən Müctəbanın (ə) dövründəki müsəlmanlardan çox olan insanlar peyda oldular. Mədinə xalqının Hərrə qiyamından tutmuş sonrakı hadisələrə, Təvvabin və Muxtar qiyamlarına, Bəni-Üməyyə və Bəni-Abbas dövrünə qədər xalqların daxilində ardıcıl qiyamlar baş verdi. Bu qiyamları kim yaratdı? Hüseyn ibn Əli (ə). Əgər İmam Hüseyn (ə) qiyam etməsəydi, passivlik və məsuliyyətdən boyun qaçırmaq hissi zülmə qarşı barışmazlıq və məsuliyyət hissinə çevrilərdimi?! Nə üçün deyirik ki, məsuliyyət hissi ölmüşdü? Ona görə ki, İmam Hüseyn (ə) İslam böyüklərinin övladlarının yaşadığı Mədinədən Məkkəyə getdi. Abbasın, Zübeyrin, Ömərin, İslamın ilk xəlifələrinin övladları Mədinəyə toplaşmışdılar, amma onların heç biri həmin qanlı və tarixi qiyamda İmam Hüseynə (ə) kömək etmədi. İmam Hüseynin (ə) qiyamı başlanmazdan öncəyə qədər aparıcı adamlar addım atmağa hazır deyildilər. İmam Hüseynin (ə) qiyamından sonra isə bu ruhiyyə canlandı. Bu, digər dərslərlə yanaşı Aşura qiyamından öyrənməli olduğumuz .böyük dərsdir. Hadisənin əzəməti bundadır

Doğulmasından öncə yer və göy o həzrət üçün ağladı.(۱) Bu böyük matəmə görə Hüseyn ibn Əlini (ə) yada saldılar, ona əza saxladılar, ağladılar. Bu ona görədir. Odur ki, siz bu gün İslamın Hüseyn ibn Əli (ə) tərəfindən dirildiyini düşünür və onu İslamın (keşikçisi sayırsınız. (۱۹۹۳



---

.Yenə orada, səh: ۳۴۷ [۱۰۲] -۱

## Zeynəb–Kübra qəhrəmanlığı

Zeynəb-Kübra böyük bir qadındır. Bu böyük qadının İslam xalqlarının gözündə olan əzəməti nədəndir? Demək olmaz ki, Əli ibn Əbu Talibin (ə) qızı, yaxud Hüseynin (ə) və Həsənin (ə) bacısı olduğuna görədir. Qohumluq heç zaman belə əzəmət yarada bilməz. Bizim bütün imamlarımızın bacıları, anaları və qızları olmuşdur. Amma Zeynəb-Kübra kimi birisi hanı?! Zeynəb-Kübranın dəyəri və əzəməti, onun ilahi vəzifəsinə əsaslanan möhtəşəm insani və dini mövqeyinə, hərəkətinə görədir. Onun işi, qərarı və hərəkət tərzi onu belə böyütdü. Kim belə bir iş görsə, Əmirəlmömininin (ə) qızı olmasa da, böyüyər. Bu böyüklüyün əsas səbəbi odur ki, əvvəla, mövqeyi tanıdı; həm İmam Hüseynin (ə) Kərbəlaya getməsindən qabaqkı mövqeyi, həm Aşura gününün böhranlı anlarını, həm də İmam Hüseynin (ə) şəhidliyindən sonrakı ağır hadisələr mövqeyini. İkincisi də budur ki, hər mövqeyə uyğun seçim etdi. Və bu seçimlər Zeynəbi yetişdirdi.

Kərbəlaya doğru hərəkətdən qabaq İbn Abbas, İbn Cəfər və erkən İslam çağının elm, şücaət və ağalıq iddiasında olan bəzi məşhur şəxsiyyətləri çaşıb qaldılar, nə iş görməli olduqlarını anlamadılar. Zeynəb-Kübra isə çaşmadı, anladı ki, bu yolu getməli, öz imamını tənha qoymamalıdır və getdi. O bu işin çətinliyini anlayır, digərlərindən daha yaxşı hiss edirdi. O bir qadın idi – üzərinə düşən vəzifədən ötrü həyat yoldaşından və ailəsindən ayrılan bir qadın. Məhz buna görə özünün azyaşlı uşaqlarını da özü ilə apardı. O, hadisənin necə olacağını duyurdu. Ən güclü insanların nə etməli olduqlarını dərk etmədikləri gərgin saatlarda o anladı, öz imamına dayaq oldu, onu şəhid olmaq üçün hazırladı. Hüseyn ibn Əlinin (ə) şəhidliyindən sonra da dünya zülmətə qərq oldu. Ürəklər, canlar, dünyanın üfüqləri qaraldı. Bu böyük qadın isə o zaman

bir nur olub parladı. Zeynəb elə bir yerə çatdı ki, yalnız bəşəriyyət tarixinin ən üstün (insanları, yəni peyğəmbərlər oraya çata bilərdilər. (١٩٩١

Zeynəb olmasaydı, Kərbəla hadisəsi Kərbəla ola bilməzdi; Zeynəb olmasaydı, Aşura unudulmaz tarixi hadisəyə çevrilməzdi. Bu hadisənin əvvəlindən sonuna qədər Əli (ə) qızının rolu elə əhəmiyyətli və böyükdür ki, insan onun qadın və Əli (ə) qızı formasında ikinci bir Hüseyn olduğunu düşünür. Həm də Zeynəb olmasaydı, Aşuradan sonra nə baş verərdi? Bəlkə İmam Səccad (ə) da öldürülərdi və İmam Hüseynin (ə) sözü heç kimə çatmazdı. İmam Hüseynin (ə) şəhadətindən öncə Zeynəb sadiq bir dost kimi idi, imam onunla birgə olanda yalqızlıq və yorğunluq hiss etmirdi. İnsan Zeynəbin .simasında, söz və hərəkətlərində belə bir rol müşahidə edir

Zeynəb iki dəfə iztirab keçirdi və bunu İmam Hüseynə (ə) dedi. Bir dəfə dayandıqları mənzillərin birində cənab Müslimin şəhadət xəbərindən sonra İmam Hüseyn (ə) bəzi sözlər dedi və müxtəlif xəbərlər verdi. Həzrət Zeynəb hər halda həssas və zərif hisslərə malik bir qadındır. Peyğəmbər (s) ailəsi möhkəm, qüdrətli, şücaətli və dözümlü olması ilə yanaşı, həm də insani zərifliyin və mərhəmətin timsalıdır. Mən İmam Hüseyndən (ə) misal vurum. Bir dünya müxalif, bir səhra ac canavar qarşısında yalqız müqavimət göstərən və qorxmayan bu insan bəzi xırda məsələlər qarşısında çox təsirlənir. Misal üçün, həbəşəli qara qul torpaq üzərinə düşəndə imam onun başı üzərinə gəldi. Bəli, Əhli-beyti sevən qara bir quldur. O dövrün ictimai vəziyyətinə və mədəniyyətinə görə, Əbuzərin qulu olan Conun bəlkə də müsəlmanlar arasında çox da hörməti və dəyərli yeri yox idi. Kərbəlada çoxları öldürüldülər; Kufə zadəganları, Həbib ibn Məzahir, Züheyr ibn Qeyn kimi böyük və tanınmış şəxsiyyətlər İmam Hüseynin (ə) kənarında şəhid oldular, torpağa düşdülər, amma həzrət bu qulun şəhadətində olduğu kimi reaksiya vermədi. Müslim ibn Övsəcəyə müraciətlə

buyurdu ki, inşallah Allahdan əcr alarsan. Amma heç kimi, ailə və övladı olmayan bu qara qul öldürüləndə Hüseyn ibn Əli (ə) Əli Əkbərin şəhadəti zamanı gördüyü işi gördü. Qulun başı üzərində oturdu, onun qanlı başını dizi üzərinə qoydu, amma ürəyi sakitləşmədi. Bir də gördülər İmam Hüseyn (ə) əyilib üzünü bu qara qulun üzünə qoydu. Belə güclü insani hisslər! Bu baxımdan, Zeynəb güclü emosiyalara malik olan adi bir qadın yox, həm də İmam Hüseynin (ə) bacısı və ona eşq bəsləyən bir şəxsdir. O, həyat yoldaşını və ailəsini tərk edib İmam Hüseynlə (ə) gəldi; həm də yalqız gəlmədi, oğulları Övn və Məhəmmədi də gətirdi. Mən ehtimal verirəm ki, Abdullah ibn Cəfər oğullarının gəlməsinə razı deyildi. Abdullahın razı olmasına əmin deyiləm, amma Zeynəb onları gətirdi ki, öz yanında və Allah yolunda fədakarlıq lazım olsa, şəhid olsunlar. İndi yoldakı mənzillərin birində təhlükə hiss edib İmam Hüseynə (ə) dedi ki, qardaş, mən təhlükə hiss edirəm. Bilir ki, şəhadət və əsirlik ehtimalı var, amma eyni zamanda hadisələrin həyəcanı onu o qədər sıxır ki, İmam Hüseynə (ə) müraciət edir. Burada İmam Hüseyn (ə) ona çox söz demədi, buyurdu ki, bir şey deyil, Allahın istədiyi olacaq. Bu məzmunda bir söz dedi.(۱) Bundan sonra Aşura gecəsinə qədər biz Zeynəb-Kübranın İmam Hüseynə (ə) bir söz dediyini, nə isə soruşduğunu, yaxud qəlbində .keçirdiyi sıxıntını İmam Hüseynə (ə) bildirdiyini görmürük

Aşura axşamı Zeynəb-Kübranın qəm-qüssə zamanıdır. O zaman xəstə olan İmam Səccad (ə) deyir ki, mən çadırda uzanmışdım. Bibim Zeynəb yanımda oturub mənə qulluq edirdi. Yanaşı çadırda da atam Hüseyn (ə) oturmuşdu və Əbuzərin qulu Con onun xəncərini təmir edirdi. Onlar özlərini sabahkı döyüşə hazırlayırdılar. Deyir ki, birdən atam bəzi şeirlər zümzümə etməyə başladı. Şeirlərin məzmunu belə idi ki, (dünya üz çevirib, ömür vəfa etməyəcək və ölüm yaxındır.(۲



---

.Əl-Kafi, c. ۲, səh: ۵۳۰ [۱۰۳] -۱

.Bihar əl-ənvar, c. ۴۴, səh: ۳۱۶ [۱۰۴] -۲

Tezliklə dünyadan köçəcəyinə əmin olan adam belə şeirlər oxuyur. İmam Səccad (ə) deyir ki, mən bu şeiri eşidib mesajı aldım; başa düşdüm ki, İmam Hüseyn (ə) öz ölüm xəbərini verir, amma özümü saxladım. Birdən baxıb gördüm ki, bibim Zeynəb çox narahatdır. O qalxıb qardaşının çadırına getdi, dedi ki, qardaş, biz indiyədək sənə arxayın idik, sənsə ölüm xəbərini verirsən! Atamız dünyadan köçəndən dedik ki, qardaşlarımız var. Qardaşım Həsən (ə) şəhadətə qovuşanda dedim ki, qardaşım Hüseyn (ə) var. İllərlə sənə güvənmişəm, amma bu gün görürəm ki, özünün ölüm .xəbərini verirsən

Təbii ki, Zeynəb-Kübranın narahat olmağa haqqı vardı. Mən güman edirəm ki, o zaman Zeynəb üçün yaranmış vəziyyət müstəsna bir vəziyyət idi. Qadınların heç birinin, hətta İmam Səccadın (ə) vəziyyətini də Zeynəbin vəziyyəti ilə müqayisə edə bilmərik. Zeynəbin vəziyyəti olduqca ağır və dözülməz idi. Bütün kişilər Aşura günü şəhid oldular. Aşura günü axşamüstü bütün düşərgədə yataqda xəstə yatan, bəlkə də huşsuz halda olan İmam Səccaddan (ə) başqa bir kişi də yox idi. Görün bir sürü düşmənin mühasirəsində qalan ۸۰-۸۴ qadın və uşağın nə qədər problemi olar; bəziləri susuzdur, bəziləri ac; əslində demək olar ki, hamı susuz və acdır, hamı qorxur. Şəhidlərin hamısının cəsədləri yerə səpələnib; kimisi bunların qardaşıdır, kimisi övladı. Hər halda, çox acı və dəhşətli bir səhnədir. Bir nəfər bu insanları idarə etməlidir. Və .həmin bir nəfər Zeynəbdir

Zeynəb yalnız qardaşını, iki övladını, digər qardaşlarını, çoxlu əzizini, ۱۸ Bəni-Haşim gəncini və vəfalı səhabələri əldən verən bir şəxs deyildi. Bundan əlavə, əhəmiyyəti bundan az olmayan bir məsələ də bu idi ki, məğlub olmuş, səpələnmiş bu düşərgənin bu qədər düşmən arasında idarəsi və mühafizəsindən ibarət ağır məsuliyyət onun üzərinə düşürdü. Hətta İmam Səccadı (ə) da o idarə etməli idi. Hadisədən sonrakı bir neçə saatda, hərəkət edib gedənə, düşmənlərin bunlarla nə edəcəyi bəlli olana qədər, -qaranlıq, zülmət və ağır bir gecənin də daxil olduğu bu bir neçə saatda Zeynəb

Kübranın nə çəkdiyini bir Allah bilir. Zeynəb bu bir neçə saatda daim çalışır, kiçik uşaqların, qadınların, müsibət görmüş anaların, qardaşını itirmiş bacıların yanına qaçır, daim insanlar arasında hərəkət edir, onları bir yerə toplayır, onlara ürək-dirək verir. Birdən Zeynəbin taqəti tükənir, şəhid qardaşına üz tutur, onunla danışır. Onun yeganə dayağı o idi. Rəvayətdə deyilir ki, Zeynəb-Kübra qardaşının parça-parça edilmiş cəsədi yanında dayanıb ürəkdən fəryad qopardı: Ey Məhəmməd! Göyün mələklərinin salamı (olsun sənə! Qanına bələşmiş bu adam Hüseyndir!(١) (١٩٨۴

Demişlər ki, Aşurada və Kərbəla hadisəsində qan xəncərə qalib oldu. Həqiqətən belədir və bu qələbənin səbəbkarı həzrət Zeynəbdir. Əks təqdirdə, qan Kərbəlada bitdi; Aşura meydanında haqq qüvvələrinin zahiri məğlubiyyəti ilə qanlı toqquşma başa çatdı. Bu zahiri hərbi məğlubiyyətin qəti və daimi bir qələbəyə çevirlməsinə səbəb olan amil Zeynəb-Kübranın missiyası, üzərinə götürdüyü rol idi. Bu çox mühüm məsələdir. Bu hadisə göstərdi ki, qadın tarixi hadisələrdə kənar və ikinci dərəcəli qüvvə deyil, mühüm tarixi hadisələrin içindədir. Quran da çoxlu yerlərdə bu məsələyə toxunur. Lakin bu, yaxın tarixə aiddir, canlı və hiss olunan bir hadisədir, keçmiş ümmətlərə aid deyil. Burada Zeynəb-Kübra çox əzəmətli şəkildə müşahidə olunur. Onun fəaliyyəti nəticəsində döyüşdə qalib gəlib müxaliflərini qılıncdan keçirən və qələbə taxtında əyləşən düşmən öz iqamətgahında, şah sarayında təhqir edildi, rəzil oldu. Zeynəb onun alnına əbədi həqarət damğası vurdu və qələbəsini məğlubiyyətə çevirdi. Bu, Zeynəb-Kübranın roludur. Zeynəb göstərdi ki, qadın hicabını və iffətini .mübarizə şərəfinə və böyük bir cihada çevirmək olar

Zeynəb-Kübranın bizə çatan sözləri onun hərəkətinin əzəmətini göstərir. Zeynəb-Kübranın Kufə bazarındakı unudulmaz çıxışı adi söhbət, böyük bir şəxsiyyətin adi fikir



---

.Seyid ibn Tavus. Lühuf, səh: ١٣٣ [١٠۵] -١

bildirməsi deyil. O dövrdə İslam cəmiyyətinin vəziyyətinə dair ən gözəl sözlərlə bəyan olunmuş ən dərin məzmunlu, zəngin və möhtəşəm bir təhlildir. Şəxsiyyətin gücünə .baxın. Bu şəxsiyyət nə qədər güclüdür

İki gün öncə onun qardaşını, imamını, rəhbərini bütün əzizləri, gəncləri və övladları ilə birgə məhv etmişlər. Bu qədər qadını və uşağı əsir edib xalqın qarşısına çıxarmış, əsir kimi dəvələrə mindirmiş və camaata göstərmişlər; bəziləri sevincdən atılıb-düşür, bəziləri də ağlayırlar. Belə ağır şəraitdə birdən-birə bu əzəmət günəşi doğur. Atası Əlinin (ə) xəlifə ikən öz xalqı qarşısında danışdığı tərzdə danışır; eyni sözlərlə, eyni fəsahət və bəlağətlə, eyni uca məzmunla: Ey Kufə əhalisi! Ey xəyanətkarlar, yalançılar! İslam və Əhli-beyt davamçısı olduğunuza bəlkə özünüz də inanmışdınız, amma sınaqdan keçmədiniz, imtahan zamanı korluq göstərdiniz. Sizin rəftarınız diliniz və qəlbinizlə eyni deyildi. Özünüzlə qürur duydunuz, elə bildiniz imanınız var, hələ də inqilabçı və Əli (ə) davamçısısınız, halbuki belə deyil. Siz imtahandan keçib özünüzü xilas edə bilmədiniz. Yunu əyirib sapa çevirən, sonra sapı yenidən yuna və ya pambığa çevirən insana bənzəyirsiniz. Siz avamlığınızla, şəraiti tanımamanızla, haqq və batili ayırd etməmənizlə öz əməllərinizi və keçmişinizi puç etdiniz. Zahiriniz imanlı, ağzınız inqilab iddiaları ilə doludur, əslində isə puç və müxalif küləklər qarşısında (müqavimətsizsiniz.(١

O, elə çətin şəraitdə belə güclü nitq söylədi. Həzrət Zeynəbin önündə bir qrup dinləyici oturub onu dinləmirdi ki, o da bir natiq kimi çıxış etsin. Xeyr! Düşmən yaraqlıları onun ətrafını sarmışdılar və orada müxtəlif hallarda olan əhali vardı. Müslimi İbn Ziyada təhvil verən, İmam Hüseynə (ə) məktub yazıb sonradan sözünün üstündə durmayan, İbn Ziyadla vuruşanda evlərində gizlənən adamlar Kufə bazarına



---

.Bihar əl-ənvar, c. ۴۵, səh: ١٠٩ [١٠۶] -١

toplaşmışdılar. Bəziləri də zəiflik göstərənlər idi. Onlar Əli (ə) qızına baxır və .ağlayırdılar

Həzrət Zeynəb-Kübra belə qarışıq və etimadsız insanlar qarşısında bu şəkildə möhkəm danışır. O, tarixin qadınıdır. Bu qadın zəif deyil. Qadını zəif adlandırmaq olmaz. Mömin bir qadın ağır şəraitdə özünü belə göstərir. Bu qadın dünyanın bütün böyük kişiləri və qadınları üçün örnəkdir. O, Peyğəmbər (s) və Əli (ə) inqilablarının zəif cəhətlərini izah edir. Deyir ki, siz fitnə və imtahan zamanı haqqı ayırd edə və vəzifənizi yerinə yetirə bilmədiniz. Nəticədə Peyğəmbər (s) ciyərparəsinin başı nizələrə taxıldı. (Zeynəbin əzəmətini bundan dərk etmək olar. (۲۰۱۰

**Əsirlik zamanı İmam Səccadın (ə) rolu**

Şiələrə və imamət xəttinə bağlı olanlara görə, Aşuradan sonrakı vəziyyət qəribə idi. Əməvi muzdurlarının vəhşiliyi, onların istər Kərbəlada, istər Kufədə, istərsə də Şamda Peyğəmbər (s) ailəsi ilə rəftarı imamət xəttinin bütün tərəfdarlarını qorxutdu. Əlbəttə, bilirsiniz ki, İmam Hüseynin (ə) seçilmiş səhabələri Aşura hadisəsində, ya da Təvvabin qiyamında şəhadətə qovuşdular. Qalanlarda da zalım Yezid və sonra Mərvan hakimiyyəti qarşısında öz haqq sözlərini demək cəsarəti yox idi. Dağınıq, təşkilatsız, qorxmuş və əslində əməldə imamət yolundan dönmüş mömin bir qrup - Şiə cinahından İmam Səccada (ə) çatan irs bundan ibarət idi. Güclü repressiya vardı, imamın yardımçı qüvvələri də olduqca zəif idi. İmam Səccad (ə) ideoloji, həqiqi və ortodoks İslamı qorumaq üçün bir mübarizəyə başlamalı, bu dağınıqları toplamalı, onları əsl İslam hakimiyyət modeli olan Əli (ə) hakimiyyətinə yaxınlaşdırmalı idi. İmam Səccad (ə) ۳۴ il bu şəraitdə çalışdı. Mən burada sizin üçün İmam Səccadın (ə) həyatının yalnız mühüm hissələrini söyləyəcəyəm. Dördüncü imamın həyatının ilk uğurlu hissəsi onun əsirlik çağıdır. Dördüncü imam iki dəfə əsir alınmış və zəncirlənərək Şama aparılmışdır. Birinci dəfə Kərbəladan aparıldı, ikinci dəfə isə

Əbdülməlik ibn Mərvanın hakimiyyəti dövründə Mədinədən. Kərbəladan əsir karvanında Şama aparılanda İmam Səccad (ə) Quran və İslam təcəssümü idi. Şəhidlərin qətlə yetirildiyi andan Əli ibn Hüseynin (ə) qəhrəmanlığı başlandı. Azyaşlı qızlar, kiçik uşaqlar və kimsəsiz qadınlar İmam Səccadın (ə) ətrafını sardılar. O karvanda heç bir kişi yox idi. İmam Səccad (ə) onların hamısına rəhbərlik etdi, onları topladı və Şama çatana qədər yol boyu iman bağı ilə bir-birinə bağlanmış bu qrupun zəiflik göstərməsinə qoymadı. Kufəyə daxil oldular. Übeydullah ibn Ziyad əmr etmişdi ki, bu ailənin bütün kişilərini qətlə yetirsinlər. Gördü ki, əsir karvanında bir kişi var. Soruşdu ki, kimsən? Dedi ki, mən Əli ibn Hüseynəm (ə). Onu ölümlə hədələdi. Burada imamət, mənəviyyat və rəhbərliyin ilk işığı göründü: Məni öldürməkləmi hədələyirsən?!(١) Halbuki şəhadət bizim üçün şərəfdir; biz Allah yolunda öldürülməklə fəxr edir, ölümdən qorxmuruq. Übeydullah ibn Ziyad rejimi bu müqavimət qarşısında .geri çəkildi

İmam Səccad (ə) bütün əsirlərlə birgə Şamda günlərlə ağır vəziyyətdə saxlandı. Sonra fikirləşdilər ki, onu məscidə aparıb insanların qarşısında psixoloji baxımdan zəiflətsinlər. İmam Səccad (ə) həmin məclisdə üzünü Yezidə tutub dedi ki, icazə versən, mən də bu taxtaların üstünə çıxıb danışmaq istəyirəm. Yezid düşünmürdü ki, prinsipcə bu müddətdə kifayət qədər psixoloji sarsıntılar keçirmiş xəstə və əsir bir gənc onun üçün təhlükəli ola bilər. Buna görə də icazə verdi. İmam Səccad (ə) minbərə çıxıb Əməvi dövlətinin paytaxtında imamətin fəlsəfəsini, şəhadət məsələsini və bu hakimiyyətin tağut xislətini izah etdi, Şam əhalisini ayağa qaldıracaq bir çıxış etdi. İmam Səccad (ə) elə böyük şəxsiyyətdir ki, Übeydullah ibn Ziyaddan, aldanmış izdihamlı Şam əhalisindən, Əməvi rejimindən və Yezid məmurlarından qorxmur, haqqı ,deyir



---

.Yenə orada, səh: ١١٨ [١٠٧]-١

(maarifləndirmə aparır və həyat onun üçün əhəmiyyət kəsb etmir. (۱۹۸۰

İmam Səccad (ə) əsir və xəstə halda böyük bir qəhrəman kimi sözü və əməli ilə tarix yazır. Bu dövrdə imamın vəziyyəti onun həyatının əsas hissəsi ilə tam fərqlənir. Əsas hissədə imam mülayim, düşünülmüş, sakit və fundamental işlər görür. Bəzən hətta Əbdülməlik ibn Mərvanla bir məclisdə oturur, onunla adi və yumşaq rəftar edir. Bu dövrdə isə imamı ən kiçik sözə dözməyən, güclü düşmənlərinə hamının gözü önündə .sərt cavablar verən fəal bir inqilabçı kimi görürsünüz

Kufədə xəncərindən qan daman, Peyğəmbər (s) övladını öldürdüyünə görə məst olmuş qaniçən bir vəhşi - Übeydullah ibn Ziyadın qarşısında elə danışdı ki, Übeydullah onun qətlinə fərman verdi. Həzrət Zeynəb özünü irəliyə atıb dedi ki, onu öldürmənizə imkan verməərəm. Gördülər ki, bundan ötrü bir qadını da öldürməlidirlər və digər tərəfdən, bunları əsir kimi Şama aparmaq lazımdır. Buna görə əl çəkdilər. Əgər belə .olmasaydı, böyük ehtimalla İmam Səccadı (ə) da öldürərdilər

Kufə bazarında bibisi Zeynəb və bacısı Səkinə ilə birgə söhbət edir, xalqı oyadır və .həqiqətləri bəyan edir

Şamda istər Yezidin qurduğu məclisdə, istərsə də məsciddə xalq qarşısında ən aydın sözlərlə həqiqətləri söyləyir. Bu söhbət və çıxışlar Əhli-beytin xilafətə haqlı olduğuna, hakim rejimin cinayətlərinin ifşasına, həmin avam və qafil xalqa acı və təsirli .xəbərdarlıqlara dair fikirləri ehtiva edir

Burada o xütbəni söyləməyə və onun dərin məzmununu açıqlamağa lüzum yoxdur. Bu xüsusi bir mövzudur. Onu şərh etmək istəyən şəxs hər bir sözünü araşdırmalı və bu əsaslara diqqət yetirməlidir. Qəhrəmanlıq göstərdiyi əsirlik çağında İmam Səccadın (ə) .vəziyyəti belə idi

Belə bir sual var ki, İmam Səccad (ə) əsirlikdə sərt və açıq işlər gördüyü halda əsirlikdən sonra nə üçün mülayim üsullardan və təqiyyədən istifadə etdi, inqilabi və radikal hərəkətləri dua ilə və mülayim işlərlə əvəzlədi? Cavab budur ki, bu dövr müstəsna dövr idi. Burada İmam Səccad (ə) imam

olmasından, gələcəkdə İslam hakimiyyətinə zəmin yaratmalı olmasından əlavə, həm də Aşurada tökülən qanların sözçüsüdür. İmam Səccad (ə) burada əslində özü deyil, İmam Hüseynin (ə) Şamda və Kufədə danışan dilidir. İmam Səccad (ə) orada məsələləri belə sərt, kəsərli və açıq-aşkar bəyan etməsəydi, onun gələcək fəaliyyətinə şərait də yaranmazdı. Onun gələcək fəaliyyətinə zəmin yaradan amil Hüseyn ibn Əlinin (ə) qanı idi. Necə ki, tarix boyu bütün Şiə qiyamlarına zəmin yaradan amil Hüseyn ibn Əlinin (ə) qanı oldu. Əvvəlcə xalqa xəbərdarlıq etməli və bu xəbərdarlığın fonunda özünün prinsipial, dərin, güclü və uzunmüddətli müxalifətinə başlamalıdır. Bu xəbərdarlıq da belə sərt və kəsərli sözlərdən başqa yolla mümkün .deyil

Bu səfərdə İmam Səccadın (ə) rolu həzrət Zeynəb rolu idi, Hüseyn (ə) inqilabının mesajını çatdırırdı. İnsanlar Hüseynin (ə) nə üçün və necə öldürüldüyünü bildikdə İslamın və Əhli-beyt dəvətinin gələcəyi bir cür olardı, bilmədikdə isə başqa cür. Buna əsasən, xalqın məlumatlanması və bu məlumatın cəmiyyət səviyyəsində genişlənməsi üçün hər şeydən istifadə etmək və mümkün olan həddə bu işi görmək lazım idi. Bu baxımdan, İmam Səccad (ə) Səkinə, Fatimeyi-Suğra, Zeynəbin özü və əsirlərin hər biri kimi bir təbliğatçıdır. Bütün bu qüvvələr toplanmalıdır ki, İmam Hüseynin (ə) qürbətdə tökülmüş qanını böyük İslam dünyasının bütün bölgələrinə aparsınlar, Kərbəladan Mədinəyədək hər yerə çatdırsınlar, Mədinəyə daxil olanda xalqın önündə həqiqətləri bəyan etsinlər. Bu birinci addımdır. Odur ki, İmam Səccadın (ə) həyatının bu qısa dönəmi müstəsna dönəmdir. Sonrakı dönəm isə onun Mədinədə möhtərəm bir vətəndaş kimi yaşadığı, Peyğəmbərin (s) evində və ailəsi arasında fəaliyyət göstərdiyi zaman başlayır. Dördüncü imamın proqramlarını aydınlaşdırmaq üçün onun yaşadığı (dövrün vəziyyət və şəraitini araşdırmağa ehtiyac var. (İslamın keşikçisi, say: ۶

səh:۱۳۷

Aşura xəbərləri yayılandan sonra xüsusən Hicaz və İraqda şiələri və imamların tərəfdarlarını qorxu və vahimə bürüdü. Məlum oldu ki, Yezid öz hakimiyyətini möhkəmlətmək üçün Peyğəmbərin (s) övladı olan və bütün İslam dünyasında çox hörmətli və müqəddəs sayılan Hüseyn ibn Əlini (ə) öldürməyə də razı olmuşdur. Təsirləri Kufə və Mədinədə görünən bu qorxu bir müddət sonra bir neçə başqa hadisə ilə tamamlandı. O hadisələrin biri Hərrə hadisəsi idi. Bundan sonra Əhli-beytin nüfuzu olan bölgədə - Hicazda xüsusən Mədinədə, İraqda da xüsusən Kufədə güclü repressiya dalğası başladı, əlaqələr zəiflədi, imamların tərəfdarı və Bəni-Üməyyə .xilafətinin potensial müxalifləri qorxuya düşdülər

İmam Sadiq (ə) özündən öncəki imamların vəziyyəti haqda danışarkən buyurur ki, İmam Hüseyndən (ə) sonra üç nəfərdən, bir rəvayətə görə beş nəfərdən və bəzi rəvayətlərə görə yeddi nəfərdən başqa hamı dindən döndü. Əbu Ömər Mehdinin nəql etdiyi bir hədisdə isə İmam Səccad (ə) buyurur ki, Məkkə və Mədinədə bizi sevən iyirmi nəfər yoxdur.(۱) Bu iki hədisi ona görə söylədim ki, İslam dünyasının imamlara və onların tərəfdarlarına qarşı ümumi vəziyyəti aydın olsun. Yəni repressiya belə bir vəziyyət yaratdı, imamların tərəfdarları dağılışdılar, məyus oldular, qorxdular və ümumi bir iş görmək imkanını itirdilər. Əlbəttə, İmam Sadiqin (ə) hədisində bu da deyilir ki, sonra tədricən birləşdilər və çoxaldılar.(۲) Əgər bu məsələni bir qədər geniş şəkildə söyləmək istəsək, belə deməliyik: İmam Hüseynin (ə) şəhadətindən sonra insanlar bir qədər qorxdular, lakin bu qorxu Əhli-beyt tərəfdarlarının təşkilati birliyini tamamilə məhv edəcək həddə deyildi. Dəlili də budur ki, hətta Kərbəla əsirlərini Kufəyə gətirdikləri zaman



---

.Yenə orada, c. ۴۶, səh: ۱۴۳; İbn Əbil-Hədid. Şərh Nəhcül-bəlağə, c. ۴, səh: ۱۰۴ [۱۰۸] -۱

.Bihar əl-ənvar, c. ۴۶, səh: ۱۴۴ [۱۰۹] -۲

.Şiə təşkilatının varlığından xəbər verən bəzi hərəkətlər müşahidə olundu

Sözsüz ki, məxfi Şiə təşkilatı dedikdə məqsədimiz bu gün mövcud olan tam mütəşəkkil təşkilatlar kimi bir şey deyil, məqsəd insanları bir-birinə bağlayan, fədakarlığa vadar edən, gizli işlərə həvəsləndirən və nəticədə insanın beynində bir fikir formalaşdıran .eqitadi əlaqələrdir

Peyğəmbər (s) ailəsinin Kufədə olduğu gecələrin birində onların saxlandığı yerə daş atılır. Daşı götürüb ona bir kağız bağlandığını görürlər. Həmin kağızda belə yazılmışdı: Kufə hakimi sizin taleyiniz haqda əmr almaq üçün Yezidin yanına adam göndərmişdir. Əgər sabah axşama qədər, misal üçün, təkbir səsi eşitsəniz, bilin ki, burada öldürüləcəksiniz; eşitməsəniz, bilin ki, vəziyyət yaxşı olacaq.(١) Biz bu əhvalatdan bilirik ki, İbn Ziyadın adamları arasında imamların dostlarından və bu təşkilatın üzvlərindən kimsə var imiş. O, hadisələrdən xəbərdar imiş, zindana əli girirmiş, məhbuslara dair planlardan məlumatlı imiş və bu xəbəri təkbir səsi ilə Əhli-beytə çatdıra biləcəkmiş. .Yaradılan qorxu və şiddətlə yanaşı belə şeylər də görünür

Başqa bir nümunə kor kişi olan Abdullah ibn Əfif Əzdidir. Əsirlər Kufəyə gətiriləndə etirazını bildirir və nəticədə şəhid edilir. İstər Şamda, istər Kufədə əsirlərə hörmət və sevgi bildirən, onları göz yaşları ilə qarşılayan, yaxud buna görə bir-birini qınayan belə insanlar tapılırdı. Yezidin və İbn Ziyadın təşkil etdiyi məclislərdə də belə hadisələr baş .vermişdir

Buna əsasən, bu hadisə səbəbindən güclü qorxu yaransa da, Əhli-beyt dostlarının iş sistemini tamamilə çökdürüb onları pərakəndə salacaq və zəif duruma düşürəcək həddə deyildi. Lakin bir müddətdən sonra başqa hadisələr də baş verdi və bu hadisələr repressiyanı artırdı. Buradan başa düşmək olar ki, Hüseyndən (ə) sonra insanlar dindən döndülər hədisi həmin hadisələrin baş verdiyi, yaxud onlardan sonrakı dövrə .aiddir



---

.Bu əhvalatı İbn Əsir özünün əl-Kamil fit-tarix kitabında yazmışdır [١١٠] -١

Bu bir neçə illik dövrdə, həmin mühüm və güclü hadisə baş verməzdən öncə şiələr işlərini sahmana salmağa və qabaqkı mütəşəkkilliklərini bərpa etməyə çalışırdılar. Təbəri bu barədə yazır ki, onlar - yəni şiələr silah toplayır, özlərini döyüşə hazırlayırdılar.(۱) Onlar şiə və qeyri-şiələri Hüseyn ibn Əlinin (ə) intiqamını almağa çağırır, insanlar da dəstə-dəstə onlara qoşulurdular. Bu vəziyyət Yezid ibn Müaviyənin vəfatına qədər davam etdi.

Görürük ki, şiddət və repressiya güclü olsa da, Təbərinin yazdığına əsasən, eyni zamanda bu işlər də görülürdü. Cihad əş-Şiə kitabının müəllifi şiə və İmam Səccada (ə) qarşı yaxşı fikirdə olmasa da, bəlkə də bu səbəbdən bir həqiqəti dərk etmişdir. O yazır: Şiələr Hüseynin (ə) şəhadətindən sonra etiqad və siyasi baxışların birləşdirdiyi, qrup və rəhbərlərə, həmçinin hərbi qüvvələrə malik olan mütəşəkkil bir təşkilata çevrildilər. Təvvabin (tövbə edənlər) qrupu bu təşkilatın ilk nümunəsidir.

Deməli, Şiə təşkilatı Aşura hadisəsinə görə zəifləsə də, bunun kənarında hərəkət və fəaliyyət də vardı və həmin təşkilatı yenidən bərpa etməyə çalışırdılar. Amma bu zaman Hərrə hadisəsi baş verdi. Mənim fikrimcə, Hərrə hadisəsi Şiə tarixində ona böyük zərbə vuran çox ciddi bir dönəmdir.

Hərrə hadisəsi hicrətin ۶۳-cü ilində baş vermişdir. Hadisənin xülasəsi belədir: ۶۲-ci ildə Bəni-Üməyyədən olan təcrübəsiz bir gənc Mədinəyə vali təyin edildi. O, Mədinə şiələrinin könlünü almaq üçün onların bəzisini Yezidlə görüşə dəvət etdi və onları bu səfərə yolladı. Əksərən həzrət Səccadı (ə) sevənlərdən ibarət olan bəzi tanınmış müsəlmanları, səhabələri və Mədinə şəhərinin böyüklərini Şam səyahətinə dəvət etdi. Fikirləşdi ki, gedib Yezidlə görüşsünlər və kin-küdurət azalsın. Bunlar Şama gedib Yezidlə görüşdülər, bir neçə gün ona qonaq oldular. Sonra Yezid onların hər birinə ۵۰-۱۰۰ min dirhəm arası bəxşişlər verib Mədinəyə yola saldı.



---

۱- [۱۱۱] Təbəri, c. ۵, səh: ۵۵۸.

Onlar Şam sarayında baş verənləri gördüklərinə görə Mədinəyə çatan kimi Yezidi tənqid etməyə başladılar. Səfər tamamilə əks nəticə verdi. Bunlar Yezidi tərifləmək əvəzinə xalqı onun cinayətlərindən xəbərdar etdilər və dedilər ki, Yezid şərab içdiyi, itlərlə oynadığı və müxtəlif günahları etdiyi halda xəlifə ola bilməz, biz onu xilafətdən kənarlaşdırırıq. Peyğəmbər (s) səhabəsi və Ühüd şəhidi olan Hənzələnin oğlu, həmçinin Mədinənin hörmətli və şəxsiyyətli insanlarından olan Abdullah xalqın önündə Yezid əleyhinə qiyama qalxdı, Yezidin xilafətini tanımadığını söylədi və xalqı öz .rəhbərliyinə dəvət etdi

Bu hərəkət Yezidin reaksiyasına səbəb oldu. O, xalqı sakitləşdirmək üçün Bəni-Üməyyənin qoca və təcrübəli sərkərdələrindən biri olan Müslim ibn Üqbəni bir qoşunla Mədinəyə göndərdi. Müslim ibn Üqbə Mədinəyə gəlib xalqın müqavimətini qırmaq məqsədi ilə bir neçə gün şəhəri mühasirədə saxladı, sonra şəhərə daxil olub o qədər .zülm etdi, qətl və faciə törətdi ki, bu hadisə İslam tarixində nadir nümunələrdən sayılır

O, zülm və qırğınlarda o qədər həddi aşdı ki, bu hadisədən sonra onu israfkar adlandıraraq Müsrif (israfkar) ibn Üqbə çağırırdılar. Hərrə hadisəsinin faciələri çoxdur və mən onların hamısı haqda danışmaq istəmirəm. Bu qədər deyim ki, bu hadisə Əhli-beyt dostlarını və ardıcıllarını qorxudan ən böyük hadisə oldu, bəziləri Mədinədən qaçdılar, bəziləri öldürüldülər. Abdullah ibn Hənzələ kimi yaxşı Əhli-beyt tərəfdarları şəhid edildilər və yerləri boş qaldı. Bu xəbər bütün aləmə yayıldı, bəlli oldu ki, hökumət .bu hərəkətləri qətiyyətlə cavablayır və heç bir addıma icazə vermir

Şiələrin yatırılmasına və zəifliyinə səbəb olan başqa bir hadisə Muxtarın Kufədə şəhid .edilməsi və Əbdülməlik ibn Mərvanın bütün İslam dünyasına hakim olması idi

Yezidin ölümündən sonra bəzi xəlifələr hakimiyyətə gəldilər. Müaviyə ibn Yezid üç aydan artıq hakimiyyətdə qalmadı. Ondan sonra Mərvan ibn Həkəm iki il, yaxud bir

qədər az xəlifə oldu. Ondan sonra Əbdülməlik xilafət taxtına oturdu. O, Bəni-Üməyyənin ən bacarıqlı xəlifələrindən biridir. Onun haqqında deyiblər ki, xəlifələrin ən (qəddarı və ən iradəlisi olmuşdur.(١)

Əbdülməlik bütün İslam dünyasını ələ keçirib güclü qorxu və şiddətlə qüdrətli bir .hökumət yarada bildi

Əbdülməlikin dövlətə tam nəzarət etməsi üçün onun rəqibləri məhv edilməli idi. Şiələrin nümayəndəsi olan Muxtar ondan öncə Müsəb ibn Zübeyr tərəfindən öldürüldü. Amma Əbdülməlik Muxtar qiyamının və digər Şiə hərəkatlarının qalıqlarının da məhv edilməsini istəyirdi və bu işi gördü. O zaman şiəliyin əsas mərkəzlərindən biri (olan İraqda və xüsusən də Kufədə şiəlik passiv hala salındı. (İslamın keşikçisi say: ٨

ci illərdə Təvvabin qiyamı İraqın tutqun mühitində yeni ab-hava yaratsa da, -۶۴-۶۵ onların hamılıqla şəhid edilməsi Kufə və İraqda yenidən qorxunu artırdı. Əməvi rejiminin düşmənləri olan Muxtar və Müsəb ibn Zübeyr bir-biri ilə vuruşandan, Məkkəni ələ keçirmiş Abdullah ibn Zübeyr Əhli-beyt tərəfdarı olan Muxtara dözməyəndən və Muxtar Müsəb tərəfindən öldürüləndən sonra bu qorxu və vahimə bir az da artdı, ümidlər azaldı. Nəhayət, Əbdülməlik hakimiyyətə gələndə qısa müddətdən sonra bütün İslam dünyası Bəni-Üməyyənin güclü hakimiyyəti altına keçdi (və Əbdülməlik iyirmi bir il qüdrətlə hökmranlıq etdi. (١٩٨۶

Hər halda, bu hadisələr Aşura ilə başladı, Hərrə hadisəsi, İraqda Təvvabin qiyamının məhvi, Muxtarın, İbrahim ibn Malik Əjdər Nəxəinin və digər Şiə böyüklərinin şəhadəti ilə davam etdi. Bunların şəhidliyindən sonra şiəliyin iki əsas mərkəzi olan Mədinə və Kufədə azadlıq hərəkatları yatırıldı və İslam dünyasında şiəliyə qarşı güclü repressiya dalğası başladıldı. İmamların tərəfdarları son dərəcə qürbət və yalqızlıq içində qaldılar. ((İslamın keşikçisi, say: ٨

səh:١۴٢

---

.Ənsab əl-əşraf, c. ٧, səh: ٢٠٩ [١١٢]-١

Bu qorxunun kənarında başqa bir amil də meydana çıxdı. Bu amil bütün İslam dünyasında insanların düşüncə tənəzzülündən ibarət idi. Bu tənəzzül son iyirmi ildə din təlimlərinə qarşı diqqətsizlikdən irəli gəlirdi. İmam Əlinin (ə) vəfatından sonrakı iyirmi ildə din təlimləri, Quran təfsiri və İslam həqiqətləri diqqətdən kənarda qaldı, xalqın etiqadı və imanı çox zəiflədi. O dövrdə yaşayan insanların həyatını mikroskop altına qoyanda, müxtəlif tarix və rəvayətlərə baxanda bu aydın görünür. Düzdür, alimlər, qiraətçilər və hədisşünaslar vardı, onlar haqda da danışacağam, lakin ümumi xalq imansızlıq, zəiflik və güclü etiqadi pozuntular içərisində idi. Vəziyyət elə həddə çatmışdı ki, bəzi xilafət adamları nübüvvəti (peyğəmbərliyi) sual altına salırdılar. Kitablarda yazılanlara əsasən, Bəni-Üməyyənin olduqca səviyyəsiz və mənfur məmurlarından olan Xalid ibn Abdullah Qəsri deyirdi ki, xilafət nübüvvətdən üstündür. Buna dəlil də göstərirdi ki, sizin ailədə öz yerinizə canişin təyin etməniz yaxşıdır, yoxsa onlara elçi və qasid göndərməniz? Təbii ki, öz evinizdə qoyduğunuz şəxs sizin canişininiz, sizə daha yaxındır. Deməli, Allahın xəlifəsi onun elçisindən üstündür.(١) Onlar hətta Peyğəmbər .(s) xəlifəsi demirdilər, Allahın xəlifəsi deyirdilər

Digərləri də belə sözlər deyirdilər. Mən Bəni-Üməyyə dövrünün şeirlərinə baxanda Əbdülməlikin dövründən etibarən Allah xəlifəsi sözünün şeirlərdə çox təkrar olunduğunu gördüm; belə ki, insan xəlifənin Peyğəmbər (s) canişini olduğunu unudur. Bu, Abbasilərin hakimiyyətinə qədər davam etdi. Hətta xəlifəni pisləmək istəyəndə də Allahın xəlifəsi deyirdilər. O dövrün məşhur şairləri olan Cərir, Fərəzdəq, Kəsir və digər yüzlərlə məşhur və böyük şairin şeirlərində xəlifəni mədh edərkən Peyğəmbər (s) canişini deyil, Allah canişini sözü işlədilirdi. Bu bir nümunədir. Xalqın hətta dini əsaslara .qarşı etiqadı belə zəifləmişdi. İnsanların əxlaqı da çox pisləşmişdi



---

.Əl-Əxbar ət-tival, səh: ٣۴۶ [١١٣] -١

Mən Əbülfərəcin əl-Əğani kitabını mütaliə edərkən bir məqama diqqət yetirdim. O budur ki, təxminən yetmişinci illərdən başlayaraq ۵۰-۶۰ il sonraya qədər İslam dünyasının ən böyük xanəndə, musiqiçi və əyyaşları ya Mədinədəndirlər, ya da Məkkədən. Şamda oturmuş xəlifənin könlünə nə zaman musiqi düşsəydi, musiqiçi və xanəndə istəsəydi, onun üçün Mədinədən, yaxud Məkkədən məşhur müğənnilər göndərirdilər. Ən pis və ən pozğun şairlər Məkkə və Mədinədə idi. Peyğəmbər (s) vəhyinin nazil olduğu və İslamın doğulduğu yer fəsad və pozğunluq mərkəzinə çevrilmişdi. Bizim Məkkə və Mədinə haqda bunları bilməmiz yaxşıdır. Təəssüf ki, bunlar mövcud əsərlərdə yazılmayıb, amma bir reallıqdır. Mən fəsad və pozğunluğa dair bir .nümunə demək istəyirəm

Məkkədə Ömər ibn Əbu Rəbiə adlı bir şair vardı. O, pozğun və çılpaq şeirlər söyləyən şairlərdən idi. Ömər ibn Əbi Rəbiənin özü və onların Məkkədə nə iş görməsi uyğun dövrün kədərli tarixinin geniş bir hissəsini əhatə edir. Rəvayətçi nəql edir ki, bu şair öləndə Mədinədə ümumi matəm elan olunmuşdu və insanlar şəhərin küçələrində ağlayırdılar. Deyir haraya gedirdimsə, gənclər, qadın və kişilər Ömər ibn Əbi Rəbiənin öldüyünə görə heyfsilənirdilər. Gördüm ki, kiçik bir kəniz bir iş dalınca gedir; məsələn, bir vedrə götürüb su gətirməyə gedir, amma bu halda göz yaşı tökərək həmin şairin öldüyünə görə ağlayır və təəssüflənir. O, bir neçə gəncin yanından keçəndə dedilər ki, nə üçün bu qədər ağlayırsan? Dedi ki, bu kişinin öldüyünə və aramızdan getdiyinə görə. Biri dedi ki, kədərlənmə, Mədinədə başqa bir şair də var: Xalid ibn Məxzumi. O bir müddət Şam alimləri tərəfindən Məkkəyə hakim də təyin edilmişdi. O da Ömər ibn Əbu Rəbiə kimi pozğun və çılpaq şeirlər yazan şairlərdən idi. Həmin gənc sonra bu şairin şeirlərindən birini oxumağa başladı. Bu şeir əl-Əğani kitabında qeyd olunmuşdur. Kəniz bir qədər dinləyəndən sonra göz yaşlarını silib dedi ki, Allaha şükür

olsun, O Öz hərəmini boş qoymadı, biri getdisə, yerinə başqa birisi gəldi. Mədinə .əhalisinin əxlaqı bu vəziyyətdə idi

Siz Məkkə və Mədinənin gecə məclisləri haqda çoxlu əhvalatlar eşitmisiniz. Bunlar yalnız aşağı təbəqələrə məxsus deyil, hamıya aiddir. Şair və təlxək olan məşhur əş-Şəb Təmma kimi ac və zavallı dilənçi, adi küçə və bazar adamları, həmin kiçik kəniz və onun kimilər, eləcə də Qüreyşin və hətta Bəni-Haşimin adını çəkmək istəmədiyim məşhur şəxslərinin övladları, Qüreyş gənclərindən olan məşhur şəxslər, qadın və kişilər bu pozğunluğa qərq olmuşdular. Sözügedən Məxzuminin əmirliyi dövründə onun sevdiyi Aişə bint Təlhə təvaf edirdi. Azan veriləndə xanım xəbər göndərdi ki, de azan verməsinlər və mən təvafımı bitirim. O əmr etdi ki, əsr azanı verilməsin. Ona etiraz etdilər ki, sən nə üçün təvaf edən bir qadından ötrü xalqın namazını gecikdirirsən? Dedi ki, Allaha and olsun, əgər sabaha qədər təvafını uzatsa da, azan (verməyə qoymayacağam. O zaman vəziyyət belə idi. (۱۹۸۶

səh:۱۴۵

**İşarə**

İmam Səccad (ə) haqda danışmaq və yazmaq çətindir. Çünki insanların bu böyük imamla tanışlığına şərait çox əlverişsizdir. Əksər tarixçi və təhlilçilər elə bilirlər ki, bu imam bir tərəfdə oturub ibadətlə məşğul olmuş və siyasətə qarışmamışdır. Bəziləri bunu açıqca söyləmişlər, açıq söyləməyənlərin də qənaəti bundan başqa bir şey .olmamışdır. Bunu imama verilən ləqəblərdən və deyilən sözlərdən də anlamaq olar

Bəzi adamlar ona Xəstə ləqəbi verirlər, halbuki onun xəstəliyi Aşura hadisəsinin baş verdiyi bir neçə günü əhatə edirdi, ondan sonra davam etmədi. Hər bir adam ömründə bir neçə gün xəstələnə bilər. Baxmayaraq ki, bu imamın xəstəliyi ilahi məsləhət üçün olmuşdur. Məqsəd bu idi ki, həmin gün Allah yolunda müdafiə və cihad vəzifəsi onun üzərinə düşməsin və gələcəkdə ağır əmanət olan imamət yükünü götürsün, atasından ۳۵, yaxud ۳۴ il sonraya qədər yaşasın və Şiə məzhəbinin ən çətin dövründə ona .rəhbərlik etsin

Siz İmam Səccadın (ə) həyat sərgüzəştlərinə baxsanız, çoxlu diqqətəlayiq və maraqlı hadisələr görərsiniz. Bizim digər imamlarımızın həyatı da belədir. Lakin siz bunların hamısını bir yerə toplasanız da, İmam Səccadın (ə) həyatını öyrənə bilməzsiniz. Hər bir kəsin əsl həyatı o zaman aydın olar ki, biz onun ümumi istiqamətini bilək və sonra onun həyatının ayrı-ayrı hadisələrini araşdıraq. Bu ümumi istiqamət bilinsə, ayrı-ayrı hadisələr də mənasını tapar. Ümumi istiqamət bilinmədikdə, yaxud səhv bilindikdə isə ayrı-ayrı hadisələr də mənasız olar, yaxud səhv başa düşülər. Bu prinsip yalnız İmam .Səccada (ə) və digər imamlara məxsus deyil, hamının həyatında keçərlidir

İmam Səccadın (ə) Məhəmməd ibn Şahab Zöhriyə məktubu onun həyatından bir nümunədir. Bu, Peyğəmbər (s) ailəsinə mənsub bir şəxsin dövrün bir məşhur aliminə məktubudur. Bu barədə müxtəlif fikirlər irəli sürmək olar: bu məktub köklü və

geniş bir mübarizənin bir hissəsi, yaxud sadəcə pis işlərdən çəkindirmə və yaxud bir nəfərin başqa birisinə etirazı sayıla bilər. Öz-özlüyündə və o dövrün digər hadisələrini nəzərə almadan bu məktublaşmadan bir şey anlamaq olmaz. Demək istəyirəm ki, hər hansı hadisəni imamın həyatındakı ümumi istiqamətdən ayırsaq, onun bioqrafiyası .anlaşılmaz. Mühüm olan budur ki, biz ümumi istiqaməti diqqətdə saxlayaq

Bizim ilk mövzumuz İmam Səccadın (ə) həyatdakı ümumi istiqaməti haqdadır. Bunu o həzrətin öz sözlərindən və həyatından faktlarla, eləcə də imamların həyatına dair .ümumi qənaətlə xatırladacaq və izah edəcəyəm

Bizim fikrimizcə, İmam Həsənin (ə) qırxıncı ildə həyata keçən sülhündən sonra Peyğəmbər (s) Əhli-beyti evdə oturub yalnız ilahi hökmləri başa düşdükləri kimi bəyan etməklə qane olmadılar. Sülhün əvvəlindən bütün imamların proqramı bu idi ki, nəzərdu tutduqları şəkildə İslam hakimiyyəti qurmaq üçün fəaliyyət göstərsinlər. Bunu .İmam Müctəbanın (ə) həyatında və sözlərində aydın şəkildə görürük

İmam Həsənin (ə) işi köklü, çox dərin və fundamental iş idi. İmam Həsən (ə) on il belə yaşadı. O bu müddətdə öz ətrafına bəzi qüvvələr topladı və yetişdirdi. Bəzi adamlar müəyyən yerlərdə öz şəhadətləri, öz etirazları ilə Müaviyə rejiminə qarşı çıxdılar və .nəticədə onu zəiflətdilər

Ondan sonra növbə İmam Hüseynə (ə) çatdı. O həzrət də Mədinədə, Məkkədə və digər yerlərdə eyni üsulu davam etdirdi. Nəhayət, Müaviyə dünyadan köçdü və Kərbəla hadisəsi baş verdi. Kərbəla hadisəsi İslamın gələcəyi üçün çox faydalı və səmərəli qiyam olsa da, hər halda, İmam Həsənin (ə) və İmam Hüseynin (ə) izlədiyi məqsədi gecikdirdi. Çünki xalqı qorxudub İmam Həsənin (ə) və İmam Hüseynin (ə) yaxın ətrafını məhv etdilər, hakimiyyətlərini möhkəmlətdilər. Bu təbii şəkildə baş verdi. Əgər İmam Hüseynin (ə) qiyamı bu formada olmasaydı, güman ki, ondan sonra və ona yaxın gələcəkdə Şiə hakimiyyətinə şərait yaranardı. Bu o demək deyil ki, İmam Hüseyn (ə) qiyam etməməli idi. Əslində şəraitə səh:۱۴۷

görə həmin vaxt İmam Hüseynin (ə) qiyamı mütləq baş verməli idi. Bunda heç bir şübhə yoxdur. Lakin o şərait olmasaydı və İmam Hüseyn (ə) şəhid edilməsəydi, böyük .ehtimalla İmam Həsənin (ə) nəzərdə tutduğu gələcək tezliklə həyata keçərdi

İmamlar bu xətti və məqsədi izləyir, həmişə İslam hakimiyyəti qurmağa çalışırdılar. İmam Səccadın (ə) fəaliyyəti əslində İmam Hüseyn (ə) Kərbəlada şəhid ediləndən və o, xəstə vəziyyətdə əsir aparılandan başlandı. Əgər o zamana qədər İmam Həsən (ə) və İmam Hüseyn (ə) sözügedən gələcəyi təmin etməli idilərsə, o zamandan İmam .Səccad (ə) vəzifəsinə başlamalı oldu və sonra da digər imamlar

Buna əsasən, biz İmam Səccadın (ə) bütün həyatında bu ümumi məqsədi və əsas xətti axtarmalı, mütləq bilməliyik ki, İmam Səccad İmam Həsən (ə) və İmam Hüseynin (ə) .nəzərdə tutduğu amalı həyata keçirmək istəyirdi

İmam Səccad (ə) hicri tarixi ilə ۶۱-ci ilin aşurasında imamətə çatdı, ۹۴-cü ildə də zəhərlədilərək şəhid edildi. O həzrət bütün bu müddətdə həmin məqsədi izlədi. İndi bu baxışla İmam Səccadın (ə) gördüyü işləri araşdırın. Görün hansı mərhələləri keçdi, hansı taktikalardan istifadə etdi və hansı nailiyyətləri əldə etdi. O həzrətin bütün cümlələrini, hərəkətlərini, Səhifeyi-Səccadiyyədə toplanmış dualarını, münacatlarını və raz-niyazlarını həmin ümumi xəttə və həmçinin imamət müddətində müxtəlif :qüvvələrə qarşı tutduğu müxtəlif mövqelərə əsasən izah etmək olar

Übeydullah ibn Ziyadın və Yezidin qarşısında çox şücaətli və fədakar mövqe - ۱ ;seçməsinə

Yezid hakimiyyətinin üçüncü ilində və Yezidin əmri ilə Mədinəni dağıdıb xalqın - ۲ mallarını qarət edən Müsrif ibn Üqbənin qarşısında çox yumşaq və mülayim mövqe ;seçməsinə

Ən güclü və ən ağıllı Əməvi xəlifəsi olan Əbdülməlik ibn Mərvan qarşısında bəzən - ۳ ;sərt, bəzən isə mülayim mövqe seçməsinə

۴- Ömər ibn Əbdüləzizlə rəftarına;

۵- İmamın səhabələri və dostları ilə rəftarına və dostlarına verdiyi tövsiyələrə;

۶- Saraya və zalım hakimlərə bağlı alimlərlə rəftarına.

Bütün bu hərəkət və rəftarları diqqətlə araşdırmaq lazımdır. Mənim qənaətim budur ki, bu ümumi xətt diqqətdə saxlansa, hər bir hərəkət və hadisə çox dəqiq və səlis məna kəsb edər. Əgər İmam Səccadın (ə) həyatını belə araşdırsaq, o həzrətin yer üzündə Allah hakimiyyətini həyata keçirməkdən və İslamı reallaşdırmaqdan ibarət olan müqəddəs məqsəd yolunda bütün səyindən istifadə edən, ən peşəkar və ən təsirli fəaliyyətlə məşğul olan, Aşura hadisəsindən sonra tükənmək üzrə olan İslam karvanını nəzərəçarpacaq həddə inkişaf etdirən, iki böyük və əsas məsuliyyəti – bu haqda danışacaq və deyəcəyik ki, bizim imamlarımız onların hər ikisini üzərlərinə götürmüşdülər - həyata keçirmiş, işlərdə siyasət, şücaət, diqqət və zərifliyə əməl etmiş bir insan olduğunu bilərik. O, tarixin bütün peyğəmbərləri və uğurlu insanları kimi ۳۵ il yorulmaz mübarizədən və missiyasını yerinə yetirəndən sonra şərəflə dünyadan köçdü və məsuliyyəti özündən sonrakı imama - İmam Baqirə (ə) tapşırdı. İmamətin və yer üzündə Allah hakimiyyətini qurmaqdan ibarət olan böyük vəzifənin İmam Baqirə (ə) tapşırılması hədislərdə aydın şəkildə göstərilmişdir. Rəvayətdə deyilir ki, İmam Səccad (ə) övladlarını toplayandan sonra Məhəmməd ibn Əliyə, yəni İmam Baqirə (ə) buyurdu ki, bu sandığı və silahı götür, bunlar sənə əmanətdir. Sandığı açdıqda isə içində Quranın və bir kitabın olduğunu gördülər.

Məncə o silah siyasi rəhbərliyin, kitab isə ideoloji və düşüncə rəhbərliyinin rəmzidir. İmam onu özündən sonrakı imama təhvil verib rahatlıqla, arxayınlıqla, Allah-Taalanın və ayıq insanların qarşısında çox başıuca halda dünya ilə vidalaşdı. İmam Səccadın (ə) həyatının ümumi təsviri bu idi. (İslamın keşikçisi, say: ۶)

İmam Səccadın (ə) dövrü çoxlu çətinliklərlə başlayır. Kərbəla hadisəsi Şiə mərkəzlərində və hətta İslam dünyasının

hər bir yerində güclü bir təkan yaratdı. Qətl, təqib, işgəncə və zülm əvvəllər də vardı, amma Peyğəmbər (s) oğlunu öldürmək, Peyğəmbər (s) ailəsini əsir tutmaq, şəhər-şəhər gəzdirmək, Zəhra (ə) əzizinin - Peyğəmbərin (s) onu necə öpdüyünü görənlər hələ də vardı - başını nizəyə taxmaq İslam dünyasını heyrətə saldı. Heç kəs vəziyyətin bu həddə çatacağına inanmazdı. Əgər həzrət Zeynəbə aid edilən bir şeir düzgün olsa, sözügedən məzmunu çatdırır və bu hal bütün xalqa aiddir. Qəfildən siyasətin dəyişdiyi, şiddətin güman edildiyindən artıq olduğu hiss olundu, təsəvvüredilməz məsələlər həyata keçdi. Buna görə, Kufə istisna olmaqla bütün İslam dünyasını güclü qorxu bürüdü. Kufə yalnız Təvvabin qrupunun və sonra Muxtarın sayəsində bundan uzaq qaldı. Kərbəla hadisəsindən irəli gələn qorxu Mədinədə, digər yerlərdə, hətta bir qədər sonra Abdullah ibn Zübeyrin qiyam etdiyi Məkkədə də vardı. İslam dünyasında misilsiz .bir qorxu hökm sürürdü

Siyasi fəsad da başqa bir amildir. Böyük şəxsiyyətlərin əksəri hökumət adamları tərəfindən təmin olunan maddi arzularla yaşayırdılar. Bir zaman İmam Səccadın (ə) şagirdi olmuş Məhəmməd ibn Şahab Zöhri kimi böyük bir şəxsiyyət saraya bağlı idi. İmam Səccadın (ə) Məhəmməd ibn Şahab Zöhriyə, əslində isə bütün tarixə məşhur məktubu "Tühəf əl-üqul" kitabında və digər əsərlərdə qeyd olunmuşdur. Bu məktub böyük şəxsiyyətlərin asılılıqlarını göstərir. Məhəmməd ibn Şahab kimilər çox idi. Mərhum Məclisi Bihar kitabında güman ki, Cabir ibn Abdullah olan Cabir adlı birindən İmam Səccadın (ə) bir cümləsini nəql edir: "Bilmirik ki, camaatla nə edək; onlara Allah rəsulundan eşitdiyimiz sözləri deyəndə gülürlər, sakit duranda da özümüz əziyyət çəkirik" (۱) Sonra bir əhvalat danışır: imam bir dəstə adama bir hədis söyləyirdi, onların arasından bir nəfər istehza ilə hədisi qəbul etmədi. Daha sonra Səid ibn Museyib və Zöhrinin yanlış



---

.Bihar əl-ənvar", c. ۶, səh. ۲۵۹[۱۱۴] -۱

yolda olduqlarını deyir. Əlbəttə, mən Səid ibn Museyibin belə olduğunu qəbul etmirəm, çünki onun imamın yaxın ətrafından olmasına dair dəlillər var. Zöhri və bir çoxları isə belə olmuşlar. İbn Əbilhədid sonra o dövrdə Əhli-beytdən uzaqlaşan çoxlu .şəxsiyyətlərin adlarını çəkir

Xalqın dini, əxlaqı islah olunmalı, xalq fəsad batlağından çıxmalı, dinin məğzi və ruhu olan mənəvi istiqamət cəmiyyətdə yenidən dirçəlməli idi. Buna görə siz İmam Səccadın (ə) zahidliyə geniş yer verdiyini görürsünüz: Dünyaya meylsiz və axirətə rəğbətli olanların əlaməti...(١) Bu, geniş bir söhbətin bağlanğıcıdır. Bu söhbətdə də bəzi .məsələlərə və qeyd etdiyimiz məqsədlərə işarə var

İmam Səccadın (ə) sözlərinin çoxu zahidlik haqdadır, dua formasında söylənmiş İslam təlimləridir. Qeyd etdiyimiz kimi, o dövrdə olan repressiya və əlverişsiz durum İmam Səccadın (ə) insanlarla açıq danışmasına imkan vermirdi. Maneə isə yalnız hakim qüvvələr deyildi, xalq da istəmirdi. O cəmiyyət ümumiyyətlə fəsad dolu zay bir cəmiyyət idi, yenidən qurulmalı idi. ٦١-ci ildən ٩٥-ci ilə qədər sürən ٣٤-٣٥ ildə İmam Səccadın (ə) həyatı belə keçdi. Əlbəttə, zaman ötdükcə vəziyyət yaxşılaşdı. Çünki İmam Sadiq (ə) Hüseyndən (ə) sonra insanlar dindən döndülər hədisinin davamında deyir ki, sonradan gəldilər və çoxaldılar. Biz görürük ki, həqiqətən belədir. İmam Baqirin (ə) dövründə artıq vəziyyət dəyişmişdi. Bu, İmam Səccadın (ə) ٣٥ illik (zəhmətlərinin səmərəsi idi. (١٩٨٦

Bəzən düşünürlər ki, İmam Səccad (ə) Bəni-Üməyyə hakimiyyətinə qarşı çıxmaq istəsəydi, o da qiyama qalxmalı, yaxud Muxtara və ya Abdullah ibn Hənzələyə qoşulmalı, onlara rəhbərlik etməli və açıq silahlı mübarizə aparmalı idi. Həzrət Səccadın (ə) dövrünün vəziyyətini nəzərə alanda isə bu təfəkkürün imamların .məqsədinə əsasən yanlış olduğunu anlamaq olar



---

.Bihar əl-ənvar, c. ٧٥, səh: ١٢٨ [١١٥] -١

İmamlar, o cümlədən İmam Səccad (ə) belə bir şəraitdə açıq radikal addımlar atsaydı, şübhəsiz, şiəliyin kökü kəsilər, Əhli-beyt məktəbinin, vilayət və imamət quruluşunun bütün inkişaf perspektivləri məhv olardı. Məhz buna görə İmam Səccad (ə) Muxtarla açıq əməkdaşlıq etmədi. Düzdür, bəzi rəvayətlərdən Muxtarla gizli əlaqəsinin olduğu görünür, amma heç şübhə yoxdur ki, aşkar şəkildə heç bir əlaqəsi olmayıb və hətta bəzi rəvayətlərə əsasən onu pisləyib də. Bu da çox təbii məsələdir. Bu onların .arasındakı əlaqənin hiss olunmaması üçün təqiyyə metodundan istifadədir

Muxtar qələbə çalsaydı, hakimiyyəti Əhli-beytə verərdi, amma məğlub olsaydı, İmam Səccadın (ə) onunla əlaqəsinin bilindiyi təqdirdə, bunun ziyanı İmam Səccada (ə) və Mədinə şiələrinə də toxunardı, şiəliyin sonu çatardı. Bu səbəbdən İmam Səccad (ə) .onunla heç bir açıq əlaqə qurmurdu

Rəvayətdə deyilir ki, Müslim ibn Üqbə Hərrə hadisəsində Mədinəyə gələndə hamı onun ilk növbədə Əli ibn Hüseynlə (ə) haqq-hesab çəkəcəyinə əmin idi. Lakin İmam Səccad (ə) elə dəqiq siyasət işlətdi ki, bu bəla dəf edildi, o həzrət qaldı və Şiənin əsas .mərkəzi kimi fəaliyyətini davam etdirdi

Düzdür, bəzi əsərlərdə, o cümlədən Bihar əl-ənvar kitabında həzrət Səccadın (ə) Müslim ibn Üqbənin yanında özünü alçaldaraq ona təzim etdiyini ifadə edən rəvayətlər :var. Mən bu rəvayətləri qəti şəkildə rədd edirəm. Çünki

;Əvvəla, bunlar heç bir doğru hədis sənədinə əsaslanmır

.İkincisi, məzmun baxımından onları təkzib edən digər rəvayətlər vardır

İmam Səccadın (ə) Müslim ibn Üqbə ilə görüşünə dair bir-biri ilə uyğun olmayan çoxlu rəvayətlər var. Bu rəvayətlərin bəzisi imamların rəftar və üsuluna daha uyğundur. Biz təbii ki, onları qəbul edirik. Onları qəbul edəndə isə digər rəvayətlər bütünlüklə rədd .edilir və mən onların qeyri-düzgün olmasına şübhə etmirəm

Hər halda, İmam Səccad (ə) o rəvayətlərin bəzisində göstərilən şəkildə rəftar ,etməmişdir, amma şübhə yoxdur ki

Müslim ibn Üqbəyə sərt münasibət də göstərməmişdir. Çünki belə olsaydı, onu qətlə yetirərdi və bu, İmam Səccadın (ə) vasitəsi ilə apalıran İmam Hüseyn (ə) düşüncəsinə ölümcül zərbə vurardı. İmam Səccad (ə) qalır və İmam Sadiqin (ə) hədisində gördüyümüz kimi, insanlar yavaş-yavaş ona qoşulur və çoxalırlar. İmam Səccadın (ə) .işləri belə ağır, əlverişsiz və çətin şəraitdə başlayır

İmam Səccadın (ə) ۳۴ illik imamət dövrünün çoxu Əbdülməlikin hakimiyyətinə təsadüf edir. Əbdülməlik rejimi imamın həyatına və rəftarına tam nəzarət edirdi. Onun hətta .özəl ailədaxili məsələləri də təyin olunmuş casuslar tərəfindən xəbər verilirdi

**İmam Səccadın (ə) məqsədləri**

İmam Səccadın (ə) dövrünün şəraiti aydın oldu. İndi imam belə bir şəraitdə işə başlamaq istəyir. Mən imamların seçdiyi məqsəd və üsula qısa işarə vurub o həzrətin .həyatının bu üsulla bağlı xırdalıqlarına keçəcəyəm

Şübhəsiz, həzrət Səccadın (ə) son məqsədi İslam hakimiyyəti qurmaqdır. İmam Sadiqin (ə) hədisində qeyd olunduğu kimi, Allah-Taala ۷۰-ci ili İslam hakimiyyəti üçün nəzərdə tutmuşdu. Həzrət Hüseyn ibn Əlinin (ə) şəhid edildiyinə görə isə ۱۴۷-۱۴۸-ci illlərə qədər təxirə saldı. Bu onu göstərir ki, İmam Səccadın (ə) və digər imamların son məqsədi İslam hakimiyyəti qurmaq olmuşdur. Amma o şəraitdə İslam hakimiyyəti :necə qurula bilərdi? Bunun üçün bir neçə məqama aydınlıq gətirmək lazımdır

Həqiqi daşıyıcıları imamlardan ibarət olan və İslam hakimiyyətinin əsası sayılan - ۱ .düzgün İslam düşüncəsi yazılmalı, tədris olunmalı və yayılmalıdır

İslam cəmiyyəti uzun illər düzgün İslam düşüncəsindən uzaq qaldığı, xalq arasında düşüncə şəraiti yaradılmadığı və əsaslı hökmlər yazılmadığı halda düzgün İslam !?təfəkkürü əsasında hakimiyyət qurmaq olardımı

səh:۱۵۳

İmam Səccadın (ə) ən böyük rolu əsl İslam təfəkkürünü – yəni tövhidi, nübüvvəti, insanın mənəvi məqamını, Allahla əlaqəsini və digər mövzuları yazmasıdır. Səhifeyi-Səccadiyyənin ən başlıca rolu bu idi. Siz Səhifeyi-Səccadiyyəyə nəzər salıb, sonra o dövrün insanlarının İslam düşüncəsinə baxsanız, bunların bir-biri ilə nə qədər fərqli olduğunu görərsiniz. İslam dünyasının bütün insanlarının maddiyyat istiqamətində, maddi amillərə doğru hərəkət etdiyi, xəlifə Əbdülməlik Mərvandan tutmuş onun ətrafındakı alimlərə, o cümlədən Məhəmməd ibn Şahab Zöhriyə qədər hamının özünü və dünyasını düşündüyü zaman İmam Səccad (ə) insanlara müraciətlə deyir: Bu it !?artığını öz adamlarına buraxan azad bir insan yoxdurmu

Bu cümlədə İslam təfəkkürü mənəviyyatı məqsəd seçməkdən, mənəvi və dini amallar naminə çalışmaqdan, insanı Allaha və üzərinə düşən vəzifələrə bağlamaqdan ibarətdir. Bu, ozamankı insanların maddi təmayüllərinin yaratdığının əksidir. Bunu bir misal kimi söylədim. İmam Səccad (ə) o qədər belə işlər görməli idi ki, nəticədə düzgün İslam təfəkkürü İslam cəmiyyətində qorunsun və məhv olmasın. Bu, İmam Səccadın .(ə) ilk işi idi

İnsanları hakimiyyətə haqlı olanlarla tanış etmək lazım idi. İmam Səccadın (ə) - ٢ dövrünə qədər Peyğəmbər (s) ailəsi əleyhinə on illərlə aparılan əks-təbliğat öz işini görmüş, İslam dünyasını bürümüş, Peyğəmbərin (s) dilindən Əhli-beytin hərəkət istiqamətinin əksinə, hətta bəzən lənətlənməsinə dair çoxlu saxta hədislər quraşdırılmış və xalq arasında yayılmışdı. İnsanların Əhli-beytin həqiqi və mənəvi məqamından əsla xəbərləri yox idi. Belə olan şəraitdə Əhli-beyt tərəfindən necə !?hakimiyyət qurula bilərdi

Buna əsasən, İmam Səccadın (ə) digər mühüm məqsəd və hərəkətlərindən biri budur ki, xalqı Əhli-beytin haqlı, vilayət, imamət və hakimiyyət məqamına sahib və onların Peyğəmbərin (s) həqiqi xəlifələri olması barədə maarifləndirsin, xalq bu məsələlərlə tanış olsun. Bu, İslam

ideologiyasından və İslam təfəkküründən olsa da, eyni zamanda siyasi mahiyyət daşıyır və hakim rejim əleyhinə siyasi hərəkət sayılır.

٣– İmam Səccad (ə) gələcək siyasi hərəkətlərin əsas mərkəzi olan bir təşkilat yaratmalı idi. Xalqın repressiya, yoxsulluq, maddi və mənəvi sıxıntılar səbəbindən tənhalığa, yalqızlığa, bir-birindən kənar gəzməyə vərdiş etdiyi, güclü təzyiq və qorxu altında şiələrin təşkilati dayaqlarının məhv edildiyi bir cəmiyyətdə İmam Səccad (ə) tək-tənha, yaxud pərakəndə və təşkilatsız bir qrupla necə işləyə bilərdi?!

Bu baxımdan, İmam Səccadın (ə) başqa bir işi şiələri təşkilatlandırmaqdır. Bizim fikrimizcə, bu təşkilat Əmirəlmömininin (ə) dövründən olmuş, Aşura faciəsindən, Hərrə hadisəsindən və Muxtarın məğlubiyyətindən sonra isə dağılmışdı. İmam Səccad (ə) bunu yenidən bərpa etməli idi.

Nəticə budur ki, İmam Səccadın (ə) üç əsas işi var:

١. Uzun müddət təhrif edildikdən və unulduqdan sonra İslam düşüncəsini düzgün formada və Allahın nazil etdiyi kimi yazmaq;

٢. Əhli-beytin xilafət və imamətə haqlılığını isbat etmək;

٣. Peyğəmbər (s) ailəsinin tərəfdarları olan şiələr üçün nizam-intizamlı təşkilat yaratmaq.

Biz bu üç əsas işi araşdırmalı və görməliyik ki, İmam Səccad (ə) həyatı dövründə onların hansına təşəbbüs göstərmişdir. Bu üç işin kənarında ikinci dərəcəli əhəmiyyət kəsb edən digər işlər də görülmüşdür; misal üçün, repressiv mühiti müəyyən həddə açmaq üçün bəzən imamın özü, yaxud tərəfdarları tərəfindən bəzi fikirlər bildirilmiş və addımlar atılmışdır.

İmamın tərəfdarları, yaxud özü bir qədər möhkəmləndikdən sonra çoxlu məsələlərdə müəyyən fikirlər irəli sürmüşlər. Bu fikirlər yalnız sözügedən qorxu mühitini aradan qaldırmaq və tutqun səmada bir qədər gözəl hava yaratmaq üçün olmuşdur. Bu, ikinci dərəcəli işlərdən biridir. Belə işlərə dair nümunələri qeyd edəcəyəm.

İkinci dərəcəli işlərdən başqa birisi hakim rejimlə, yaxud ona bağlı qüvvələrlə yüngül toqquşmadan ibarətdir. Bu toqquşma İmam Səccadla (ə) Əbdülməlik və ona bağlı olan azğın alimlər, o cümlədən Məhəmməd ibn Şahab Zöhri arasında, həmçinin imamların tərəfdarları ilə xəlifələrin tərəfdarları arasında dəfələrlə baş vermişdir. Bu işlər .cəmiyyəti bir qədər açmaq məqsədi ilə görülmüşdür

Kimsə mənim bəyan etdiyim amilləri nəzərə alaraq İmam Səccaddan (ə) nəql olunan əxlaqi rəvayətləri, moizələri, məktubları, digər hədisləri və onun həyatında baş verən hadisələri araşdırsa, hamısınə düzgün dərk edər, onların hamısının işarə vurduğumuz bu üç istiqamətdən birində olduğunu və bunların ümumilikdə İslam hakimiyyəti yaratmaq üçün baş verdiyini görər. Əlbəttə, imam İslam hökumətinin onun öz dövründə qurulması haqda düşünmür və bunun gələcəkdə, yəni İmam Sadiqin (ə) (dövründə həyata keçəcəyini bilirdi. (İslam keşikçisi, say: ٨

Bu üç işlə İslam hakimiyyəti və Əli (ə) quruluşu yaratmağa şərait yaranırdı. Bir daha vurğulamaq istəyirəm ki, İmam Sadiqdən (ə) fərqli olaraq, İmam Səccad (ə) bu hakimiyyətin öz imamlığı dövründə qurulmasını və İslam hökumətinin o zaman bərqərar olunmasını düşünmürdü. Çünki, onun dövründə buna şərait yox idi, zülm, repressiya, şiddət və təzyiq o qədər çox idi ki, onları otuz il ərzində aradan qaldırmaq mümkün deyildi. İmam Səccad (ə) gələcək üçün çalışırdı. Hətta çoxlu dəlillərə əsasən başa düşürük ki, İmam Baqir (ə) də öz dövründə İslam hakimiyyəti qurmaq niyyətində deyildi. Yəni ٦١-ci ildən İmam Səccadın (ə) şəhid edildiyi ٩٥-ci ilə və ٩٥-ci ildən İmam Baqirin (ə) şəhid edildiyi ١١٤-cü ilə qədər bu hakimiyyətin reallaşması haqda düşünmür və gələcək üçün çalışırdılar. İşarə vurduğumuz kimi, İmam Səccadın (ə) uyğun .fəaliyyət proqramı uzunmüddətli idi

İndi İmam Səccadın (ə) sözlərini araşdırmaq və qeyd etdiklərimizə onun sözlərindən .nümunələr göstərmək istəyirik

Çünki İmam Səccadın (ə) həyatını təhlil edəndə bizim bu məqsəd üçün ən əsas .mənbəyimiz o həzrətin sözləridir

Bütün imamların həyatına dair araşdırma üsulumuz budur. Biz imamların fikirlərini və onların dilindən çıxan rəvayətləri onların həyatını öyrənmək üçün ən yaxşı mənbə və əsas sayırıq. Lakin öncə də qeyd etdiyim kimi, biz bu sözləri o zaman düzgün dərk edə bilərik ki, imamların hərəkət istiqaməti, bu mübarizə və fəaliyyətdə onların məqsədi ilə tanış olaq. Belə olmasa, onların sözlərini də pis izah edərik. Sözügedən məqsədin özü də onların sözləri sayəsində başa düşülür. Hər halda, bu məqsədlə tanış olduqdan sonra görəcəyik ki, imamların sözlərindən bu sahədə necə düzgün bəhrələr götürə .bilərik

Mövzuya başlamazdan öncə qısa bir məqamı xatırlatmaq istəyirəm. İmam repressiya çağında yaşadığından və nəzərdu tutduğu fikirləri açıq-aşkar söyləyə bilmədiyindən moizə və dua üsulundan istifadə edirdi. Dua və Səhifeyi-Səccadiyyə haqda sonra danışacağıq. Moizə isə o həzrətdən nəql olunan söz və rəvayətlərə aiddir. İmam Səccadın (ə) əksər sözləri, bəlkə də demək olar ki, hamısı moizə üslubundadır. İmam moizə və nəsihət əsnasında qabaqca işarə vurduğum məsələni bəyan etmişdir. Siz bu sözlərə baxanda imamın çox dəqiq və ağıllı üsulunu görürsünüz. Həmin üsulla moizə və nəsihət əsnasında xalqın beyninə salmaq istədiklərini insanlara ötürür. Bu, düzgün .düşüncə və ideologiyaları ötürməyin ən yaxşı tərzidir

### İmam Səccadın (ə) sözlərində siyasi mübarizə motivləri

Burada Tühəf əl-üqul kitabında İmam Səccaddan (ə) nəql olunmuş sözləri araşdırmaq istəyirik. Bu sözlərdə qeyd etdiymiz cəhətlərə işarə vurulan bir neçə məsələ müşahidə .olunur

Bunların bir qismi ümumi insanlara ünvanlanan sözlərdir. Bu sözlərin özündən bəlli olur ki, dinləyici və oxucu İmam

.Səccadın (ə) yaxınlarından və kadrlarından olan xüsusi qrup deyil

Bu müraciətdə daim Quran ayələrinə istinad olunur. Çünki İmam Səccada (ə) bir imam kimi baxmayan ümumi xalq onun sözlərinə dəlil və əsas istəyir. Buna görə də imam ya Quran ayələrinə istinad edir, ya da metaforik şəkildə ayələrdən yardım alır. Bu rəvayətdə birbaşa və ya dolayı şəkildə bəlkə də əllidən artıq Quran ayəsinə istinad edilir. Digər rəvayətdə isə müraciət tərəfi möminlər olduğundan belə deyil. Onlar İmam Səccadı (ə) tanıyır, sözlərini qəbul edirlər. Buna görə də daha Quran ayələrinə .istinad etmir. Əvvəldən axıra qədər baxsanız, görərsiniz ki, Quran ayəsi çox azdır

Tühəf əl-üqul kitabında nəql olunmuş bu geniş rəvayətin əvvəlində deyilir ki, bu, İmam Səccadın (ə) səhabələrinin, şiələrinin və dostlarının hər cümə günü kollektiv, yaxud fərdi şəkildə oxumaları üçün moizədir. Bu geniş rəvayətin özündən onun geniş kütlə üçün nəzərdə tutulduğu anlaşılır. Burada əvvəla müraciət Ey möminlər!, yaxud Ey qardaşlar! formasında deyil, ümumi müraciət formasında Ey insanlar! deyilir; halbuki bəzi rəvayətlər möminlərə müraciətlə başlayır. Deməli, burada müraciət tərəfi ümumi .kütlədir

İkincisi, bu rəvayətdə hakim rejimi açıq şəkildə qınayan bir şey yoxdur, insanın bilməli olduğu etiqadları və İslam təlimlərini xatırladır. Qeyd etdiyim kimi, bunların hamısı nəsihət formasındadır. Rəvayət belə başlayır: Ey insanlar! Allahdan çəkinin və təqvalı olun! Bilin ki, Ona tərəf qayıdacaqsınız.(۱) Söz moizə formasında başlayır, sonra isə İslam etiqadlarına toxunub insanların diqqətini İslamı düzgün dərk etməyə yönəldir. Bunun mənası odur ki, İslamı düzgün anlamırsınız. O bu yolla insanlarda İslamı düzgün .tanımağa maraq oyadır

Görün İmam Səccad (ə) nə qədər maraqlı üslubdan istifadə edir. Nəsihət edərək deyir ki, qəbrə qoyulacağın zamandan



---

.Tühəf əl-üqul, səh: ۲۴۹ [۱۱۶] -۱

qorx; o zaman Nəkir və Münkər yanına gəlib səndən ilk olaraq ibadət etdiyin Allah haqda soruşacaqlar. O, dinləyicilərin beynində Allahı tanımağa və tövhidi dərk etməyə maraq oyadır. Sonra insanlarda nübüvvət məsələsini öyrənməyə maraq oyadır: Və sənə göndərilən Peyğəmbər haqda soruşacaqlar. Sonra isə buyurur: İnandığın dinin .və oxuduğun kitabın haqda soruşacaqlar

Sonra İslamın bu əsas etiqadları olan tövhid, nübüvvət, Quran və din arasında nəzərdə tutduğu əsas məqamı bəyan edir: Və vilayətinə inandığın imamın haqda soruşacaqlar(١). Burada imamət məsələsini irəli sürür. İmamların sözündə imamət məsələsi hakimiyyət deməkdir. Vilayət və imamət arasında fərq yoxdur. Vəli və imamın müxtəlif fərqli mənaları olsa da, imamların vilayət və imamət sözlərində məqsəd birdir. Burada deyilən imam cəmiyyəti həm dini baxımdan hidayət, həm də dünyəvi baxımdan idarə vəzifəsini daşıyan şəxs, yəni Peyğəmbərin (s) canişinidir. İmam cəmiyyətin rəhbəri, həm dinimizi öyrəndiyimiz, həm də dünyamızın idarəsini tapşırdığımız şəxsdir. Həm dini, həm də dünyəvi işlərdə ona itaət göstərmək vacibdir. Lakin siz görün Şiə dünyasında uzun əsrlər boyu bu məsələ necə səhv mənada oturuşmuşdu. İnsanlar elə bilirdilər ki, bir nəfər cəmiyyətdə hakim olub ölkəni idarə etməli, müharibə, sülh və digər işləri görməli, vergi təyin etməli, xalqa fərman verməli, qadağalar qoymalıdır, bir nəfər də dini işləri idarə etməlidir. Birincisi hakim, ikincisi isə qeyb dövründən sonra alim, imamların dövründə isə imamdır. Yəni biz imamların yaşadığı dövrdə onları qeyb dövründəki din alimi kimi təsəvvür edirdik. Bu səhv .təsəvvürdür

İmam – rəhbər deməkdir. İmam Sadiq (ə) Minada, yaxud Ərəfatda belə fəryad edirdi: Ey insanlar! Həqiqətən Allahın rəsulu imam olmuşdur. İmam xalqın həm dini, həm də dünyəvi işlərinə rəhbərlik edəndir. İmam Səccadla (ə) eyni



---

.Yenə orada [١١٧] -١

vaxtda yaşamış Əbdülməlik Mərvanın dövründəki İslam cəmiyyətində bu səhv məna oturuşmuşdu. Cəmiyyətin imamlığı – yəni imamətin mühüm sahəsi olan quruluşun və xalqın idarəsi sahiblərindən alınıb ləyaqəti olmayanlara tapşırılmışdı. Həmin ləyaqətsizlər də özlərini imam bilir, hakimiyyətdə olduqları uzun müddət boyu xalq tərəfindən imam tanınırdılar. Yəni insanlar Əbdülməlik Mərvanı, ondan öncə Mərvanı, ondan öncə Yezidi, Əbdülməlikdən sonra digərlərini imam tanıyır, cəmiyyətin rəhbəri və xalqın ictimai quruluşuna hakim kimi qəbul edirdilər. Bu, insanların beynində .oturuşmuşdu

İmam Səccad (ə) qəbirdə imamət haqda soruşulacağını söyləyəndə demək istəyir ki, sənə düzgün imam seçib-seçmədiyin haqda sual verəcəklər: Sənə hakim olan və cəmiyyətini idarə edən şəxs həqiqətən imam idimi? Allah onun imamlığına razı idimi? O bu sözlə xalqın diqqətini bu məsələyə cəlb edir, xalqı oyadır, o zaman Bəni-Üməyyə rejiminin unutdurmağa çalışdığı imamət məsələsini moizə şəklində və ümumi müraciətlə insanların beynində canlandırır. Bu, İmam Səccadın (ə) çox sakit üsullarından biridir. Sonra sərt üsulları haqda danışacağıq. Buna əsasən, ümumi xalqa aid olan müraciətdə görürük ki, imamlar İslam təlimlərini, o cümlədən özləri nəzərdə tutduqları məsələləri moizə formasında xalqın beyninə salır və insanların bu .məsələləri öyrənməsinə çalışırlar

**:Bu müraciətdə iki diqqətəlayiq məqam var**

Biri budur ki, imamın ümumi müraciətində deyilən bu sözlər təlimat yox, xatırlatmadır. Yəni imam burada insanlara tövhid məsələsini incələmək, yaxud nübüvvət məsələsini izah etmək istəmir, bunu onlara xatırladır. Çünki o zaman Peyğəmbərin (s) dövründən hələ o qədər ötməmişdi ki, İslam etiqadları tamamilə dəyişsin və təhrif edilsin. O zaman Peyğəmbəri (s), ilk xəlifələri, böyük imamlarımız olan Əmirəlmömini (ə), İmam Həsəni (ə) və İmam Hüseyni (ə) görmüş çoxlu şəxslər vardı. İctimai quruluş baxımından elə

vəziyyət yaranmamışdı ki, insanlar tövhid, nübüvvət, yaxud məad və Quran məsələlərinə dair səhv fikirdə olsunlar və onlarda köklü təhrif yaransın. Bəli, yadlarından çıxmışdı, maddi həyat İslam düşüncəsinin, İslama etiqad və təmayülün .tamamilə unudulmasına səbəb olmuşdu

Cəmiyyətdə dünyəvi və maddi amillər xalqı elə sıxırdı ki, həyatda mənəviyyatda və xeyir işlərdə yarışma imkanının olması ümumiyyətlə unudulmuşdu, heç kim bu barədə düşünmürdü. Bu sahədə öyrəndikləri yalnız zahiri və dayaz məsələlər idi. Bu cəmiyyətdə Peyğəmbərin (s) dövründə və ona yaxın zamanda mövcud olan təsəvvür, .hiss və dərk yox idi. Bu dərkin yaranması üçün onu xatırlatmağa ehtiyac vardı

Sonrakı dövrlərdə, məsələn İmam Sadiqin (ə) dövründə isə belə deyildi. O zaman müsəlmanlar arasında çoxlu mütəkəllimlər, dırnaqarası filosof və mütəfəkkirlər peyda olub müxtəlif adlar altında böyük məscidlərdə, məsələn Mədinə məscidində, hətta Məscidül-həramda və Şam məscidində oturub azğın etiqad və fikirlərini tədris edirdilər. İbn Əbilövca kimi bir şəxs ateizmi tədris edir, buna əsaslar gətirirdi. Buna görə də İmam Sadiqin (ə) sözlərində tövhidin, nübüvvətin və bu kimi məsələlərin dəlillə bəyan olunmasını görürsünüz. Çünki rəqibin dəlilinə qarşı dəlil göstərməyə ehtiyac vardı. İmam Səccadın (ə) sözlərində isə belə bir şey yoxdur. O, İslam mövzularını əsaslı şəkildə bəyan etmək istəmir, yalnız xatırladır və işarə vurur: Qəbirdə səndən tövhid və nübüvvət haqda soruşacaqlar. Bu, insanları oyatmaq, onlarda bu məsələyə qarşı .maraq yaratmaq və unutduğunu yenidən xatırlatmaq üçündür

Qısası budur ki, İmam Səccadın (ə) dövründə hətta hakimlər tərəfindən də İslam təfəkkürlərindən dönmədən xəbər verən bir şey yox idi. Düzdür, Yezidin bir şeiri bu baxımdan diqqətəlayiqdir. Əsirlər məclisə daxil olanda Yezid məst halda bir şeir oxudu. Şeirin məzmunu belə idi ki, Bəni-Haşim hakimiyyətlə oynayırdı, din və vəhy adlı bir şey yox səh:۱۶۱

idi.(۱) Bu haqda demək olar ki, bir qələt etmişdirsə, məst halda etmişdir. Hətta Əbdülməlik kimilər də aşkar şəkildə tövhid və nübüvvət düşüncəsinə qarşı çıxmırdılar. Əbdülməlik Mərvan o qədər Quran oxuyurdu ki, Quran qiraətçilərindən biri kimi tanınırdı. Ona xəlifə seçildiyini bildirəndə Quranı öpüb dedi ki, mənim səninlə görüşüm qaldı qiyamətə. Həqiqətən də elə oldu, daha Qurana müraciət etmədi. Çox zalım olduğunu eşitdiyiniz və eşitdiklərinizdən də artıq zülmlər etmiş Həccac ibn Yusif minbər üzərində xütbə oxuyanda xalqı təqvaya çağırırdı. Buna əsasən, İmam Səccad (ə) İslam düşüncələrini xalqa xatırladırdı, onların fikrini maddi bataqlıqdan çıxarmağa, .Allahı, dini və Quranı yada salmağa çalışırdı

İkinci məqam budur ki, qabaqca işarə vurduğum kimi, imam bu ümumi sözdə birdən-birə imamət məsələsi üzərində dayanır. Sanki şah rejimi dövründə bir nəfər sizinlə danışıb deyir ki, cənablar, Allah haqda düşünün, tövhid haqda düşünün, nübüvvət haqda düşünün, hakimiyyət haqda düşünün. Baxın, burada qeyd olunan imamətin mənası budur. Məlum məsələdir ki, şah rejimində hakimiyyət sözü təhlükəli sayılırdı. Kimsə xalqa hakimiyyət haqda düşünün desəydi, rejim bu söz üzərindən asanlıqla keçməzdi. Zahid və abid bir insan tərəfindən moizə şəklində bəyan olunanda isə çox (da qıcıq yaratmır. (İslam keşikçisi, say: ۹

İkinci qisim sözlər xüsusi qrupa müraciətdir. Kimə müraciət olması bilinməsə də, hakim rejimə qarşı çıxan bir qrupa müraciət olduğu anlaşılır. Onlar imamın davamçıları və .Əhli-beyt hakimiyyətinin tərəfdarları idilər

Xoşbəxtlikdən, Tühəf əl-üqul kitabında İmam Səccadın (ə) belə sözlərindən bir nümunə qeyd olunmuşdur. Digər kitabları axtarsaq da, İmam Səccaddan (ə) bu azsaylı nümunələrdən başqa bir şey tapmaq mümkün deyil. Onun çoxlu belə sözlər dediyi, lakin həmin dövrdə baş verən müxtəlif hadisələr, repressiyalar, hücumlar və səhabələrin



---

.Əl-Lühuf əla qətla ət-Tüfuf, səh: ۱۸۱ [۱۱۸] -۱

.təqibi zamanı bu əsərlərin məhv edildiyi, az bir hissəsinin bizə çatdığı nəzərə çarpır

İkinci qisim sözlərin əvvəlində deyilir ki, Allah bizi və sizi zalımların hiyləsindən, paxılların zərərindən və zalımların zülmkar hərəkətindən qorusun. Müraciətin özü göstərir ki, imam və müraciət olunanlar bu cəhətdən ortaqdırlar; yəni hamısı hakim qüvvələr tərəfindən təhlükə və təhdid altındadır. Bəllidir ki, bu məsələ xüsusi bir qrupa aiddir və o qrup Əhli-beytə etiqad bəsləyənlərdən, onların dost və yaxınlarından ibarətdir. Bu qisim müraciətlər "Ey möminlər!" sözü ilə başlayır. Qabaqkı müraciətdə "Ey insanlar!", bəzilərində "ey Adəm övladları!" deylirdisə, burada "Ey möminlər!" deyilir. Yəni imam müraciət etdiyi adamların Əhli-beytə və Əhli-beyt düşüncəsinə .həqiqi imanını etiraf edir

Burada imamın ilk sözləri onun müraciət tərəfinin möminlərdən - Əhli-beytə yaxın insanlardan ibarət olduğuna çox aydın dəlildir. Deyir ki, ey möminlər, tağutlar və (onların dünyagir, dünyaya aldanmış tərəfdarları sizi aldatmasınlar.(١

Möminlərə bu müraciətdə əsas məqsəd onları qorumaq və gələcək üçün lazımlı kadrlar hazırlamaqdır. Bəllidir ki, imamların tərəfdarları ilə tağutların tərəfdarları arasında gedən güclü vuruşmada imamların tərəfdarları çoxlu məhrumluqlardan əziyyət çəkirdilər. Təbii ki, mübarizə aparanların adi həyatda uğursuzluqları olur, digərləri isə çox yaxşı yaşayırlar. Mübarizləri təhdid edən böyük təhlükə onların .müqəddəs mübarizədən əl çəkmədən əldə olunmayan rifaha meyl salmalarıdır

Bu sözdə imam xalqı tağutlara yaxınlaşmaq hesabına əldə olunan gözəl və yalançı həyatdan, rifahdan çəkindirmək üzərində ən çox təkidi göstərir. Siz imamın bu sözündə və ondan nəql olunan bir çox sözlərdə və qısa rəvayətlərdə insanları .dünyadan çəkindirməsini görürsünüz



---

.Tühəf əl-üqul, səh: ٢۵٢ [١١٩] -١

Dünyadan çəkindirmək nə deməkdir? Yəni insandan imanı alıb rifah verən, mübarizliyi zəiflədib imtiyaz verən cinaha yaxınlaşmaqdan qorusun. Bu, möminlərə müraciətdədir. Ümumi müraciətdə bu cəhət az nəzərə çarpır. Qabaqca işarə vurduğumuz kimi, ümumi müraciətdə daha çox nəzərə çarpan budur ki, ey camaat, Allahı, qəbri, qiyaməti unutmayın, özünüzü sabaha hazırlayın və sair.

Bu qisim sözləri deməkdə imamın məqsədi nədir? Məqsəd kadr hazırlamaqdır. İmam istəyir ki, bəlli zaman üçün lazımlı mömin kadrlar hazırlasın. Buna görə də onları hakimiyyətə və yalançı rifaha yaxınlaşmaqdan çəkindirir. Bu sözlərdə dəfələrlə hakim rejimi xatırladır, halbuki öncəki sözdə belə açıq şəkildə demirdi. Burada həzrət Səccad (ə) dəfələrlə hakim rejimi sərt sözlərlə xatırlayır və şeytanın kənarında qeyd edir. Məsələn, bir yerdə buyurur ki, gecə-gündüz rastlaşdığınız qaranlıq fitnələr, zülmkar rejimlərin yaratdığı yeni bidətlər, zalım ənənələr, dövrün çətinlikləri, sultanın heybəti, şeytanın vəsvəsəsi... Baxın, imam sultandan sonra dərhal şeytanın vəsvəsəni qeyd edir. Yəni açıq şəkildə dövrün hakimini şeytanın kənarında yada salır. O, sözünün davamında çox maraqlı bir cümlə deyir. Çox mühüm olduğuna görə onu xatırlatmaq istəyirəm. Bu cümlə qabaqca qeyd etdiyim məsələdən xəbər verir. Deyir ki, şiddət dövründə insan həyatında gecə-gündüz baş verən bu hadisələr qəlbləri niyyət və istiqamətindən saxlayır, mübarizə həvəsindən salır, cəmiyyətdə mövcud olan hidayəti yaddan çıxarır və haqq tərəfdarını tanımağa qoymur.(١)

Həzrət Səccad (ə) qeyd etdiyim şəkildə bunlara moizə edir. Deyir ki, belə hadisələr həyatda tutduğunuz xətti sizə unutdurmasın. İmam dəfələrlə zalım hakimi yada salır. Başqa bir yerdə buyurur ki, günahkarlarla həmsöhbət olmayın və zalımlara kömək etməyin.(٢)



---

١- [١٢٠] Əl-Kafi, c.٨, səh: ١۵.

٢- [١٢١] Yenə orada, səh: ١۶.

Burada günahkarlar dedikdə kimləri nəzərdə tutur? Zalım Əbdülməlik rejiminə .yaxınlaşanları. Deyir ki, onlara yaxınlaşmayın və zalımlara kömək etməyin

Siz İmam Səccadı (ə) belə bir simada təsvir edin, görün beyninizdə necə şəxsiyyət formalaşar! Beyninizdə heç bir şeylə işi olmayan xəstə, azdanışan və məzlum bir imam təsviri qalarmı?! İmam möminlərdən, dostlarından və tərəfdarlarından bir qismini toplayıb onları bu şəkildə dövrün zalım hakimiyyətinə yaxınlaşmaqdan və mübarizəni unutmaqdan çəkindirir, onları mübarizə yolundan yayınmağa qoymur. İmam onları fəal və həvəskar saxlayır ki, bir gün İslam hakimiyyəti qurmaq üçün köməkləri .toxunsun

İmam Səccadın (ə) sözlərinin bu hissəsində mənim üçün çox maraqlı və mühüm görünən bir parça Əhli-beytin keçmiş təcrübələrini xatırlatmasıdır. İmam Səccad (ə) bu hissədə deyir ki, siz bilirsiniz keçmişdə zalım hakimlər tərəfindən sizə hansı təzyiqlər edildi? Məqsəd Müaviyənin, Yezidin və Mərvanın dövründə Əhli-beyt tərəfdarlarına edilən təzyiqlər – Hərrə hadisəsi, Aşura faciəsi, Hücr ibn Ədinin, Rüşeyd Həcərinin şəhadəti və onlarla digər mühüm və məşhur hadisədir. Əhli-beyt tərəfdarları keçmişdə bunları təcrübə etmiş və xatırlayırdılar. İmam keçmiş təcrübələrini və acı xatirələrini yada salmaqla onları mübarizədə bərkitmək istəyir. Bir yerdə deyir ki, canıma and olsun, siz arxada qoyduğunuz hadisələrin, çoxlu fitnələrin, bu fitnələrə qərq olmağın təcrübəsindən istifadə edə, azğınlardan, bidətçilərdən və (yerdə fəsad törədənlərdən uzaq durmaq üçün onlara istinad edə bilərsiniz.(١

Yəni sizin təcrübəniz var, bilirsiniz ki, zülm və fəsad törədən zalım hakimlər iş başına gələndə sizinlə necə rəftar edəcəklər. Siz keçmişə baxıb onlardan ayrılmalı, .uzaqlaşmalı və onlara qarşı çıxmalı olduğunuzu bilirsiniz



---

.Tühəf əl-üqul, səh: ٢۵٣ [١٢٢] -١

İmam Səccad (ə) bu sözlə imamət məsələsini – yəni xilafəti, vilayəti, hakimiyyəti və İslam quruluşunun idarəsini açıq şəkildə ortaya qoyur. İmam burada imamət məsələsini açıqca söyləyir, halbuki həmin dövrdə bu sözü ümumi xalq üçün belə açıq deyə bilməzdi. Buyurur ki, Allahın fərmanını, Ona, həmçinin Allah tərəfindən itaəti vacib edilən şəxsə itaəti birinci iş sayın.

İmam burada Şiə baxımından imamətin fəlsəfəsini və əsasını müəyyən edir. Bildirir ki, Allahdan sonra itaəti vacib edilən şəxsə tabe olmaq lazımdır. O dövrün əhalisi bu haqda düşünmək istəsəydilər, çox asanlıqla bu nəticəyə gələrdilər ki, Əbdülməlikə itaət etmək vacib deyil. Çünki Allah onun itaətini vacib edə bilməz. Bu qədər zülm və fəsad törədən Əbdülməlik itaətə layiq birisi deyil. İmam burada imamət məsələsini qeyd edir. Sonra isə dinləyicilərinin beynində olan yeganə şübhəni aradan qaldırmaq üçün buyurur ki, tağutların – yəni əbdülməliklərin itaətini Allahın, Onun rəsulunun və həqiqi əmr sahiblərinin itaətindən önə keçirməyin.(۱) İmam Səccad (ə) sözlərinin bu hissəsində də imamət məsələsini açıq şəkildə söyləyir.

İmam Səccad (ə) həm qabaqkı, həm də bu sözdə iki mühüm məsələyə toxunur. Bu sözdə qabaqca işarə vurduğum üç məsələdən ikisinə toxunmuşdur: biri xalqın dini düşüncə və inamlarına yenidən baxış, onları İslam etiqadları haqda düşünməyə vadar etmək və dinə yenidən baxmağa həvəsləndirmək, ikincisi isə İslam quruluşunun siyasi hakimiyyət məsələsidir. İmam o zaman xalqı bu iki məsələ ilə tanış edir və özünün nəzərdə tutduğu Əli (ə) quruluşunu – ilahi və dini quruluşu təbliğ edir.

İmam Səccadın (ə) sözlərinin başqa bir qismi bu iki qisimdən də maraqlıdır. Bu sözlərdə imam xalqı təxminən açıq şəkildə xüsusi bir İslam təşkilatına dəvət edir. Bu dəvət yalnız o həzrətə bağlı olanlara edilir. Çünki ümumi xalqı belə



---

۱- [۱۲۳] Yenə orada, səh: ۲۵۴.

bir təşkilata dəvət etsəydilər, üstü açılardı və imama böyük problem yaranardı. Xoşbəxtlikdən, bu növ sözlərin bir nümunəsi Tühəf əl-üqul kitabında qeyd olunmuşdur .və biz burada deyəcəyik

İmam əvvəldə buyurur ki, dünyaya göz yumanların, ona könül verməyənlərin əlaməti onlarla eyni fikirdə və həmrəy olmayan hər bir dostu tərk etmələridir.(١) Bu isə açıq .şəkildə Şiə təşkilatına çağırışdır

İnsanlar bu sözdən öyrənirlər ki, onların məqsədini izləməyən, onlarla bir maraqda, Əli (ə) və haqq hakimiyyəti qurmaq istəyində olmayan başqa şəxslərə yad və özgə olsunlar. Təbii ki, get-gəlləri və əlaqələri ola bilər, amma bu əlaqə inqilabdan qabaqkı dövrdə İran xalqının əlaqəsi kimidir; o zaman bilirdilər ki, filan mağazanın sahibi SAVAK adamıdır və insanlara göz qoyur. İmam buyurur ki, sizin istəyinizdə və düşüncənizdə olmayan, sizin yolunuzla getməyən və məqsədinizi izləməyən .adamlarla get-gəliniz və rəftarınız özgə kimi olmalıdır və onları tərk etmək lazımdır

İmamın sözlərinin başqa bir qismi mənim işarə vurduğum bu xüsusi cəhətlərin olmadığı ümumi sözlərdir. Məsələn, İmam Səccadın (ə) Hüquq risaləsi belədir. İmam Səccadın (ə) indiki şəriət risalələri qədər çox geniş bir məktubu var. Risalə məktub deməkdir. Hüquq risaləsi imamın dostlarından birinə yazdığı və orada insanların bir-birinə qarşı hüquqlarını qeyd etdiyi məktubudur, amma həqiqətən bizim bugünkü şəriət risalələrimiz qədər böyükdür, tərcümə edilib çap olunsa, özü bir kitab olar - bəlkə də çap olunub. Burada imam müxtəlif vəzifələrdə çalışan müxtəlif insanların bir-birinə qarşı bütün hüquqlarını qeyd edir. Orada həmçinin Allahın, bədən üzvlərinin, ətin, gözün, dilin və əlin hüquqları sadalanır; sonra İslam cəmiyyətinin hakiminin sənin və sənin onun üzərində haqqın, sənin dostların, qonşuların və ailən üzərində haqqın və sair. İslam quruluşunda insanlar arasında münasibətləri tənzim



---

.Bihar əl-ənvar, c. ٧۵, səh: ١٢٨ [١٢۴] -١

edən hüquqların hamısı bu risalədə bəyan olunmuşdur. İmam hakimiyyət, mübarizə və gələcək quruluşun adını çəkmədən bu məktubda çox sakit şəkildə gələcək quruluşun əsas münasibətlərini qeyd etmişdir. Məqsəd budur ki, İmam Səccadın (ə) öz dövründə, yaxud ondan sonra nə zamansa İslam hakimiyyəti yaransa, həmin quruluşda xalq arasındakı münasibətlər öncədən tənzim edilmiş olsun. Yəni insanları gələcəkdə hökuməti qurulacaq İslamla tanış edir. Bu da İmam Səccadın (ə) çox .diqqətəlayiq sözlərindən başqa bir qismidir

Başqa bir qisim də sizin Səhifeyi-Səccadiyyədə gördüyünüzdür. Səhifeyi-Səccadiyyə mövzusu çox geniş mövzudur. Mütəxəssislər bu kitab üzərində işləməlidirlər. Səhifeyi-Səccadiyyə insanın məqsədli bir həyatda üzləşdiyi bütün mövzular haqda dualar toplusudur. Bu dualarda ən çox təkid insanın mənəvi əlaqələri üzərindədir. Bu kitabda müxtəlif münacatlar, dualar, kamilliyə səbəb olan çoxlu və saysız-hesabsız mənəvi .istəklər var. İmam bu dualarda insanların beynində bir İslam həyatına maraq oyadır

Duanın bizim dəfələrlə təkrar etdiyimiz nəticələrindən biri ürəklərdə sağlam və düzgün maraqlar oyatmaqdır. Ey Allahım! Bizim işlərimizin aqibətini xeyirli et deyəndə bu dua sizə aqibətinizi xatırladır. İnsan bəzən öz aqibətini yaddan çıxarır. Hələlik yaşayır, gününü keçirir və aqibətin insan taleyində necə həlledici və mühüm rol oynadığına diqqət yetirmir. Bu duanı etdikdə isə birdən-birə bunu yadınıza salır, sizdə aqibətə maraq oyadır və siz aqibətinizin yaxşı olmasına çalışırsınız. Bunu necə yaxşılaşdırmanız başqa bir mövzudur. Mən duanın insanı düzgün məqsədlərə yönəltməsinə dair bir misal vurmaq istədim. Səhifeyi-Səccadiyyə kitabı əvvəldən sona qədər insanlar üçün şərafətli dualarla doludur. İnsan onlara diqqət yetirsə, bu kitab .həqiqətən bir cəmiyyəti islah etməyə və oyatmağa qadirdir

Bunlardan əlavə, İmam Səccaddan (ə) çoxlu qısa rəvayətlər də nəql olunmuşdur. Mən bir nümunəsini bayaq qeyd etdim: Bu it artığını öz adamlarına buraxan azad bir insan yoxdurmu?! Bu

cümlədə işlənmiş lumazə sözü itin artığına deyilir. Görün bu söz nə qədər əhəmiyyətlidir! İtin artığı nədir? Dünya bəzəkləri, saraylar, dəbdəbə və Əbdülməlikin dövründə bütün zəif insanların can atdığı bu kimi amillər. İmam bunları itin artığı adlandırır. Əbdülməlikə, onun nökərlərinə nökər olmaq, yaxud həmin istiqamətdə hərəkət etmək istəyən bütün şəxslər belə it artıqlarına görə buna can atırdılar. Deyir ki, ey möminlər, it artığına can atmaqla Əbdülməlikə yaxınlaşmayın. İmam Səccadın (ə) sözlərində belə gözəl inqilabi sözlər çoxdur, inşallah onlara da çatacağıq. O həzrətin şeirləri də belədir. Həzrət Səccad (ə) həm də şair olmuş, şeir demişdir. Onun şeirlərinin (məzmunu da belədir. İnşallah davamında qeyd olunacaq. (İslam keşikçisi, say: ١٠

İmam Səccadın (ə) həyatına dair bir sual budur ki, görək o həzrət xilafət rejiminə qarşı çıxmışdır, yoxsa yox? Qabaqkı mövzularda buna qısa işarə vurdum, indi isə bir qədər .geniş danışacağam

**İmamların hərəkətinin üçüncü mərhələsinin başlanması taktikası**

İmam Səccadın (ə) həyatını araşdırarkən gördüyüm və xatırladığım qədərincə, onun həyatında bəzi imamların, məsələn, İmam Sadiqin (ə) Bəni-Üməyyə dövründəki, yaxud İmam Musa ibn Cəfərin (ə) həyatındakı kimi açıq və qətiyyətli etiraz əlaməti yoxdur. Səbəbi də bəllidir: dörd imamət dövrünün İmam Səccadın (ə) imamlığından başlayan üçüncü mərhələsinin əvvəllərində belə etirazçı hərəkətlər etsəydilər, Əhli-beytin məsuliyyətli və mühüm karvanı əsla istədikləri yerə çatmazdı. İmam Səccadın (ə) mahir bağbanlığı ilə suvarılıb yetişdirilən Əhli-beyt bağı hələ kifayət qədər möhkəmlənməmişdi, bu bağda ağır tufanlara tab gətirmək iqtidarında olmayan yeni ağaclar vardı. Söhbətin əvvəlində işarə vurduğum kimi, İmam Səccadın (ə) ətrafında Əhli-beyti sevənlərdən, ona etiqad bəsləyənlərdən və şiələrdən ibarət çox kiçik bir qrup vardı və həmin dövrdə Şiə təşkilatını idarə

etməkdən ibarət ən mühüm vəzifəni daşıyan bu kiçik qrupu düşmənin qarşısına atıb .məhv etmək olmazdı

Biz İmam Səccadın (ə) bu dövrünü Peyğəmbərin (s) Məkkədə dəvətə bağladığı dövrə, yəni hələ dəvətin aşkar formaya düşmədiyi bir neçə ilə bənzədə bilərik. Bəlkə də İmam Baqirin (ə) imamət dövrünü Məkkənin ikinci dövrünə, yəni dəvətin aşkar edildiyi dövrə, ondan sonrakı dövrləri də dəvətin sonrakı mərhələlərinə bənzətmək olar. Bu .baxımdan açıq etiraz baş vermədi

İmam Səccad (ə) İmam Sadiq (ə), İmam Kazim (ə) və səkkizinci imam kimi sərt fikirlər səsləndirsəydi, ən qüdrətli çağında olan Əbdülməlik Mərvan asanlıqla Əhli-beyt təlimlərini qadağan edərdi və işə yenidən başlamalı olardılar. Bu, ağıllı və normal bir iş olmazdı, lakin bununla yanaşı, güman ki, İmam Səccadın (ə) həyatının və uzun imamlıq dövrünün axırlarına təsadüf edən sözləri arasında xilafət aparatına qarşı etiraz .əlamətləri müşahidə olunur

Bu etiraz əlamətləri bir neçə formada idi. Bir forma adi dini təlimlər şəklində Əməvi xəlifələrinin mövqeyini bəyan edir. İmam Sadiqdən (ə) nəql olunan bir hədisdə deyilir: Həqiqətən Bəni-Üməyyə xalqa imanı öyrənmək üçün şərait yaratdı, şirki öyrənməyə isə mane oldu. Məqsədi bu idi ki, xalqı şirkə sövq edəndə onlar bunun şirk olduğunu bilməsinlər.(۱) Yəni Bəni-Üməyyə xəlifələri din alimlərinin, o cümlədən imamların namaz, həcc, zəkat, oruc, ibadət, həmçinin tövhid və nübüvvət haqda danışmalarına, bu mövzularda ilahi hökmləri bəyan etmələrinə icazə verirdilər, amma cəmiyyətdə şirk anlayışına və onun nümunələrinə dair müzakirə aparmağa və xalqı bu cəhətdən maarifləndirməyə qoymurdular. Şirkə aid məsələləri xalqa öyrətsəydilər, onlar müşrik olduqlarını və Bəni-Üməyyənin onları şirkə sövq etdiyini bilərdilər; o saat anlayardılar ki, Əbdülməlik və digər Bəni-Üməyyə xəlifələri Allahla qarşı-qarşıya dayanmış



---

۱- [۱۲۵] Əl-Kafi, c. ۲, səh: ۴۱۵.

tağutlardır və onlara itaət edənlər əslində şirkə bulaşmışlar. Buna görə də insanların .şirkə aid məsələləri öyrənməsinə icazə vermirdilər

İslamda tövhid haqda bəhslərin mühüm bir hissəsi şirki və müşriki tanımağa aiddir; .yəni büt nədir və bütpərəst kimdir

Mərhum Əllamə Məclisi Bihar əl-ənvar kitabının ۴۸-ci cildinin ۹۶-۹۷-səhifələrində yaxşı söz deyir. Buyurur ki, Quranda şirk ayələrinin zahiri, görünən bütlər haqdadır, batini və təvili isə zalım xəlifələrə, haqsız olaraq özlərini xəlifə adlandırıb İslam cəmiyyətinə hakim olanlara və hakimlik iddiasında haqq imamlarına şərik çıxanlara aiddir. Bu şərik çıxmağın özü Allaha şirkdir. Çünki haqq imamları Allahın nümayəndələridir, Allah tərəfindən danışırlar, zalım xəlifələr isə özlərini onların yerinə qoyaraq imamət iddiasında şərik çıxanlardır. Odur ki, onlar büt və tağutdurlar və onlara itaət edən hər .bir kəs əslində müşrik olmuşdur

Əllamə Məclisi bunun ardınca maraqlı şərh verir. O, Quran ayələrinin yalnız həzrət Peyğəmbərin (s) dövrünə məxsus olmadığını, bütün dövrlərdə keçərli olduğunu vurğulayaraq buyurur ki, şirk sözü haqq imamlarının itaətindən çıxıb zalım rəhbərlərə itaət göstərən insanlara da şamil olur. Çünki onlar məsələn, Əbdülməlik kimisinin müsəlmanların hakimi və xəlifəsi ola bilmədiyinə dəlalət edən əqli və nəqli dəlillərdən üz çevirmiş olurlar.(۱) Onlar aşkar dəlil və rəvayətlərdən üz çevirib öz nəfslərinə tabe oldular. İnsanlar görürdülər ki, hakimlərin zülmündən uzaq, başağrısız həyat onlar üçün daha rahatdır. Buna görə də həmin vəziyyətdə yaşayıb zalım rəhbərlərə tabe .oldular və nəticədə şirkə yuvarlandılar

Bu baxımdan, imamların şirk məsələsini bəyan etmələri xilafət kürsüsündə oturanlara .yarımgizli bir etirazdır. Bu, İmam Səccadın (ə) həyatında və sözlərində var

Bu etiraz nümunələrinə dair başqa bir misalı İmam Səccadla (ə) qüdrətli Əməvi xəlifəsi Əbdülməlik arasında



---

.Bihar əl-ənvar, c. ۴۸, səh: ۹۶ [۱۲۶] -۱

gedən bəzi məktublaşmalarda müşahidə edirik. Mən buna dair iki nümunəni qeyd :edəcəyəm

Bir dəfə Əbdülməlik İmam Səccada (ə) məktub yazıb azad etdiyi kənizi ilə ailə . ١ qurduğuna görə onu qınadı. Həzrət bir kənizini azad edib sonra onunla evlənmişdi. Əbdülməlik məktub yazıb imamı məzəmmət etdi. Təbii ki, imamın işi çox insani və dini bir iş idi. O, bir kənizi köləlikdən qurtarmış və sonra şərəfləndirərək öz həyat yoldaşı etmişdi. Bu çox insani və böyük bir işdir. Bu məktubu yazmaqda Əbdülməlikin məqsədi İmam Səccada (ə) etiraz əsnasında onun ailədaxili məsələlərindən də xəbərdar olduğuna eyham vurmaq və beləliklə onu üstüörtülü şəkildə təhdid etmək idi. İmam Səccad (ə) cavab məktubunun əvvəlində bildirdi ki, bu işin heç bir eybi yoxdur. Böyük insanlar və Allahın rəsulu da belə etmişdir. Bu baxımdan, qınaq yersizdir. Sonra bildirdi ki, müsəlman üçün heç bir rəzalət yoxdur, rəzalət cahiliyyətdir.(١) İmam ironiya ilə və çox ustalıqla ata-babalarının cahil keçmişini ona xatırlatdı. Demək istədi ki, cahil, müşrik və Allahın düşməni olan ailədən olanlar sizsiniz və rəzalət sizdə var. İnsan buna .görə başıaşağı olmalıdır, müsəlman bir qadınla ailə qurduğuna görə yox

Məktub Əbdülməlikə çatanda ikinci oğlu Süleyman onun yanında idi. Məktub oxunanda o da imamın eyhamını və məzəmmətini eşitdi, atası kimi məktubun mənasını anladı. O, üzünü atasına tutub dedi ki, ey möminlərin əmiri, gör Əli ibn Hüseyn (ə) özünü səndən necə üstün tutur. Yəni bu məktubda demək istəyir ki, mənim bütün ata-babalarım mömin olmuşlar, sənin bütün ata-babaların isə kafir və müşrik. O, atasını bu məktub qarşısında sərt tədbir görməyə təhrik edirdi. Lakin Əbdülməlik oğlundan ağıllı idi və belə məsələlərdə İmam Səccadla (ə) vuruşmalı olmadığını bilirdi. Odur ki, oğluna müraciət edib dedi: Oğlum! Bir söz demə, bu, qayaları yaran



---

.Yenə orada, c. ۴۶, səh: ١٠۵ [١٢٧]-١

.Bəni-Haşim dilidir. Yəni bunların dili və əsaslandırması çox güclü və tutarlıdır

Növbəti nümunə İmam Səccadla (ə) Əbdülməlik arasında başqa bir məktublaşmadır. .۲ Əbdülməlikə xəbər çatmışdı ki, Peyğəmbərin (s) xəncəri həzrət Səccaddadır (ə). Bu çox möhtəşəm bir irs, Peyğəmbər (s) yadigarı və fəxr etməli məsələ idi. Həm də o xəncərin İmam Səccadda (ə) olması Əbdülməlikə təhlükə törədə, o bununla xalqı öz ətrafına toplaya bilərdi. O, İmam Səccada (ə) bir məktub yazıb xəncəri ona satmasını istədi. Məktubun altında da yazmışdı ki, istəyiniz olsa, yerinə yetirməyə hazıram; yəni .məktubda o hədiyyənin mükafatını da söz vermişdi

İmamın cavabı mənfi oldu. Yenidən hədə dolu məktub yazıb bildirdi ki, xəncəri satmasan, sənin təqaüdünü kəsəcəyəm. İmam cavabda yazdı: Allah təqvalı bəndələri xoşagəlməz hallardan xilas etməyi və onlara gümanları gəlməyən yerdən ruzi verməyi Öz üzərinə götürmüşdür. Allah Quranda buyurur: Allah, həqiqətən, heç bir xaini, ?nankoru sevməz!(۱) İndi gör bizim hansımız bu ayəyə daha uyğun gəlirik

Bu, xəlifəyə çox sərt bir cavab idi. Bu məktubu görən hər kəs anlayırdı ki, İmam Səccad (ə) əvvəla özünü xəyanətkar və qədirbilməz saymır, ikincisi heç kimin onun barəsində belə təsəvvürü də yoxdur. Çünki o, Peyğəmbər (s) ailəsindən olan ləyaqətli və hörmətli bir insan idi, bu ayəyə əsla uyğun gəlmirdi. Buna əsasən, İmam Səccadın (ə) fikri bu idi ki, sən xəyanətkar və qədirbilməzsən. İmam onun təhdidi qarşısında belə .sərt reaksiya verdi

.Bu, İmam Səccadın (ə) Əməvi xilafətinə qarşı etirazlarına nümunələr idi

Buna başqa bir nümunə əlavə etmək istəsək, həzrət Səccaddan (ə), yaxud o . ۳ həzrətin səhabələrindən nəql olunan şeirlərə müraciət etməliyik. Bu da bir növ etirazdır. Çünki o səh:۱۷۳

---

.Həcc/۳۸ [۱۲۸] -۱

həzrətin özünün etiraz etmədiyini fərz etsək belə, yaxınları etiraz edirdilər və bu da bir .növ imamın etirazı sayılırdı

İmam Səccaddan (ə) çox sərt və inqilabi ruhda olan bir neçə şeir nəql olunmuşdur. Fərəzdəqin məşhur şeiri də başqa bir nümunədir. Fərəzdəqin əhvalatını tarixçi və hədisşünaslar yazmışlar. Əbdülməlik oğlu Hişam xilafətindən öncə Məkkədə təvaf edirdi. O, Həcərül-əsvədə - müqəddəs qara daşa əlini sürtmək istəyirdi. Bildiyiniz kimi, təvaf zamanı bunu etmək savabdır. Qara daşın ətrafında yaranmış qələbəliyə görə nə qədər etdisə, özünü daşa çatdıra bilmədi. O, şahzadə, xəlifə oğlu olsa da, oraya adamları və mühafizəçiləri ilə birgə gəlsə də, insanlar etinasızlıqla onu geriyə itələyirdilər. Naz-nemət içərisində böyümüş bu adam da camaatın içinə girib onlar kimi daşı öpə bilmirdi. Axırda məyus olub Məscidül-həramda hündür bir yerdə oturdu və xalqa tamaşa etməyə başladı. Onun yanındakılar da oturdular. Bu zaman təvaf edənlərin arasında çox vüqarlı, mətanətli, zahid və nurani bir kişi göründü. O, Həcərül-əsvədə yaxınlaşanda insanlar təbii şəkildə yol açdılar və o heç bir əziyyət çəkmədən .əlini daşa sürtdü, onu öpdü, sonra da qayıdıb təvafına davam etdi

Bu, Hişama toxundu. Gördü ki, xəlifə oğlu olmasına baxmayaraq, heç kim ona hörmət etmir, daşa əl vurması üçün yol açmır, lakin bir kişi peyda olub çox asanlıqla qara daşa əlini sürtür. O əsəbiləşib soruşdu ki, bu kişi kimdir. Ətrafındakılar onun Əli ibn Hüseyn (ə) olduğunu bilirdilər, amma Hişamın onlardan şübhələnməsindən qorxub demədilər. Çünki Hişamın ailəsi ilə İmam Səccadın (ə) ailəsi arasında ixtilaf vardı. Bəni-Üməyyə və Bəni-Haşim arasında həmişə ixtilaf olmuşdu. Onlar həmin kişinin düşmən ailənin böyüyü olmasını, xalqın onu bu şəkildə sevməsini demək istəmir, bunu Hişama hörmətsizlik sayırdılar. Əhli-beyt dostlarından olan şair Fərəzdəq orada idi. Bu adamların həqiqəti söyləmədiklərini və Əli ibn Hüseyni (ə) tanımadıqlarını bildirdiklərini görüb irəli çıxdı və dedi: Ey Əmir! İcazə ver

mən onu tanıtdırım. Dedi: Tanıtdır. Fərəzdəq orada Əhli-beyt şairlərinin ən məşhur qəsidələridən olan və başdan-ayağa Əli ibn Hüseyni (ə) güclü mədh edən bir qəsidə söylədi. Dedi: Bu elə bir şəxsdir ki, Bətha torpağı onun ayağının izini tanıyır; hərəm və qeyri-hərəm, Zəmzəm və Səfa onu tanıyır. Bu, Peyğəmbər (s) balası, ən yaxşı insanın övladıdır![(۱)] O, güclü bir qəsidə söyləyərək İmam Səccadın (ə) xüsusiyyətlərini bəyan etdi. Onun hər sözü xəncər kimi Hişamın qəlbinə otururdu. Ondan sonra Fərəzdəq Hişamın qəzəbinə gəldi. Hişam onu qovdu və həzrət Əli ibn Hüseyn (ə) ona pul göndərdi. O, pulu qəbul etmədi, dedi ki, mən bu şeiri Allah üçün demişəm və sizdən pul almaram. İmamın səhabələri arasında belə etirazlar görünürdü. Bunun başqa bir nümunəsi Yəhya ibn Ümm ət-Təvilin əhvalatıdır. O, Əhli-beyti sevən çox şücaətli gənclərdən idi. Həmişə Kufəyə gedib xalqı toplayır və fəryad qoparırdı ki, ey Bəni-Üməyyə hökumətinin tərəfdarları, biz sizin yolunuza kafirik, Allaha iman gətirməyincə sizi qəbul etmərik. Bu sözdən belə başa düşülür ki, o, xalqı müşrik bilir, müşrik və kafir .adlandırırdı

Həzrət Səccadın (ə) və onun səhabələrinin həyatında belə etirazlar olmuşdur. (İslam (keşikçisi, say: ۱۲

**İmam Səccadın (ə) saray alimləri əleyhinə güclü mübarizəsi**

İmam Səccadın (ə) həyatına və istifadə etdiyi üsullara aid məsələlər haqda söhbətin davamında böyük İslam hərəkatı üçün Əli (ə) və İslam hakimiyyəti ilə nəticələnə bilən .əlverişli şəraiti araşdırmaq və bəyan etmək istəyirik

Bu üsullar bir qrup üçün maarifləndirmə, bir qrup üçün idarəçilik və başqa bir qrup üçün yol göstərməkdən ibarət idi. Biz barəsində danışdığımız İmam Səccadı (ə) ۳۰-۳۵ il çalışıb İslam dünyasının çox əlverişsiz şəraitini İslam cəmiyyəti və İslam hökuməti qurmaq üçün əsas və son fəaliyyətlərə



---

.Bihar əl-ənvar, c. ۴۶, səh: ۱۲۱ [۱۲۹] -۱

hazırlayan səbirli, təmkinli insan kimi görürük. İmam Səccadın ۳۵ illik fəaliyyəti olmasaydı, heç şübhəsiz, İmam Sadiqin (ə) Əməvi və sonralar Abbasi hökumətlərinə .qarşı açıq mübarizəsinə şərait də yaranmazdı

Bir İslam cəmiyyəti qurmaq üçün düşüncə şəraiti hər şeydən zəruri və əhəmiyyətlidir. Bu düşüncə şəraitinin yaranması üçün İslam dünyasının ozamankı vəziyyətində uzun illər hazırlıq görülməli idi. İmam Səccad (ə) bütün zəhmət və məşəqqətləri ilə birgə bu .işi üzərinə götürdü

Bunun kənarında İmam Səccadın (ə) həyatında başqa fəaliyyətlər də görürük. Bu fəaliyyətlər o həzrətin sözügedən sahədə inkişafını göstərir. Bu fəaliyyətlərin əsas hissəsi siyasi və bəzən çox kəskindir. Onun bir nümunəsi İmam Səccadın (ə) hakimiyyətə çalışan böyük hədisçi və alimlərə qarşı münasibətində görmək olar. İmamların həyatının ən maraqlı hissələrindən biri onların İslam cəmiyyətinin elm, düşüncə və mədəniyyət öncülləri olan alim və şairlərə münasibətinə dairdir. Bunlar xalqın düşüncəsini və beynini korlayır, onları Əməvi və Abbasi xəlifələrinin cəmiyyətdə hakim etməyə çalışdığı vəziyyətə alışdırır, müti və təslimçi edirdilər. Bu mübarizə tərzi digər imamlar kimi İmam Səccadın (ə) həyatında da maraqlı və mühüm bir hissəni .təşkil edir

Bildiyimiz kimi, zalım xəlifələr İslama etiqadlı xalqa hakim olmaq üçün onun imanını istədikləri amilə cəlb etməyə məcbur idilər. O zaman hələ İslamın erkən çağından çox keçməmişdi, xalqın İslama imanı öz qüvvəsində qalırdı. İnsanlar zalımla etdikləri beyətin düzgün olmadığını və bu zalımın Allah rəsulunun canişini olmağa ləyaqətinin çatmadığını bilsəydilər, heç vaxt ona təslim olmazdılar. Bütün xalq belə olmasa da, heç şübhəsiz, cəmiyyətdə iman səbəbindən xəlifələrin qeyri-dini vəziyyətinə dözən və bu vəziyyətin İslama uyğun olduğunu düşünənlər çox idi. Məhz buna görə zalım xəlifələr dövrlərinin hədis və din alimlərindən maksimum istifadə edib, onları Peyğəmbərin (s) .və böyük səhabələrin adından hədislər qoşmağa məcbur edirdilər

Buna dair çox dəhşətli nümunələr var. Müaviyənin dövründə bir nəfər Kəbüləhbarla(١) rastlaşdı. Kəhbüləhbar Müaviyə və Şam hakimləri ilə səmimi münasibətdə olduğuna ?görə həmin şəxsdən soruşdu ki, haralısan

.Şamlıyam –

?Bəlkə sən yetmiş min nəfəri sorğu-sualsız cənnətə gedəcək qoşundansan –

?Onlar kimlərdir –

.Dəməşq əhalisi –

.Xeyr! Mən dəməşqli deyiləm –

.Onda sən Allahın hər gün iki dəfə baxdığı ordudansan –

?Onlar kimlərdir –

.Fələstin əhalisi –

O kişi bəlkə fələstinli deyiləm desəydi, Kəbüləhbar Bəəlbək, Tripoli və digər Şam şəhərlərinin hər biri üçün buna bənzər hədislər qoşacaqdı. Kəbüləhbar bu hədisləri ya Şam əmirlərinə yaltaqlıq üçün qoşur və bununla onlardan daha çox ənam almaq, onların hörmətini qazanmaq istəyirdi, ya da bu işi İslama düşmən olduğu üçün görür .və əsl Peyğəmbər (s) sözlərinin asanlıqla seçilməməsi üçün hədisləri qarışdırırdı

Təzkirə və rical kitablarında belə əhvalatlar çoxdur. Birində deyilir ki, bir əmir oğlunu məktəbxanaya qoymuşdu. Bir dəfə müəllim onun oğlunu vurdu, o da ağlaya-ağlaya evə gəlib əhvalatı atasına danışdı. Atası qəzəblənib dedi ki, indi gedib bu müəllimin .əleyhinə bir hədis qoşduraram və o daha bu qələtlərdən etməz

Bu əhvalatdan bəlli olur ki, hədis qoşmaq onlar üçün çox asan iş olmuşdur; hətta uşaqlarının göz yaşına görə müəllimin, yaxud onun yaşadığı şəhərin əleyhinə hədis qoşurdular. Hər halda, bu vəziyyət İslam dünyasında İslam dininə dair çox qarışıq, saxta və yanlış bir zehniyyət yaratmışdı. Bu yanlış

---

Kəhbüləhbar ikinci xəlifənin dövründə müsəlman olmuş bir yəhudi idi. Onun [۱۳۰] -۱ hədislərinə qarşı ciddi şübhələr mövcuddur. Yalnız şiələr yox, hətta bir çox sünnilər də onun İslamla düşmənlik üzündən bəzi hədisləri qoşduğunu söyləyirlər. Bəzi Əhli-sünnə .alimləri isə onu qəbul edirlər

zehniyyətin mənşəyi o dövrün hakim və məmurlarına xidmət göstərən hədisçi və alimlər idilər. Belə bir vəziyyətdə belələrinə qarşı mübarizə aparmaq çox mühüm və .təyinedici bir işdir

İndi İmam Səccadın (ə) həyatından bu mübarizəyə dair bir nümunə qeyd etmək .istəyirəm. Bu, imamın Məhəmməd ibn Şahab Zöhri ilə rəftarı barədədir

Məhəmməd ibn Şahab Zöhri əvvəlcə İmam Səccadın (ə) yaxınlarından və şagirdlərindən olmuş, ondan elm öyrənmiş və hədis nəql etmişdir. Lakin sonra tədricən xilafətə yaxınlaşıb onların xidmətinə keçdi və imamların mübarizə apardığı .alim və rəvayətçilərdən oldu

Məhəmməd ibn Şahab Zöhri ilə daha yaxından tanış olmaq üçün onun haqqında bir neçə hədis nəql edirik. O deyir ki, biz əvvəldə elmi yazmaq istəmirdik, amma əmir və hökmdarlarımız bizi bildiklərimizi yazmağa və kitab formasına salmağa vadar etdilər.(١) Biz sonra düşündük ki, heç bir müsəlmana bu işi qadağan etməsinlər və elm həmişə yazılsın. Bu sözdən belə başa düşürük ki, o zamana qədər hədisçilər arasında hədisləri yazmaq adət olmamışdır. Həmçinin aydın şəkildə görünür ki, Məhəmməd ibn .Şahab Zöhri əmirlərə xidmət göstərmiş, əmirlər ona hədisləri yazmağı tapşırmışlar

Müəmmər adlı bir nəfər deyir ki, biz elə bilirdik Zöhridən çoxlu hədis nəql etmişik, amma Vəlid öləndən sonra heyvanlara yüklənərək onun xəzinələrindən çıxarılan çoxlu dəftərləri gördük. Deyirdilər ki, bunlar Zöhrinin elmidir. Yəni Zöhri Vəlidin istəyi ilə onun üçün hədislərlə o qədər kitab və dəftər doldurub ki, onları xəzinələrdən çıxarmaq üçün heyvanlara yükləyirdilər. Vəlidin əmri ilə bu kitablara yazılmış hədislər necə hədislər ola bilər?! Şəksiz, onların arasında Vəlidin əleyhinə bir hədis də ola bilməz. Onlar Vəlidin .və onun kimilərin əməllərinə don geyindirən hədislərdən ibarət idi



---

.İbn Səd.Ət-Təbəqat, c. ٢, səh: ١٣۵-١٣۶ [١٣١] -١

Zöhri haqda onun xilafətə bağlı olduğu dövrə aid başqa bir hədis də var. Yəqubi Tarix kitabında Zöhrinin Allah rəsulundan belə bir söz söylədiyini yazmışdır: Yalnız üç məscidə köçmək olar: Məscidül-hərama, Mədinə məscidinə və Əqsa məscidinə. Allah rəsulunun Əqsa məscidində ayağını qoyduğu daş Kəbə kimidir.(١) Mən hədisin sonuncu hissəsi haqda danışmaq istəyirəm. O bu daşı Kəbə kimi sayır və onun üçün .Kəbə qədər şərafət və dəyər tanıyır

Bu hədis Abdullah ibn Zübeyrin Məkkəyə hakim olduğu dövrə aiddir. İnsanlar həccə gedəndə Abdullah ibn Zübeyrin hakimiyyəti altında olan Məkkədə bir neçə gün qalmalı olurdular. Bu, Abdullah ibn Zübeyrin öz düşmənləri və birinci növbədə Əbdülməlik ibn Mərvan əleyhinə təbliğat aparmasına çox əlverişli imkan yaradırdı. Əbdülməlik insanların bu təbliğatın təsiri altına düşməsini və Məkkəyə getməsini istəmədiyinə görə ən yaxşı və asan yol kimi bir hədis quraşdırmaq qərarına gəlmişdi. Bu hədis Əqsa məscidini Məkkə və Mədinə qədər üstün bilir və orada yerləşən həmin daşın Kəbə qədər şərafətli olduğunu söyləyir. Halbuki İslama görə dünyanın heç bir nöqtəsi Kəbə qədər şərafətli deyil və dünyada heç bir daş Allah evinin daşına - Həcərül-əsvədə çatmaz. Buna əsasən, bu hədisin quraşdırılmasının səbəbi insanları Allah evinə və Mədinə şəhərinə - güman ki, ora da Əbdülməlik əleyhinə təbliğat mərkəzinə çevrilmişdi – getməkdən daşındırmaq və Fələstinə yönləndirmək olmuşdur. Fələstin Şamın bir hissəsi kimi Əbdülməlikin nəzarətində idi. İnsanların bu qondarma hədisə nə qədər əməl etmələrini tarixi qaynaqlarda axtarmaq lazımdır. Görəsən belə bir zaman olmuşdurmu ki, insanlar Məkkəyə getmək yerinə Beytülmüqəddəsə və həmin daşın ziyarətinə getsinlər, yoxsa belə bir şey olmayıb? Əgər belə bir hal baş vermişdirsə, əsas günahkar, yaxud günahkarların biri belə hədislər quraşdırıb insanları aldadan Məhəmməd ibn Şahab Zöhridir və bu yalnız



---

.Yəqubi, c. ٢, səh: ٢٦١ [١٣٢] -١

.Əbdülməlik Mərvanın siyasi məqsədlərinə görə həyata keçmişdir

Hakim rejimə bağlı olandan sonra Məhəmməd ibn Şahabın İmam Səccad (ə) və Əli (ə) ailəsi əleyhinə hədislər qoşmasına heç bir maneə qalmırdı. Bunun üçün mərhum Seyid Əbdülhüseyn Şərəfüddinin Əcvibə məsail carillah kitabında iki hədis gördüm. Bu hədislərin birində Məhəmməd ibn Şahab iddia edir ki, Əmirəlmöminin (ə) Cəbriyyə firqəsində olmuşdur. O, Peyğəmbərə (s) istinadla deyir ki, İnsan isə (bütün məxluqat içərisində) ən çox mübahisə edəndir(١) ayəsində məqsəd Əmirəlmöminindir! Başqa bir rəvayətdə deyir ki, şəhidlər ağası Həmzə şərab içmişdi. Bu iki hədisi qoşmaqda məqsəd yalnız hidayətçi imamlara qarşı çıxıb Əbdülməlikin və Bəni-Üməyyə ailəsinin siyasi hakimiyyətini dəstəkləmək, Peyğəmbər (s) ailəsini və o həzrətin Əməvilərlə qarşı-qarşıya duran övladlarını həqiqi müsəlman saymamaq, din hökmlərinə sevgi və .əməl baxımından onları orta, adi və ya aşağı səviyyəli tanıtdırmaqdır

İmam Səccad (ə) bu şəxsə qarşı çox sərt mövqe seçdi. Bu mövqe bu məktubda öz əksini tapmışdır. Kimsə düşünə bilər ki, məgər bir məktub nə qədər sərt ola bilər?! Lakin bu məktubun məzmununun Zöhrinin özünə, eləcə də hakim rejimə qarşı çox kəskin olduğunu, onun yalnız Məhəmməd ibn Şahaba yox, digərlərinin də əlinə keçdiyini, tədricən dillərə düşdüyünü və tarixdə qaldığını nəzərə alsaq, belə alimlərin saxta və şeytani müqəddəsliyinə necə möhkəm zərbə vurduğunu anlamaq olar. Tarixdə qalmış və üstündən ١٣٠٠ il ötəndən sonra bu gün bizim söhbətimizin mövzusuna çevrilmiş bu məktub Məhəmməd ibn Şahaba müraciət olsa da, başqalarına da şamil olur. Bəllidir ki, bu məktub müsəlmanların, xüsusən də o dövrün şiələrinin əlinə düşəndə və hamı bununla tanış olanda belə saray adamlarının etibarına



---

.Kəhf/٥۴ [١٣٣]-١

.necə güclü xələl gəlir. İndi bu məktubun bəzi hissələrini söyləmək istəyirik

Məktubun əvvəlində deyilir ki, Allah bizi və səni fitnələrdən saxlasın və səni cəhənnəm odundan qorusun. Cümlənin ikinci hissəsi yalnız ona müraciətdir. Fitnə və imtahanlar hamı üçündür. İmam Səccad (ə) da bir növ fitnəyə məruz qala bilər, amma onda qərq olmaz. Məhəmməd ibn Şahab isə fitnəyə məruz və onda batıb qalır. Cəhənnəm odu İmam Səccada (ə) yaxınlaşmır; buna görə də onu Məhəmməd ibn Şahaba aid edir. Məktubun belə başlanması imamın onunla həm təhqiramiz, həm də qəzəbli rəftarını göstərir. Sonra buyurur: Sən elə bir vəziyyətə düşmüsən ki, bunu bilən hər kəs sənə acımalıdır. Görün bu söz kimə deyilir. Bu söz hamının qibtə etdiyi, hakimiyyətin sevdiyi böyük bir din aliminə deyilir. İmam isə onu o qədər xar edir ki, haqqında belə bir cümlə .buyurur

Sonra imam Allahın ona verdiyi nemətlərə işarə vurur. Buyurur ki, Allahın sənə verdiyi bütün bu nemətlərin şükrünü necə yerinə yetirdiyini söyləyə bilərsənmi?! Sonra Qurandan bəzi ayələri yada salıb deyir ki, Allah heç zaman sənin qüsur və günahlarınla razılaşmayacaq. Çünki Allah alimlərdən xalqa həqiqətləri söyləmələrini istəmişdir: Siz (onu (kitabda olanları) gizlətməyib, insanlar üçün aydınlaşdırmalısınız!(١)

Bu müqəddimədən sonra Məhəmməd ibn Şahaba qarşı çox sərt və kəskin ittihamnamə başlayır. Buyurur ki, gizlətdiyin və göz yumduğun ən kiçik məsələ zalımların qorxusunu rahatlığa çevirmən, azğınlıq yolunu onlara açmandır. Sən onlara yaxınlaşmaqla, hər dəfə dəvətlərini qəbul etməklə bu işi gördün. Burada onun saraya .yaxınlığını yadına salır və bir qamçı kimi başına endirir

Məktubda deyilir ki, sənə aid olmayanları sənə vermişlər, sən də almısan. Sən heç kimə heç bir haqqı qaytarmayan şəxsə - zalım xəlifəyə yaxınlaşmış və bu zaman heç bir batili aradan



---

.Ali-İmran/١٨٧ [١٣۴] -١

qaldırmamısan. Yəni bəhanə gətirə bilməzsən ki, haqqı bərpa etmək və batilin qarşısını almaq məqsədi ilə ona yaxınlaşmısan. Sən onunla birgə olduğun müddətdə heç bir batilin qarşısını almadın, halbuki onun rejimi batillə dolu idi. Sən Allahın düşmənini .özünə dost seçdin

Bu ittihamnamədə imamın çox sərt cümləsi budur: Onlar səni özlərinə yaxınlaşdıranda bilmirdin ki, səndən zülm dəyirmanının fırlandığı ox, üzərindən yanlış işlərinə keçmək üçün körpü və öz azğınlıqlarına sarı qalxmaq üçün nərdivan düzəltmək istəyirlər?! Sən onların azğınlığına çağıran bir dəvətçi, onların yolu ilə gedən bir yolçu idin. Onlar sənin vasitənlə alimlərdə şübhə oyatdılar, cahillərin isə rəğbətini qazandılar. Sənin sayəndə alimlər fikirləşdilər ki, biz nə üçün hakimiyyətə yaxınlaşmayaq?! Alimlərdə bu fikir .yarandı, cahillər də çox asanlıqla xəlifələrə meyl göstərib onlara yaxınlaşdılar

Sonra buyurur ki, ən yaxın vəzirləri, ən güclü tərəfdarları da onlara sənin qədər kömək etmədilər. Sən onların fəsadlarını xalqa düzgün iş kimi göstərdin.(١)

İmam çox sərt və dərin məzmunlu bu məktubda siyasi və ictimai hakimiyyətə yardım edən düşüncə hakimiyyətini və elmi rəhbərliyi rüsvay etdi, rejimlə barışığa hazır olanlarda sual yaratdı, bu sual ozamankı İslam cəmiyyətində həmişə aktual oldu və .tarix boyu da aktual olacaq

Mən bunu İmam Səccadın (ə) həyatının mühüm hissələrindən biri bilir və düşünürəm ki, o həzrət məhdud bir qrup arasında elmi və tərbiyəvi fəaliyyətlə kifayətlənmədi, (hətta bu həddə siyasi işlər də gördü. (İslam keşikçisi, say: ١١

Bu, İmam Səccadın (ə) həyatının xülasəsidir. Bir məqama da toxunmaq istəyirəm: İmam Səccad (ə) özünün ٣۴ il sürən səmərəli imamət dövründə hakim rejimlə aşkar mübarizə aparmasa da, uğurla imamlıq etməsi, mömin və ixlaslı qüvvələrdən ibarət çoxlarını yetişdirməsi və Əhli-beyt



---

.Bihar əl-ənvar, c. ٧۵, səh: ١٣٢ [١٣۵] -١

dəvətini genişləndirməsi öz işini gördü, Bəni-Üməyyə xilafəti o həzrətdən şübhələndi və qorxuya düşdü. O həzrətə qarşı bəzi tədbirlər də gördülər, ən azı bir dəfə onu .qoluqandallı Mədinədən Şama apardılar

Məşhurdur ki, Kərbəla hadisəsində İmam Səccad (ə) zəncirlənərək aparıldı, amma o həzrətin boynuna zəncirin vurulması dəqiq məlum deyil. Qeyd etdiyim hadisədə isə qətidir; yəni imamı Mədinədə dəvəyə mindirib, zəncirlə bağladılar və Şama apardılar. O, dəfələrlə müxalifləri tərəfindən işgəncə və əziyyətlər gördü və nəhayət, hicrətin ۹۵-ci ilində, Vəlid ibn Əbdülməlikin xilafəti zamanı hakimiyyət qüvvələri tərəfindən (zəhərlədilib şəhadətə qovuşdu. (İslam keşikçisi, say: ۱۲

səh:۱۸۳

## (Onuncu fəsil: İmam Baqir (ə

### Düşüncə quruculuğu və təşkilatçılıq dövrü

Beşinci imam həzrət Baqirin (ə) həyatı İmam Səccadın (ə) həyatının tam məntiqli davamıdır. Bu zaman bir qrup yaranmışdır, Şiə məzhəbi yenidən ucalıq və şəxsiyyət duyur. Kərbəla faciəsi, ondan sonrakı Hərrə və Təvvabin kimi qanlı hadisələr və repressiv şərait səbəbindən bir neçə il dayanmış və çox qalın pərdələr altında təqdim olunan Şiə dəvəti indi İslam ölkələrinin bir çox bölgələrində, xüsusən də İraqda, Hicazda və Xorasanda kök salmış, böyük bir təbəqəni özünə cəlb etmiş və hətta daha məhdud dairədə partiya adlandıra biləcəyimiz ideoloji və praktik birliyə çevrilmişdir. Bir vaxtlar İmam Səccad (ə) buyururdu ki, bütün Hicazda dostlarımızın sayı iyirmi nəfərə çatmır.(١) İndi isə həmin dövr arxada qalmışdır. İmam Baqir (ə) Mədinədə Peyğəmbər (s) məscidinə daxil olanda Xorasanın və digər bölgələrin çoxlu insanları onun ətrafına toplaşıb şəriət məsələlərinə dair suallar verirlər. İmamət və Şiə yolunda olmayan Tavus Yəmani, Qətadə ibn Diamə və Əbu Hənifə kimi məşhur din alimləri imamın elmi şöhrətini eşidib ondan öyrənmək, yaxud elmi mübahisə aparmaq üçün onun yanına gəlirdilər. Səlis qələmi və zəngin sənətkarlığı olan Kumeyt Əsədi kimi bir şairin ən mühüm sənət əsəri dillər əzbəri olub insanları Peyğəmbər (s) ailəsinin haqqı, onların elmi və mənəvi üstünlüyü ilə tanış edən Haşimiyyat adlı qəsidələrdir. Mərvani xəlifələr hicri tarixi ilə ٨۶-cı ildə vəfat edən Əbdülməlik ibn Mərvanın iyirmiillik hakimiyyətindən sonra bütün qiyamçı və müxaliflərin zərərsizləşdiyini görüb təhlükəsizlik və sabitlik hiss etdilər, asanlıqla əldə etdikləri xilafətin qədrini öz sələfləri qədər bilmədilər və başları adətən cah-calalın nəticəsi olan işlərə qarışdı. Bu zaman şiəliklə çox da işləri olmadı və nəticədə



---

.Şərh Nəhcül-bəlağə, c. ۴, səh: ١٠۴; Bihar əl-ənvar, c. ۴۶, səh: ١۴٣ [١٣۶] -١

.imam və tərəfdarları onların hücumlarından müəyyən həddə uzaq qaldılar

Bəli, vəziyyət bir neçə cəhətdən imamətin və şiəliyin xeyrinə dəyişmişdi. Deməli, belə qəti nəticə almaq olar ki, İmam Baqir (ə) öz imamlığı dövründə bir addım da irəliyə gedərək Şiə mübarizəsini son mərhələyə yaxınlaşdırdı. Bu, İmam Baqirin (ə) imamlıq (dövrünün spesifik xüsusiyyətini təşkil edir. (Sadiq rəhbər, səh: ٣٢-٣٣

İmam Baqir (ə) haqda danışmağa çox söz var, lakin mən o həzrətin həyatındakı iki məqama işarə vuracağam. Biri o həzrətin İslam təlimlərinin təhrifinə qarşı mübarizəsindən ibarətdir. Bu, İmam Baqirin (ə) dövründə həmişəkindən daha geniş müstəvidə həyata keçdi. Təhriflə mübarizə nə deməkdir? Məqsəd budur ki, müqəddəs İslam dini öz hökmləri, təlimləri və Quran ayələri ilə İslam cəmiyyəti, hətta dünya və bəşəriyyət üçün bir sıra xüsusiyyət və şərtlər müəyyən etmişdir. Əgər insanlar o təlimləri bilsələr və onlara əməl etsələr, İslam adlı bir cəmiyyətdə bəzi hallara, məsələn, zalımların, fasiqlərin, günahkarların və dindən xəbərsizlərin hakimiyyətinə dözməzlər; cəmiyyətdə ayrıseçkiliyə və sərvətin ədalətsiz bölgüsünə əsla dözməzlər. İslam cəmiyyətlərində mövcud olan fəsadların bir çoxu İslam hökmləri və İslam .quruluşu ilə uyğun deyil

Peyğəmbər (s) canişini kimi hakimiyyətə gələn bəzi şah və hökmdarlar, məsələn, Bəni-Üməyyə və Mərvani xəlifələri İslam cəmiyyətinə hakim olmağa əsla layiq deyildilər. Onların hökmdarlığı dövründə günah, zülm, ayrıseçkilik, cəhalət, xülasə, müxtəlif fəsadlar mövcud idi. İslam hökmləri və Quran ayələri xalqa olduğu kimi izah olunsaydı, bunların hakimiyyətə gəlib şahlıq etmələri mümkün olmazdı. Buna görə də təhrifə başladılar. Təhrifi bir neçə yolla edirdilər. Biri bu idi ki, bəzi fəqih, alim, hədisçi, qiraətçi və tanınmış şəxsiyyətləri aldadaraq öz kənarlarında saxlayır, onlara pul verir, yaxud qorxudurdular; onların bəzisini tamahlandırmaqla, bəzisini də qorxutmaqla özləri istədikləri

sözləri xalq arasında yaymağa vadar edirdilər. Siz İslamın ilk ۱-۲ əsrinin tarixinə baxsanız, qəribə mənzərə görərsiniz. Müqəddəslik, təqva və elmlə məşhur olan çoxları zalım hakimlərə xidmət edir, İslam adına xalqa qəribə hökmlər sırıyırdılar. İndi bir nümunəyə baxın: Bir alim deyir ki, Allah-Taalanın Quranda itaətini vacib etdiyi əmr sahibləri hər hansı vasitə ilə hakimiyyətə gəlmiş şəxsdir; hiyləgərliklə, kələklə, zor .gücünə, quldurluqla, oğurluqla hakimiyyətə gəlmiş olsa da, əmr sahibi sayılır

Bu qədər absurd və yanlış fikir İslama, xalqın etiqad və imanına bağlanmasa, heç kim tərəfindən qəbul edilməz. Amma onlar bunu İslama bağladılar və çoxlu belə sözlər quraşdırdılar. İslamın ilk ۱-۲ əsrində çoxlu belə işlər görüldü. Xəlifələr tanınmış şəxsiyyətləri özləri ilə birgə Məkkəyə, Mədinəyə aparır, xalqa göstərir, ümumi toplantılarda təqdim və özlərini təsdiqlətmək üçün onlardan istifadə edirdilər. Dini təhrifin yollarından biri bu idi. Dırnaqarası alim, fəqih, müqəddəs və zahid olan bu şəxslər xəlifələrə xidmət göstərirdilər. Hakimiyyətin xalqın inanmasını istədiyi məsələləri bunlar din adı altında xalqa sırıyırdılar. Belə məsələlərin bəzisi kitablarda .qalmışdır və təəssüf ki, bir çox müsəlmanlar hələ də onlara inanırlar

Təhrifin bir yolu da bu idi ki, xəlifələrin özü hakimiyyətə gəlib dedikləri sözü xalqın qəbul etməyə məcbur olduğunu duyanda, bir sözü, bir fikri İslam adı altında söyləyir və ənənə şəklinə salırdılar. Bu söz İslam dünyasının hər bir yerində deyilir, təkrar olunur, ağız-ağız dolaşır və xalqın zehniyyətinə çevrilirdi. Misal üçün, Əbdülməlik hakimiyyətinin Həccac kimi bəzi məmurları xilafətin nübüvvətdən üstün olduğunu iddia edirdilər. Bunlar Əbdülməlik ibn Mərvanın, onun övladlarının, bu fasiq və günahkar insanların Peyğəmbər (s) canişini olması və bu titulu zorla qəsb etmələri ilə qane olmur, hətta xilafətin nübüvvətdən üstün olduğunu söyləyirdilər. Dində belə təhriflər baş vermişdi. Bəni-Üməyyə və Bəni-Abbas hakimiyyətlərinin yaşamasının əsas amili və həqiqi

.İslam hakimiyyətinə əsas maneə xalqın beyninə hakim olmuş belə yanlış ənənələr idi

Belə bir vəziyyətdə imamlar düzgün İslam hakimiyyətini bərpa etmək və Əli (ə) quruluşu qurmaq istəyirlərsə, nə etməlidirlər? İlk iş xalqın zehniyyətini dəyişdirmək, xalqın beyninə hopmuş dırnaqarası İslam, əslində isə antiislam mədəniyyətini ondan almaq, onun yerinə yaxşı və düzgün mədəniyyət, əsl Quran və tövhid mədəniyyəti vermək idi. Bu, mədəni mübarizədir. Deməli, mədəni mübarizə yalnız oturub inqilabi və mübarizə istiqaməti olmadan bir sıra İslam hökmlərini bəyan etmək deyil. Bu, mübarizə deyil. Mədəni mübarizə xalqın düşüncəsini, beyninə hakim olan mədəniyyəti dəyişdirmək, ilahi hakimiyyətə yol açmaq, tağut və şeytan hakimiyyətinin yolunu bağlamaqdır. İmam Baqir (ə) bu işə başladı. Baqir əl-ülum sözünün mənası budur: Quran həqiqətlərini və İslam elmlərini yaran. O, həqiqətən Quranı xalqa izah edirdi. Buna görə də, nəfəsi asılı, muzdur və boyunduruq altında olmayan hansı adama toxunurdusa, dövrün hakimiyyətinə qarşı fikri mütləq dəyişirdi. İmam Baqirin (ə) dövründə çoxlu orta səviyyəli insanlar Əhli-beyt məktəbinə, bu gün bizim şiəlik adlandırdığımız imamət məktəbinə yönəlirdilər. Şiəlik budur: həqiqi İslam hakimiyyəti qurmaq, Quran sözünü həqiqətən ucaltmaq, Quran təlimlərini xalqa aydınlaşdırmaq və icra etmək üçün Əhli-beyt məktəbinə tapınmaq. İmam Baqir (ə) kiminlə ünsiyyətdə olur və bu məsələləri söyləyirdisə, fikri dəyişirdi. Bu, İmam Baqirin (ə) çox əhəmiyyətli .və əsaslı olan birinci işi idi; onun ən çox işi də bu idi

İmam Baqirin (ə) həyatında başqa bir iş təşkilatçılıqdan ibarətdir. Biri var insan bu təlimləri, mədəni dəyişikliyi və mədəni mübarizəni eləcə cəmiyyətə tullayır. Toxumları bu şəkildə torpağa tullayanda biri bitir, biri bitmir; biri bitəndən sonra quruyur, biri ayaq altda tapdanır və s. Yəni belə toxum səpmək çox da faydalı olmur. Biri də var ki, mahir bağban, ağıllı və peşəkar əkinçi toxumu səpəndən sonra onu həm də

qoruyur. Bu necə qorunur? Bu uca təlimlərin və təbliğatın təsiri altına düşənlərin şübhələrini aradan qaldırmaq, daha çox öyrənmək, düşmən fikirlərin təsiri altına düşməmək, səhvə yol verməmək, birliklərini qorumaq, qısası, bu sağlam toxumların həmin yararlı torpaqda bitməsi üçün lazımlı zəmanəti təmin etməkdən ötrü bütün .İslam dünyasında bir qrup insanı əməkdaşlığa cəlb etməklə

İmam Baqirin (ə) işlərindən biri bu idi. O öz dost və şagirdlərindən bəzilərini yetişdirib yüksək səviyyəyə çatdırdı, onlara xüsusi diqqət ayırdı, sonra bu özəl şagirdləri bir-birinə caladı, bütün İslam dünyasında onları mərkəzə çevirdi, özünə vəkil və naib seçdi. Onlar İmam Baqirin (ə) işlərini apardılar, o həzrətin təbliğat və təlimlərini yaymağa başladılar. İmam Baqirdən (ə) öncə başlayan bu məxfi təşkilatçılıq o həzrətin dövründə daha da gücləndi, İmam Sadiqin (ə) və İmam Musa ibn Cəfərin (ə) dövründə zirvə həddinə çatdı. Bu da çox təhlükəli olan başqa bir iş idi. İmam Baqirin (ə) bəzi səhabələri rəvayətlərdə sirdaş səhabələr adı ilə tanınırlar. Məsələn Cabir ibn Yezid Cöfi belə səhabələrdən idi. Sirdaş səhabələrkimlərdir? Onlar İslam dünyasının hər bir tərəfində olub hazırlıqlı və Əhli-beyti sevən insanlara yol göstərmək, əl tutmaq, onları yönəltmək, xülasə, düşüncə ehtiyaclarını təmin etmək işini üzərinə götürmüş (şəxslərdir. Hakim rejim bunları tutanda ən çətin təzyiqlərə məruz qoyurdu. (۱۹۸۷

Qısa bir araşdırma ilə İmam Baqirin (ə) ۹۵-ci ildən ۱۱۴-cü ilə qədər sürən ۱۹ illik bütün imamət dövrünü belə xülasə etmək olar: Atası İmam Səccad (ə) ömrünün son anlarında onu şiələrin rəhbəri və öz canişini seçir, digər övladlarının və yaxınlarının yanında bu vəzifəni ona tapşırır. Bəzi rəvayətlərə görə elmlə dolu olan, yaxud Allah rəsulunun silahının saxlandığı bir sandığı ona göstərib buyurur: "Ey Məhəmməd! Bu sandığı evinə apar". Sonra digərlərinə müraciətlə deyir: "Bu sandıqda dirhəm və dinar yoxdur, elmlə doludur".(۱) O bu



---

Bihar əl-ənvar", c. ۴۶, səh. ۲۲۹[۱۳۷] -۱

yolla elm və düşüncə rəhbərliyini və Peyğəmbərin (s) silahını - yəni inqilabi rəhbərlik .irsini ona ötürdüyünü bildirir

Şiəlikdə böyük dəyişiklik yaradan məqsədli dəvətin yayılmasında imamın və onun sadiq tərəfdarlarının geniş və əhatəli fəaliyyəti ilk anlardan yeni mərhələyə qədəm qoyur. Bu dəvətin əhatəsi o qədər geniş idi ki, şiələr yaşayan Mədinə və Kufə kimi bölgələrdən əlavə yeni bölgələri, xüsusən Bəni-Üməyyə hökumətinin mərkəzindən uzaq olan İslam bölgələrini də Şiə təfəkkür dairəsinə qatır. Bu arada Xorasanın adını xüsusi qeyd etmək lazımdır. Biz Şiə təbliğatının həmin bölgə əhalisinə təsirini müxtəlif (rəvayətlərdə görürük.(١

Bütün bu yorucu fəaliyyət əsnasında imamı və dostlarını dayanmadan hərəkətə vadar edən, ilahi vəzifəni anbaan onların yadına salan amil acınacaqlı olan ictimai və ideoloji reallıqdır. Onlar öz qarşılarında bir tərəfdən dağıdıcı təbliğat səbəbindən cəmiyyətin ümumi fəsadına günbəgün daha çox qərq olan, daha çox süquta uğrayan, tədricən hakim və məmurlar kimi xilasedici imamət dəvətinə qulaq asmayan insanlar görürlər, digər tərəfdən, hər şeyin, hətta dərsin, fiqhin, kəlamın, hədisin və təfsirin də Əməvi tağutlarının arzu və istəkləri istiqamətində olduğu bir şəraitdə insanların üzünə heç bir ümid bacası açıq deyil. Əgər şiəlik onları dəvət və hidayət etməyə qalxmasa, hidayət yolu onların üzünə bütünlüklə bağlanmış olar: Biz onları tərk etsək, bizdən qeyrisi (vasitəsi ilə hidayət olmazlar.(٢

İmam Baqir (ə) anormal ictimai durumu dərindən dərk etdiyinə görə elmi-mədəni qüvvələrə, yəni cəmiyyətdə qeyri-sağlam düşüncə mühiti yaradan satqın şair və alimlərə qarşı düşmən mövqeyini elan edir, öz məzəmmət qamçısını başlarına endirməklə onların yatmış vicdanında olmasa da, bixəbər ardıcıllarının beynində və ,qəlbində oyanış dalğası yaradır. İmam etiraz məqsədilə şair Kəsirə buyurur ki



---

.Bax: Bihar əl-ənvar, c. ۴۶, səh: ۳۳۶, ۳۵۷ [١٣٨] -١

.Bihar əl-ənvar, c. ۲۶, səh: ۲۵۳ [١٣٩] -٢

Əbdülməliki tərifləndin. O da ya biclikdən, ya da sadəlövhlükdən öz günahını yamamaq məqsədi ilə cavab verir ki, onu hidayətçi rəhbər adlandırmadım, ona şir, günəş, dəniz, əjdaha və dağ dedim; şir heyvandır, günəş cisimdir, dəniz cansız bir şeydir, əjdaha üfunətli vəhşidir, dağ da möhkəm daşdır. İmam bu uğursuz üzr və bəhanənin qarşısında mənalı təbəssüm edir, sonra inqilabçı və məqsədli şair olan Kumeyt ayağa qalxıb özünün Haşimi qəsidələrindən birini söyləyir, bununla həmin məclisdə iştirak edənlərin və sonradan bu hadisədən xəbər tutanların təsəvvüründə bu iki sənət əsəri (arasında müqayisə imkanı yaradır.(١

İbn Abbasın xalq arasında böyük hörməti olan məşhur şagirdi İkrimə imamın görüşünə gedir, onun vüqarından, mənəviyyatından, mənəvi və elmi əzəmətindən elə təsirlənir ki, ixtiyarsız halda imamı qucaqlayır və təəccüblə deyir: Mən İbn Abbas kimi böyük şəxsiyyətlərlə oturmuşam, amma onların qarşısında heç zaman bu vəziyyətə düşməmişəm. İmam cavabında buyurur: Vay olsun sənə, ey şamlıların kiçik qulu! Sən elə bir evdəsən ki, Allah o evdə adının yüksəlməsinə və yad edilməsinə icazə (vermişdir.(٢

İmam hər bir münasib fürsətdə Şiə həyatının acı və məşəqqətli reallığının bir hissəsini göstərməklə, hakim qüvvələr tərəfindən imama və onun dostlarına edilən təzyiqləri başa salmaqla xəbərsiz insanların hiss və emosiyalarını oyadır, onların ölü və durğun qanını cuşa gətirir, keyimiş qəlblərinə həcəyan bəxş edir - yəni onları radikal .təmayüllərə və inqilabi işlərə hazırlayır

Bir kişi o həzrətdən soruşur: Ey Peyğəmbər (s) övladı! Necə səhər etdiniz? İmam belə cavab verir: Hələ bizim necə olduğumuzu və necə səhər etdiyimizi bilmənizin vaxtı çatmayıbmı?! Biz firon cəmiyyətində Bəni-İsrail kimiyik; firon onların oğullarını öldürür, ,qızlarını saxlayırdı. Bilin ki



---

.İbn Şəhr Aşub. Əl-Mənaqib, c. ۴, səh: ٢٠٧ [١۴٠] -١

.Bihar əl-ənvar, c. ۴۶, səh: ٢۵٨ [١۴١] -٢

bunlar (Bəni-Üməyyə) də bizim oğullarımızı öldürür və qızlarımızı saxlayır. İmam bu güclü və tutarlı cümlədən sonra əsas məsələni - yəni Şiə iddiasının və Əhli-beyt hakimiyyətinin prioritet olmasını önə çəkir: Ərəblər elə bilirdilər ki, qeyri-ərəblərdən üstündürlər; çünki Məhəmməd (s) ərəbdir - qeyri-ərəblər də bununla razılaşırdılar. Qüreyş elə bilirdi ki, digər ərəb qəbilələrindən üstündür, çünki Məhəmməd (s) Qüreyşdəndir - digərləri də bununla razılaşırdılar. Əgər onlar bu iddiada səmimidirlərsə, deməli, biz Qüreyşin digər şaxələrindən üstünük. Çünki biz Məhəmmədin (s) övladları, ailəsiyik və bunda heç kim bizimlə ortaq deyil. Bu cavabdan bərk həyəcanlanmış kişi deyir ki, Allaha and olsun, biz siz Peyğəmbər ailəsini sevirik. Onu düşüncə, qəlb və əməl baxımından vilayət sərhədinə qədər gətirmiş imam son ayıldıcı sözünü də buyurur: Onda özünü bəlaya hazırla. Allaha and olsun, bəla bizim şiələrimizə selin dağın yamacına yaxın olduğundan da yaxındır. Bəla əvvəlcə bizə .gələr, sonra sizə; necə ki, rahatlıq əvvəlcə bizə çatar və sonra sizə

İmamın daha məhdud və etimadlı dairədə şiələrlə münasibətinin ayrı özəllikləri olmuşdur. Bu münasibətlərdə imamı sağlam bədən üzvləri ilə rabitədə olan mütəfəkkir .beyin və bədənə qan ötürən ürək kimi görürük

İmamın bu qrupla əlaqələrinə dair əlimizdə olan materiallar bir tərəfdən elm və düşüncə təlimlərində açıqlığı, digər tərəfdən isə imamla onlar arasında düşünülmüş .birliyi və təşkilatçılığı göstərir

İmamın ən yaxın sirdaş səhabələrindən olan Füzeyl ibn Yəsar həcc mərasimində imamla birgə idi. İmam Kəbənin ətrafına fırlanan hacılara baxıb buyurdu ki, cahiliyyətdə də belə fırlanırdılar; fərman budur ki, bizə doğru gəlsinlər, öz tərəfdarlıqlarını, sevgilərini bildirsinlər və yardım etməyə hazır olsunlar. Quran İbrahimin dilindən deyir: İlahi! Xalqın qəlbini ona müştaq et. İmamla ilk görüşündə Cabir Cöfiyə deyir ki, heç kimə Kufədən olduğunu söyləməsin və özünü

mədinəli kimi aparsın. O bununla sanki imamətin və şiəliyin sirlərini daşımaq üçün əvvəldən böyük qabiliyyət göstərmiş bu yeni şagirdinə sirr saxlamaq dərsi öyrədir. Bu .istedadlı şagird sonralar imamın sirdaş səhabəsi kimi tanınır

Nöman ibn Bəşir deyir ki, mən Cabirlə birgə həccə getmişdim. O, Mədinədə Əbu Cəfər İmam Baqirlə (ə) görüşdü və axırıncı gün o həzrətlə vidalaşıb sevincək yanından çıxdı. Biz Kufəyə sarı yollandıq, yoldakı mənzillərin birində bir şəxs bizə çatdı. Nöman o şəxsin əlamətlərini və onun Cabirlə qısa söhbətini danışır. Deyir ki, Cabirə bir məktub verdi. Cabir məktubu öpüb gözünün üstünə qoydu, sonra isə açıb oxudu. Məktubu oxuduqca kədərləndiyini hiss etdim. Onu sona çatdırıb bükdü və biz Kufəyə sarı yolumuza davam etdik. Mən ondan sonra Cabiri sevinən görmədim. Kufəyə çatdığımız günün ertəsi hörmət əlaməti olaraq onu görməyə getdim və gözlənilmədən qəribə mənzərə ilə rastlaşdım: Cabir uşaq kimi qarğıya minib, boynundan qoyun sümüyündən boyunbağı asmışdı. O, ağzına gələn şeirləri oxuya-oxuya evdən çıxdı, məni görüb heç bir söz demədi, mən də heç nə demədim, amma bu vəziyyətə görə ixtiyarsız olaraq məni ağlamaq tutdu. Uşaqlar bizim ətrafımıza toplaşdılar, o isə heç nə olmayıbmış kimi yola düşdü və gedib Rəhbəyə - Kufə məscidinin girişinə çatdı. Uşaqlar hər yerdə onun arxasınca qaçırdılar. Camaat bir-birinə deyirdi ki, Cabir ibn Yezid dəli olub. Bir neçə gündən sonra xəlifə Hişam ibn Əbdülməlikdən Kufə hakiminə bir məktub gəldi. Məktubda deyilirdi ki, araşdır gör Cabir ibn Yezid Cöfi adlı insan kimdir; onu tutub boynunu vur və başını mənə göndər. Hakim Cabiri soruşanda dedilər ki, əmir sağ olsun, o, hədis elmini bilən dəyərli bir alim idi, bu il həccə gedəndən sonra isə dəli olub, indi də Rəhbədə qarğı minib uşaqlarla oynayır. Nöman deyir ki, hakim buna əmin olmaq

üçün oraya getdi, Cabirin qarğı minərək oynadığını görüb, onu öldürməyə səbəb (qalmadığına görə Allaha şükür etdi.(۱)

İmamın yaxın dostları ilə əlaqə tərzinə dair bu nümunə düşünülmüş və təşkilati əlaqəni göstərir. Bu həmçinin hakimiyyətin belə səhabələrə qarşı mövqeyini də bəlli edir. Təbii ki, xilafətin hər şeydən çox öz mövqelərini qorumaq və möhkəmlətmək haqda düşünən məmurları imamın yaxın dostlarının fəaliyyətləri barədə tam xəbərsiz qalmır, az-çox məsələdən xəbər turur, öyrənməyə və onlara qarşı tədbir görməyə çalışırdılar. Tədricən o həzrətin həyatında, həmçinin ümumi şiələr arasında etiraz amili yaranır və Şiə imamlarının tarixində başqa bir dönəm başlayır. Tarixi mənbələrdə, həmçinin hədis kitablarında və digər əsərlərdə İmam Baqirin (ə) hakimiyyətə qarşı nisbətən sərt mübarizələri haqda yazılmamasının özü bir neçə səbəbdən irəli gəlir. Onların ən mühümü cəmiyyətin ciddi nəzarətdə olması və imamın siyasi həyatından xəbərdar olan yeganə mənbələr kimi səhabələrin təqiyyə etməsi idi. Lakin buna baxmayaraq, hər kəsin əməlinin gücünü onun düşməninin məqsədyönlü reaksiyalarından anlamaq olar. Tarixçinin ən qüdrətli Əməvi xəlifəsi adlandırdığı Hişam ibn Əbdülməlikin hakimiyyəti kimi güclü və siyasətçi bir rejim İmam Baqir (ə), yaxud başqa bir kəslə zor dili ilə danışırsa, deməli, ondan özünə təhlükə duyur və onun varlığına gözə bilmir. Şübhə yoxdur ki, İmam Baqir (ə) ideoloji və təşkilati quruculuqla məşğul olmayıb yalnız elmi işlər görsəydi, zorakılıq və sərt tədbirlər xəlifələrə və rejim başçılarına sərf etməzdi. Əvvəla sərt tədbirlə o həzrəti özləri əleyhinə qaldırmış olacaqdılar. Necə ki, o zamana yaxın dövrdə bunu müşahidə edirik; Fəxx şəhidi olan Hüseyn ibn Əlinin qiyamı belə baş verdi. İkinci tərəfdən, imamın sayları az olmayan tərəfdarlarını və dostlarını ,qəzəbləndirib hakimiyyətdən narazı salacaqdılar. Qısası budur ki



---

.Qamus ər-rical, c. ۲, səh: ۳۲۹-۳۳۰; Bihar əl-ənvar, c. ۴۶, səh: ۲۸۲-۲۸۳ [۱۴۲] -۱

İmam Baqirin (ə) ömrünün sonlarında xilafət rejiminin nisbətən sərt reaksiyasından o .həzrətin nisbətən radikal addımlar atdığını başa düşmək olar

### İmam Baqirin (ə) Şama çağırılması

İmamın həyatının sonlarında baş verən mühüm hadisələrdən ən məşhuru onun Əməvi dövlətinin paytaxtı olan Şama çağırılmasıdır. Xilafət qarşısında möveyini bilmək üçün Əməvi xəlifəsi İmam Baqiri (ə) və bəzi rəvayətlərə görə həm də gənc oğlu və yaxın həmkarı olan İmam Sadiqi (ə) tutub Şama göndərməyi əmr edir. İmamı Şama, xəlifənin sarayına gətirirlər. Hişam qabaqcadan öz ətrafına və məclisdə iştirak edənlərə imamla qarşılaşarkən nə etməli olduqlarını diktə etmişdi. Qərara gəlmişdilər ki, əvvəlcə xəlifənin özü və sonra məclisdə iştirak edən saray adamları və məmurlar imama sarı ittiham və məzəmmət seli yağdırsınlar. O bu işdə iki məqsəd güdürdü: biri bu idi ki, bu təhqirlərlə imamı ruhdan salsın və vəziyyətin tələb edəcəyi hər hansı işə şərait yaransın; ikincisi də bu idi ki, iki düşmən cəbhənin ən yüksək rəhbərləri arasında keçirilən görüşdə düşmənini günahkar çıxarsın və əmrə müntəzir dayanmış natiq və casuslarından ibarət təbliğatçıları vasitəsi ilə məğlubiyyət xəbərini yayıb onun başçılıq .etdiyi cəbhənin bütün üzvlərini tərk-silah etsin

Qayda belə idi ki, məclisə daxil olan şəxs Əmirəlmöminin ləqəbi ilə müraciət edib xəlifəyə salam versin. İmam isə daxil olanda bu qaydanın əksinə olaraq, üzünü bütün məclis iştirakçılarına tutub əli ilə işarə etdi və dedi: Əssəlamu əleykum. Sonra isə icazə .gözləmədən oturdu

Bu rəftara görə qəlbi hikkə və ədavətlə dolmuş Hişam məclisə başladı: Siz Əli (ə) övladları həmişə müsəlmanların vəhdətini pozmuş, onları öz rəhbərliyinizə dəvət etməklə nifaq salmış, ağılsızlıq və nadanlıqla özünüzü imam saymısınız. Bir qədər belə çərənləyib sakit oldu. Ondan sonra nökərlərinin

.və quyruq bulayanlarının hər biri bu məzmunda çıxış edərək imamı ittiham etdilər

Bütün bu müddətdə imam sakit oturmuşdu, hamı sükut edəndə isə ayağa qalxıb üzünü məclis iştirakçılarına tutdu. Allaha həmd və sənadan, Peyğəmbərə (s) salamdan sonra qısa və güclü cümlələrlə həmin təsadüfi qrupun məqsədsizliyini bildirdi, ixtiyarsız və alət olmalarını qamçı kimi başlarına vurdu. Özünün mövqeyini və ailəsinin ən üstün İslam meyarı olan hidayətə uyğun şərəfli keçmişini bəyan etdi və nəhayət, Allahın tarixi ənənələrinə bərabər olan yolunun yaxşı aqibətli olmasını söyləyib onların zəif ruhiyyəsini daha da zəiflətdi. Buyurdu ki, ey insanlar, haraya gedirsiniz?! Sizin üçün hansı aqibət nəzərdə tutulmuşdur?! Allah bizim vasitəmizlə sizin ata-babalarınızı hidayət etdi, bizim əlimizlə də işlərinizin sonuna möhür vuracaq. Siz bu gün hakimiyyətdəsinizsə, biz sonra hakimiyyətdə olacağıq və bizim hökumətimizdən sonra heç bir hökumət gəlməyəcək. Allah buyurmuşdur: Aqibət təqvalılara məxsusdur. Bu (aqibət bizə aiddir.(۱)

Məzlumluq və amirliyin, müjdə və təhdidin, təsdiq və inkarın olduğu bu qısa və məzmunlu çıxış o qədər güclü və təsirlidir ki, yayılsa və insanlara çatsa, hər bir dinləyicini onu deyənin haqlı olmasına inandıra bilər. Bu sözə cavab vermək üçün özünəinam və arxayınlıq qədər ədiblik və natiqlik də lazımdır. İmamın müraciət .etdiklərində isə bunlar yoxdur; deməli, zor və şiddətdən başqa bir çarə qalmır

Hişam imamı zindana salmağı əmr edir. O bu əməli ilə özünün ruh düşkünlüyünü və məntiq çatışmazlığını etiraf etmiş olur. İmam zindanda maarifləndirmə aparır, həqiqətləri çatdırır və digər dustaqlara təsir göstərir. Belə ki, dustaqlar arasında onun sözünü ürəkdən qəbul etməyən və ona vurulmayan bir kəs qalmır. Məmurlar vəziyyəti Hişama məruzə edirlər. Bu hal Şamı on illərlə xüsusi formada Şiə təbliğatından uzaq saxlamış bir rejim üçün əsla qəbuledilməsi



---

.Bihar əl-ənvar, c. ۴۶, səh:۲۶۴ [۱۴۳]-۱

deyil. Hişam imamı və yoldaşlarını zindandan çıxarmağı əmr edir, onlar üçün heç bir yerin yaşadıqları Mədinə şəhərindən uyğun olmadığını düşünür; təbii ki, həmişəki və bəlkə bir qədər də güclü nəzarət şərti ilə. Lazım olanda da son zərbəni endirsinlər, rəqibini öz evində, yatağında səssiz-səmirsiz öldürsünlər və imamı öldürmək cinayəti boyunlarında qalmasın. Hişamın əmri ilə onları yol boyu dayanmayan sürətli atlara mindirib Mədinəyə qədər çapdılar. Öncədən əmr etmişdilər ki, yoldakı şəhərlərdə heç kimin bu sevilməyən karvanla alış-veriş etməyə, onlara çörək və su satmağa haqqı .yoxdur.(١) Üç sutka bu vəziyyətlə getdilər, su və çörək ehtiyatları tükəndi

Gəlib Mədinə şəhərinə çatdılar. Əmrə uyğun olaraq şəhər əhalisi qapıları bağladı və onlara bir şey satmadı. İmamın tərəfdarları aclıqdan və susuzluqdan şikayət etdilər. İmam şəhərdəki hündür bir təpənin başına çıxıb uca səsi ilə əhaliyə müraciət etdi: Ey zalımlar şəhərinin əhalisi! Mən Allahın Əgər mömin olsanız, Allahın saxladığı ehtiyat sizin üçün yaxşıdır(٢) buyurduğu ehtiyatıyam! Gözlənilmədən zamanında göstərilən bir sayıqlıq və cəsarət təxribatı zərərsizləşdirdi. Şəhər əhalisindən bir nəfər aldanmış və bixəbər camaata xatırlatdı ki, bu, Şüeyb peyğəmbərin öz dövrünün azğınlarına etdiyi fəryaddır. Onlara başa saldı ki, bir zaman ata-babalarının qaldıqları mesaj qarşısında qalmışlar. Bu gün onlar həmin mesajı eşitmədiklərinə görə öz ata-babalarını lənətləyirlər. Bəli, tarix təkrar olunmuşdur. İndi də həmin mesaj, həmin şəxs və həmin dinləyicilərdir. Yerində deyilən bu söz ürəklərə hopdu, qapıları açdılar və xilafətin (qadağasına baxmayaraq, onun düşmənini qəbul etdilər.(٣



---

Bəzi rəvayətlərə görə, yoldakı şəhərlərin əhalisinə demişdilər ki, Məhəmməd [١۴۴] -١ ibn Əli (ə) və Cəfər ibn Məhəmməd (ə) İslam dinindən dönüb məsihi olmuşlar: Bihar əl-.ənvar, c. ۴۶, səh: ٣٠۶

.Hud/٨۶ [١۴۵] -٢

.Bihar əl-ənvar , c. ۴۶, səh: ٢۶۴ [١۴۶] -٣

Bu tarixi rəvayətin son hissəsi bir neçə cəhətdən dövrün siyasi vəziyyətini, repressiyanı və ümumi avamlığı, digər tərəfdən isə İmam Baqirin (ə) Bəni-Üməyyə hakimiyyətinə qarşı mövqeyini göstərir. Bu hissədə deyilir ki, Mədinədə baş verənlər Hişama çatdırılanda hər şeydən çox xilafət başçılarının planı əleyhinə danışmağa və xalqı böyük cəhalətdən oyatmağa cəsarət edən bu kişinin cəzalandırılmasını əmr etdi. .Və xəlifənin əmri ilə onu qətlə yetirdilər

Bunlara baxmayaraq, imam hakimiyyətlə döyüşdən çəkinir, xəncərə əl atmır, tələsərək xəncərin dəstəyini sıxan barmaqları da açır, onları uzaqgörənliyə və mövqeyi daha yaxşı tanımağa vadar edir. Əsaslı səbəb olmadan dil xəncərindən də istifadə etmir. Hissiyyat burulğanında dözümünü itirmiş və cana gəlmiş qardaşı Zeydə qiyam icazəsi vermir. Adi münasibətlərdə və sınanmamış qüvvələrlə əlaqədə ən çox elmi-mədəni fəaliyyətlər üzərində dayanır, eyni zamanda həm ideoloji bünövrə quran, həm də siyasi təqiyyə sayılan işlər görür. Lakin öncəki qısa işarələrdən də göründüyü kimi, bu məqsədyönlü taktika imamət hərəkətinin ümumi istiqamətini onun yoluna iman gətirən yaxın dostlara və həqiqi şiələrə göstərməsinə mane olmur. O, qaçılmaz mübarizə yolu ilə İslam və Əli (ə) hakimiyyəti qurmaqdan ibarət olan böyük Şiə amalını onların qəlbində canlandırır, hətta münasib zamanlarda bu istiqamətdə lazımi həddə .hisslər də oyadır

Çox da uzaq olmayan gözəl gələcək müjdəsi İmam Baqirin (ə) ümidverici üsullarından olub, həm də o həzrətin Şiənin tədrici hərəkətində öz mövqeyini harada və hansı mərhələdə gördüyünü göstərir. Rəvayətdə deyilir ki, Əbu Cəfərlə (ə) birgə idik, ev adamla dolu idi. Bir qoca məclisə daxil oldu və salam verib dedi: Ey Peyğəmbər (s) övladı! Allaha and olsun, mən sizi və sizi sevənləri sevirəm. Allaha and olsun, bu sevgi maddiyyata tamahdan deyil. Mən sizin düşməninizi özümə düşmən bilirəm və bu ədavət onlarla bizim aramızda qan töküldüyünə görə deyil. Allaha and olsun, mən sizin əmr və

qadağalarınızı qəbul edir və sizin qələbənizi gözləyirəm. Deyin görüm buna ümid bəsləyə bilərəmmi, sənə qurban olum? İmam kişini yanına çağırıb ona yer verdi və dedi: Ey kişi! Bir nəfər atam Əli ibn Hüseyndən (ə) eynilə bu sözü soruşdu. Atam ona cavab verdi ki, bu intizarla ölsən, Peyğəmbərin (s), Əlinin (ə), Həsənin (ə), Hüseynin (ə) və Əli ibn Hüseynin (ə) yanına gedərsən, ürəyin şad, halın xoş, gözün işıqlı olar, Allahın böyük bəndələri ilə birgə rahatlıq içərisində olarsan; əgər sağ qalsan, bu dünyada gözünün aydınlaşacağı və bizimlə, bizim yanımızda ən üstün mövqeyə çatacağın günü görəcəksən. Kişi gedərkən imam ona baxıb buyurdu: Kim cənnət adamını görmək istəyirsə, bu kişiyə baxsın(١).

Bəzən hətta bundan da irəliyə gedib qələbə ilini təyin edir və Şiənin qədim arzusunun həyata keçəcəyini söyləyir. Əbu Həmzə Sumali deyir ki, İmam Baqir (ə) Allahın bu işi - Əli (ə) hökumətinin qurulmasını ٧٠-ci ilə təyin etdiyini deyirdi. İmam Hüseyn (ə) öldürüləndə isə Allahın insanlara qəzəbi tutdu və bu tarixi ١۴٠-cı ilə qədər təxirə saldı. Biz bu zamanı siz yaxın dostlara dedik və siz bu sirri açdınız, ondan sonra isə Allah bunun üçün zaman təyin etmədi; Allah istədiyini məhv edər, istədiyini möhkəmlədər. Əbu Həmzə deyir ki, bu sözü Əbu Abdullah İmam Sadiqə (ə) dedim, o da təsdiqlədi.(٢)

Belə sözlər öldürücü təzyiqlərlə dolu olan həmin repressiv mühitdə şirin röya kimi görünən İslam quruluşunu və Əli (ə) hökumətini qəti və qaçılmaz gələcək kimi göstərir, şiələrin məzlum qəlbinə ümidverici və hərəkətverici işıq salır, yolu qət etmək üçün onların güc və itaətkarlığını artırır.

İmamın ١٩ illik rəhbərlik dövrünün hamısı bu vəziyyətdə keçir. Bu ١٩ ildə həm ideoloji təlim var, həm fərd quruculuğu; həm mübarizə taktikası var, həm də təşkilat yaratmaq və onu idarə etmək; həm siyasi istiqaməti qorumaq və davam etdirmək var,



---

١- [١۴٧] Yenə orada, səh: ٣۶١-٣۶٢.

٢- [١۴٨] Əl-Kafi, c. ١, səh: ٣۶٨.

həm də təqiyyə, daha çox və daha güclü ümid yaratmaq. Bu ۱۹ il mübarizə ilə, sıldırım qayalar arasında cidd-cəhdlə ötdü. Nəhayət, bu qısa və səmərəli ömür sona çatanda, Əli (ə) hərəkatının qatı düşmənləri bu hərəkatın başçısının vəfatından sonra rahat nəfəs alacaqlarını, Şiə mübarizələrindən qurtulub, özlərinin ölkə daxilində və sərhədlərdəki saysız-hesabsız problemləri ilə məşğul olacaqlarını düşünəndə bu ocağın isti və yandırıcı közü özünün son güclü qığılcımını Əməvi rejiminin kökünə endirir. Ömrünü ifşaçılıq və maarifləndirmə ilə keçirmişdi, öləndən sonra da eyni işi davam etdirir; öz həyatı ilə ayıqlıq vermişdi, ölümü ilə də eyni missiyanı yerinə yetirir, anlamaq və düşünmək təşnəsi olan bixəbər xalqa və öz dostlarına yeni dərs və mesaj buraxır. Bütün həyatı kimi bu mesaj da sakit və güclüdür; dostlara və ehtiyaclılara fayda yetirir, düşmənin yuxusunu pərişan edir. Bu, İmam Baqirin (ə) təqiyyəsinə bir .nümunə və bu xüsusi mərhələdə rəftarının göstəricisidir

Sonralar İmam Baqirin (ə) həyatını yazanlar da qısa bir hədisə sığışdırılmış bu böyük hərəkətin kənarından biləərəkdən, ya da bilmədən ötüblər. Onu görmədiklərini söyləmək olarmı? Konkretləşdirək: İmam öz oğlu Cəfərə (ə) tapşırır ki, əmlakının ۸۰۰ dirhəmini on il ərzində onun əzadarlığına sərf etsin. Əzadarlığın yeri Mina səhrası, zamanı isə həcc mərasimi olsun.(۱) Bu qədər. Həcc mövsumu bir-birindən uzaq düşən və bir-birini tanımayan qardaşların görüş yeridir. O zaman minlərlə insan həmin yerdə toplaşmaq və birləşmək imkanı əldə edir. Dilləri bir olmasa da, qəlbləri bir olan insanlar orada eyni dillə Allahı çağırır və xalqların bir bayraq altında toplaşma möcüzəsinə tamaşa edirlər. Bütün İslam dünyası üçün hər hansı mesajdan ötrü bundan münasib fürsət yoxdur. Həcc əməlləri bir neçə gün və bir neçə yerdə baş verir. Bu günlərin və bu məkanların hansı daha münasibdir? Məkkə şəhərdir və insanlar oraya səpələnib hərəsi öz işi ilə məşğul



---

.Bihar əl-ənvar , c. ۴۶, səh: ۲۱۵, ۲۲۰ [۱۴۹]-۱

olur. Həm də orada hamı həcc əməllərini yerinə yetirir; təvaf, səy, namaz və s. Məşər gecə dayanacağıdır, orada vaxt az və imkan zəifdir; Minaya gedən yolda yalnız bir dayanacaq sayılır. Ərəfat gündüz dayanacağı olsa da, müddəti qısadır, yalnız bir gün sürür; yorğun halda səhər orada dayanır və axşama yaxın hərəkət edirlər. Ən münasib yer Minadır. Hacı Ərəfatdan dönəndə üç gecə orada qalır. Bu yerdə tanışlıq, söhbət və dərdləşmə imkanı hər yerdən çoxdur. Kimdir gündüzlər Məkkəyə gedib, bir də qayıdan?! Ora qalmaq, hər bir qrupa baş çəkmək üçün münasib yer və zamandır. Təbii şəkildə hər kəsin yolu ildə üç gün bu səhrada təşkil olunan əza məclisinə düşür, yavaş-yavaş müxtəlif yerlərin əhalisi onunla tanış olur. İllərdir İslamın mərkəzi, böyük səhabələrin, fəqih və hədisşünasların vətəni olan Mədinə əhalisinin bir qrupu bu günlərdə burada məclis keçirir. Kimin üçün? İslam dünyasının ən parlaq şəxsiyyətlərindən biri, Peyğəmbər (s) ailəsindən böyük insan, fəqih və hədisşünasların başçısı, fiqh və hədis elmində bütün məşhur şəxslərin müəllimi olmuş Məhəmməd ibn Əli ibn Hüseyn (ə) üçün. Nə üçün hər yerdən buraya gəlir və məclis keçirirlər? Məgər onun ölümü təbii olmamışdır? Onu kim və nə üçün öldürmüş, zəhərləmişdir? Məgər o nə edirmiş, nə deyirmiş? Onun bir iddiası olmuşdurmu, hansısa çağırış etmişdirmi? Xəlifə üçün təhlükəli insanmı olmuşdur? Onlarla sual və şübhə, bunun ardınca isə əza sahibləri, eləcə də orada-burada cəmiyyətin arasına səpələnmiş məlumatlı insanlar tərəfindən cavab seli. Onlar Mədinədən, Kufədən elə bu suallara cavab vermək üçün gəlmişlər. Gəlmişlər ki, misilsiz fürsətdə bütün İslam dünyasından buraya toplaşmış insanlara həqiqətləri başa salsınlar, həmçinin qardaş və dostları ilə görüşsünlər, xəbər versinlər, fərman alsınlar. Şiə dəvəti o dövrün beynəlxalq təbliğat şəbəkəsinin minlərlə ən möhtəşəm kanalı ilə həyata keçirdi. İmam Baqirin (ə) uğurlu planı budur: ölümdən sonra cihad planı. Həyatı və ölümü Allah üçün və Allah yolunda olan səmərəli varlıq budur: Ona səh:٢٠٠

doğulduğu gün də, öləcəyi gün də, (qiyamətdə) diriləcəyi gün də salam olsun!(۱) (Sadiq
(rəhbər, səh: ۳۳-۵۴

səh:۲۰۱

---

.Məryəm/۱۵ [۱۵۰] -۱

## On birinci fəsil: Bəni–Üməyyə hakimiyyətinin sonları və İmam Sadiqin (ə) imaməti

### İşarə

İmam Baqir (ə) ən qüdrətli Bəni-Üməyyə xəlifələrindən biri olan Hişam ibn Əbdülməlikin şahlığı dövründə ۵۷ yaşında vəfat etdi. Böyük müsəlman ölkəsinin hər tərəfində mövcud olan gərginlik, Əməvi hökumətinin saysız-hesabsız problemləri Hişamın Şiə təşkilatının döyünən ürəyi İmam Baqirə (ə) qarşı təxribat və bədxahlığına mane olmurdu. Muzdurları onun tövsiyəsi ilə imamı zəhərlədilər, zalım Əməvi tağutluğu ölkənin qərb və şərq sərhədlərindəki zəfərlərinin həzzini ölkə daxilindəki ən .böyük və ən təhlükəli düşmənini qətlə yetirməklə tamamladı

Bəni-Üməyyə rejimi İmam Baqirin (ə) həyatının son illərində və övladı İmam Sadiqin (ə) imamlığının ilk illərində özünün ən macəralı dönəmlərindən birini yaşayırdı. Bir tərəfdən şimal-şərq sərhədlərində yerləşən Türküstan və Xorasana, şimalda yerləşən Ön Asiya və Azərbaycana, Qərbdə yerləşən Afrika, Andalos və Avropaya hərbi yürüşlər edilirdi, digər tərəfdən də Ərəb İraqı, Xorasan və Şimali Afrika bölglərində əsasən narazı və məzlum yerlilər tərəfindən, bəzən də monqol Əməvi sərkərdələrinin təhriki, yaxud yardımı ilə ardıcıl qiyamlar baş verirdi. Həmçinin hər yerdə, xüsusən də Bəni-Üməyyənin böyük mülkədarlarının məskəni, əksərən xəlifəyə, yaxud digər dövlət başçılarına məxsus məhsuldar torpaq olan İraqın qarışıq etnik durumu, Hişamın və onun İraqda qüdrətli valisi olan Xalid ibn Abdullah Qəsrinin fantastik israfçılıqları, quraqlıq və müxtəlif yerlərdə, o cümlədən Xorasanda, İraqda və Şamda yayılmış taun xəstəliyi Bəni-Üməyyə rejimi və onun ən məşhur başçılarından biri tərəfindən idarə olunan böyük müsəlman məmləkətinə qəribə görünüş verirdi. İslam dünyasının ən ,mühüm itkisini - mənəvi

.elmi və düşüncə itkisini də bütün bunlara əlavə etmək lazımdır

Yoxsulluğun, müharibənin və xəstəliyin Əməvi hökmdarlarının istibdadından yaranan bir ildırım kimi zavallı insanların başına çırpıldığı, yandırıb külə çevirdiyi pərişan və qəmli cəmiyyətdə fəzilət, təqva, əxlaq və mənəviyyat ağacının cücərməsi qeyri-mümkünlər sırasında idi. Yazıq və məzlum xalqa arxa durmalı olan ruhani, qazi, hədisçi və təfsirçilər nəinki düyün açmır, çox zaman özləri də bir şəkildə və bəzən siyasət adamlarından da təhlükəli formada xalqın problemlərini artırırdılar. Fiqh, kəlam, hədis elmlərinin və sufiliyin məşhur şəxsiyyətləri, o cümlədən Həsən Bəsri, Qütadə ibn Diamə, Məhəmməd ibn Şahab Zöhri, İbn Bişr, Məhəmməd ibn əl-Münkədir, İbn Əbi Leyla və onlarla belə alim əslində xilafətin fiqurlarına, yaxud əmir və hakimlərin .oyuncaqlarına çevrilmişdilər

Təəssüflüdür ki, belə nüfuzlu şəxsiyyətlərin həyatını araşdırarkən insanda çirkin arzulara - vəzifə, ad-san, mal-dövlət istəyinə bulaşmış insanlar, yaxud qorxaq, əskik və rahatlığını düşünən zavallılar, yaxud riyakar və axmaq zahidlər, yaxud qanlı kəlam .və etiqad mübahisələri ilə məşğul olan alimnümalar təsəvvürü yaranır

Yaxşı etiqad və xarakterləri dirçəltməli olan Quran və hədis hakim qüvvələrin əlində alətə, yaxud belə bədbəxt və azğın ünsürlərin səmərəsiz ömrünün məşğulluğuna .çevrilmişdi

Belə zəhərli, qapalı və qaranlıq mühitdə, ağır və çətin dövrdə İmam Sadiq (ə) ilahi əmanət yükünü üzərinə götürdü. Şiə ədəbiyyatında mövcud olan mütərəqqi imamət məfhumu belə ağır və qaranlıq dövrün sərgərdan, aldanmış, məzlum və çaşqın insanları üçün həqiqətən çox zəruri və həyatidir. Dedik ki, imamət iki həyati amilin qaynağıdır: düzgün İslam təfəkkürünün və ədalətli tövhid quruluşunun. İmamın üzərinə də bu iki vəzifə düşür. O əvvəlcə məktəbi izah etməli, başa salmalıdır. Bunun özü təhriflərlə, cahil və qərəzli fəaliyyətlərlə mübarizəyə də şamil olur. Bundan sonra isə

haqlı tövhid quruluşunun əsasını qoymaq, ona şərait yaratmaq və belə bir quruluşun olduğu təqdirdə onu davam etdirmək lazımdır. İndi belə bir əlverişsiz şəraitdə İmam Sadiq (ə) bu əmanət yükünü və sözügedən iki vəzifəni üzərinə götürür; hər iki vəzifə eyni zamanda onun üzərinə düşür. Hansına daha tez başlayacaq? Düzdür, siyasi işlər çox çətindir; elə bir şey deyil ki, Hişam Əməvi bütün məşğuliyyət və problemlərinə baxmayaraq, onu bağışlasın və ondan ağır intiqam almasın. Düşüncə fəaliyyəti, yəni təhriflə mübarizə isə əslində xilafətin – təhrif olunmuş dinə əsaslanmadan yaşamağa qadir olmayan rejimin şah damarını kəsmək deməkdir. Deməli, bunu da ona bağışlamayacaqlar; nə Hişam, nə də azğın cəmiyyətin ümumi istiqamətində hərəkət .edən və fəaliyyət göstərən din alimləri

Digər tərəfdən, Şiə məzhəbinin inqilabi təfəkkürünü genişləndirməyə şərait vardır. İnqilab doğuran üç amil kimi müharibə, yoxsulluq və istibdad var, qabaqkı imamın .fəaliyyəti də yaxın və hətta uzaq bölgələrdə müəyyən imkanlar yaratmışdır

İmamətin ümumi strategiyası xalqın bir qrupunun imamət ideologiyasını qəbul edib həvəslə həyata keçməsini gözlədiyi, başqa bir qrupun isə ciddi mübarizə təşkilatına qoşulduğu cəmiyyətdə tövhid və Əli (ə) inqilabı etməkdir. Bu ümumi prosesin məntiqi şərti Şiə təfəkkürünü yaymaq və məxfi Şiə təşkilatını bacarıqlı və fədakar kadrlarla təmin etmək üçün bütün İslam dünyasında ümumi təbliğat aparmaqdır. Həqiqi imamət dəvətinin çətinliyi də bundadır. Hakimiyyəti hər növ zorakılıqdan, təcavüzkarlıqdan, xalqın azadlıq hüququnu tapdamaqdan uzaq saxlayıb İslamın əsas prinsip və meyarlarına cavab verən ideal bir dəvət mütləq xalqın şüuruna güvənməli və onların təbii ehtiyac hissinin fonunda inkişaf etməlidir. Əksinə olaraq, zahirdə ideoloji şüarlarla işə başlayan, əməldə isə bütün hakim qüvvələr kimi dəyənək göstərən, özünün əxlaqi və ictimai prinsiplərinə göz yuman mübarizələrdə belə çətinlik yoxdur. İmamət hərəkatının uzunluğunun, həmçinin bu hərəkata paralel hərəkatların,

məsələn Abbasilər hərəkatının inkişafının və nisbi məğlubiyyətinin sirri budur. Bu .məsələni tarixi faktlarla və daha geniş şəkildə izah edəcəyik

Əlverişli şərait, həmçinin qabaqkı imamın yaratdığı imkanlar İmam Sadiqin (ə) Şiə hərəkatının uzun məşəqqətlərindən sonra şiələrin illərlə gözlədiyi həqiqi ümid və öz sələflərinin qədim mübarizəsini səmərəyə çatdırıb Şiə inqilabını geniş İslam dünyası miqyasında həyata keçirəcək qaim - qiyamçı olmasına səbəb olurdu. İmam Baqirin (ə) işarələri və bəzən hətta açıq sözləri bu arzunun yaranmasında təsirli olmuşdu. Cabir ibn Yezid deyir ki, bir nəfər İmam Baqirdən (ə) ondan sonrakı qiyamçı haqda soruşdu. İmam əli ilə oğlu Əbu Abdullahın çiyninə vurub dedi ki, and olsun Allaha, Məhəmməd ((s) ailəsinin qiyamçısı budur.(۱) (Sadiq rəhbər, səh: ۵۴-۶۱

**İmam Sadiqin (ə) həyatının tanınmaz qalması**

Burada İmam Sadiqin (ə) həyatını araşdıranlar üçün ən təəssüflü məqamlardan birinə toxunmaq istəyirəm. O da budur ki, imamın xüsusən Bəni-Üməyyə hakimiyyətinin sonlarına təsadüf edən ilk imamət illəri tanınmaz və qarışıqdır. Yüzlərlə tarixi rəvayətdən anlaşılan keşməkeş və təlatüm dolu bu həyat nə tarixdə, nə də hədisşünas və təzkirəçilərin sözlərində nizamlı formada işıqlandırılmış, əksər hadisələrin zamanı və xüsusiyyətləri yazılmamışdır. Tədqiqatçı müəyyən tarixi qeydlərə əsaslanaraq dövrün ümumi hadisələrini nəzərə almalı, şəxs, yaxud hadisələr barədə hər bir rəvayəti digər mənbələrdən əldə olunan məlumatlarla müqayisə etməli, hadisənin zaman, məkan və xüsusiyyətlərini kəşf etməlidir. Bəlkə də xüsusən imamın tərəfdarları ilə birgə təşkilati fəaliyyətlərindəki bu qaranlığın səbəblərindən .birini uyğun işlərin mahiyyətində axtarmaq lazımdır



---

.Bihar əl-ənvar, c. ۴۷, səh: ۱۳۱ [۱۵۱] -۱

Təbii ki, təşkilati işlərin gizli qalması üçün məxfilik prinsiplərinə əməl olunmalıdır. Belə olduqda o zaman da, ondan sonra da məxfi qalır və səhabələrin sirdaşlığı yad insanların xəbər tutmasına imkan vermir. Belə bir təşkilat qələbə çalıb hakimiyyətə gələndə özü məxfi işlərinin üstünü açır. Məhz buna görə Abbasilər hərəkatının çoxlu gizli işləri, hətta başçıların xüsusi fərmanları və dəvət çağında təşkilat üzvləri ilə gizli .təmasları tarixdə qeyd olunmuşdur və hamının xəbəri var

Əgər Əli (ə) hərəkatı da qələbə çalsaydı, Şiə imamları, yaxud onların seçdiyi qüvvələr hakimiyyətə gəlsəydilər, şübhəsiz, biz bu gün imamların siyasi fəaliyyətlərinin, çox .geniş və gizli təşkilatlarının bütün sirlərindən xəbərdar olardıq

Başqa bir səbəbi tarixçilərin və tarixçiliyin mahiyyətində axtarmaq lazımdır. Məzlum və məğlub bir qrupun rəsmi tarixdə yalnız adı varsa və ondan bir xatirə qeyd olunmuşsa, deməli, qalib və zalım cinah yalnız bu həddə yazılmasını istəmişdir. Rəsmi tarixçilər müxalifləri pisləyən sözləri qoyub çox əziyyətlə müxaliflərin sözlərini tapmır və böyük riskə gedib qeyd etmirlər. Onlar əziyyətsiz-qorxusuz hakim qüvvələrin çoxlu sözlərini .asanlıqla əldə edərək yazır, bundan ötrü mükafat da alırdılar

İndi bu aydın həqiqətə başqa bir reallığın kənarında nəzər salmaq istəyirik. Sonrakı tədqiqatların əksərinin qaynağı sayılan və İmam Sadiqin (ə) həyatından ۵۰۰ il sonraya qədər yazılan bütün məşhur və mötəbər tarixlər Abbasilərin xeyrinədir. Bilirik ki, Abbasi xilafəti hicrətin yeddinci əsrinin ortalarına qədər davam etmiş, bütün məşhur və qədim tarixlər də bu qüdrətli sülalənin hakimiyyəti dövründə yazılmışdır. Belə olduqda isə nəticəni təxmin etmək olar. Abbasi dövrünün tarixçisindən gözləmək olmaz ki, İmam Sadiqin (ə), yaxud başqa bir Şiə imamının həyatına dair düzgün və dolğun informasiya tapıb kitabında qeyd etsin. İmam Sadiqin (ə) həyatında bir çox .təhrif və qaranlıq məqamların səbəbi budur

Bizi imamın həyatının ümumi xətti ilə tanış edən yeganə yol budur: bu qaranlıq məqamlar arasından o həzrətin həyatının mühüm qrafiklərini tapıb, təfəkkür və əxlaqının ümumi meyarları kimi tanıdığımız amillərin köməyi ilə həyatının əsas xətlərini təsvir edək, bundan sonra isə ayrı-ayrı məsələləri və zərif məqamları açmaq üçün (müxtəlif tarixi və qeyri-tarixi dəlil və faktları araşdıraq. (Sadiq rəhbər, səh: ۶۵-۶۸

səh:۲۰۷

## (On ikinci fəsil: İmam Sadiq (ə

### İşarə

İmam Səccadın (ə) və İmam Baqirin (ə) çoxlu fəaliyyətləri nəticəsində vəziyyət Peyğəmbər (s) ailəsinin xeyrinə çox dəyişmişdi. Mən iki kəlmə ilə İmam Baqirin (ə) və İmam Sadiqin (ə) planını açıqlamaq istəyirəm. O zaman bu, sirr idi. Eşitmisiniz ki, deyirlər məsələn, Cabir ibn Yezid Cöfi sirr sahiblərindən idi; deyirdilər ki, Allah bizim sirrimizi açan şəxsə lənət eləsin və sair. İndi mənim söyləmək istədiyim də həmin sirlərdəndir, lakin bu gün bunu açmağın nəinki eybi yoxdur, hətta imamın nə etmək istədiyini bilmək üçün vacibdir də. İmam Sadiqin (ə) planı bu idi ki, İmam Baqirin (ə) vəfatından sonra qiyam edib Bəni-Üməyyə hakimiyyətini devirsin. O zaman Bəni-Üməyyə rejimi olduqca zəif idi. İmam Sadiqin (ə) qurduğu Şiə şəbəkəsi Xorasana, Reyə, İsfahana, İraqa, Hicaza, Misirə, Mərakeşə və digər müsəlman bölgələrinə yayılmışdı. Onların hamısı Mədinəyə toplaşmalı, İmam Şama yürüş etməli, Şam hökumətini devirib öz xilafət bayrağını ucaltmalı və Mədinəyə gələrək Peyğəmbər (s) .hökuməti qurmalı idi. İmam Sadiqin (ə) planı bu idi

Buna görə də İmam Baqirin (ə) son günlərində Məhəmməd (s) ailəsinin qiyamçısı haqda söhbət düşəndə İmam Sadiqə (ə) baxıb buyururdu ki, qiyamçı budur. Bildiyiniz kimi, Məhəmməd (s) ailəsinin qiyamçısı sözü ümumi addır, yalnız on ikinci imama məxsus deyil. Dövrümüzün imamı Məhəmməd (s) ailəsinin son qiyamçısıdır, amma bu ailənin istər qələbə çalan, istərsə də qalib gəlməyən bütün imamları Məhəmməd (s) ailəsinin qiyamçılarıdır. Rəvayətlərdə deyilir ki, bizim qiyamçımız qiyam edəndə filan işləri görəcək, rifah yaradacaq, ədaləti bərqərar edəcək və sair. O zaman bu sözlərdə məqsəd on ikinci imam deyildi; məqsəd bu idi ki, haqq və ədalət hakimiyyətini qurmalı olan şəxs qiyam edəndə bu işləri görəcək. Və həqiqətən elə idi; o zaman İmam Sadiq .(ə) Məhəmməd (s) ailəsinin qiyamçısı olmalı idi. O, belə bir vəziyyətdə imamətə çatdı

İmam Sadiq (ə) mübarizə, elm və təşkilat adamı idi. Onun elm adamı olmasını hamınız çox eşitmisiniz. İmam Sadiqin (ə) dərsləri və tədris dairəsi ondan həm öncə, həm də sonra imamların həyatında misilsiz idi. İmam Sadiq (ə) bir əsrdən artıq müddətdə qərəzli, azğın, yaxud cahil insanlar tərəfindən təhrif olunmuş bütün düzgün İslam sözlərini və əsl Quran təlimlərini düzgün formada bəyan etdi və bu, düşmənin qorxuya düşməsinə səbəb oldu. Siz bunları eşitmisiniz, amma onun mübarizə adamı olmasını az eşitmisiniz. İmam Sadiq (ə) geniş və müntəzəm bir mübarizə ilə məşğul idi, hakimiyyətə gəlmək, İslam və Əli (ə) hökuməti qurmaq üçün mübarizə aparırdı, Əməviləri devirib onun yerinə əsl İslam hökuməti - Əli (ə) hökuməti qurmağa çalışırdı. .İmam Sadiqin (ə) həyatını diqqətlə mütaliə edənlərə bu aydındır

Çoxlarının ümumiyyətlə eşitmədiyi üçüncü məsələ isə onun təşkilat adamı olmasıdır. İmam Sadiq (ə) uzaq Xorasandan və Orta Asiyadan Şimali Afrikaya qədər bütün İslam dünyasında Əli (ə) hökumətinin tərəfdarlarından ibarət böyük bir təşkilat yaratmışdı. Təşkilat nə deməkdir? Yəni İmam Sadiq (ə) xalqın bilməsi lazım olan hər bir sözü bütün İslam dünyasında olan nümayəndələri vasitəsi ilə xalqa çatdırır və onlar hər yerdən Əli (ə) ailəsinin böyük siyasi mübarizəsini idarə etmək üçün şəriət ödəncləri və büdcə toplayırlar. İmam Sadiqin (ə) ardıcılları onun bütün şəhərlərdə olan vəkil və nümayəndələrinə müraciət edir, dini və siyasi vəzifələrini soruşurlar. Siyasi vəzifə də dini vəzifə kimi vacibdir. İtaəti vacib olan şəxsin və əmr sahibinin namaz, zəkat, oruc və digər dini fətvaları ilə siyasi fətvaları, cihad, siyasi münasibətlər, ölkədaxili məsələlər və digər sahələrə dair fərmanı eynidir, onların hamısına tabe olmaq vacibdir. İmam Sadiq (ə) belə böyük bir təşkilat yaratmışdı, bu təşkilatla və xalqın köməyi ilə Bəni-Üməyyə rejiminə qarşı mübarizə aparırdı. İmam Sadiqin (ə) imamlığı çox əhəmiyyətli və öyrədicidir. O, on il Bəni-Üməyyəyə və uzun müddət də Bəni-Abbasa qarşı mübarizə apardı. Onun Bəni-Üməyyə üzərində qələbəsi

qaçılmaz olanda Bəni-Abbas fürsətçi bir cərəyan kimi təşəbbüsü ələ aldı və imam .ondan sonra həm Bəni-Üməyyə, həm də Bəni-Abbasa qarşı mübarizə apardı

**Məşhur tarixçi Təbərinin yazdığına görə**

İmam Sadiq (ə) imamətinin ilk on ilində Bəni-Üməyyə ilə vuruşdu. Bu dövrdə onun mübarizəsi açıq idi, fəaliyyətində təqiyyə və məxfilik yox idi. Səbəb Əməvi xəlifələrinin başlarının qarışıq olması idi. Onlar İmam Sadiqlə (ə), şiələrlə məşğul olmaq, onlara qarşı sərt tədbirlər görmək iqtidarında deyildilər. Bu baxımdan məxfi fəaliyyətə ehtiyacı qalmırdı. İmam Sadiq (ə) Ərəfə günü Ərəfata gedib bütün İslam dünyasından - Afrikadan, Orta Şərqdən, Hicazdan, İraqdan, ozamankı İrandan, Xorasandan, ozamankı Əfqanıstandan, Şərqi Türküstandan və digər yerlərdən gəlmiş izdiham qarşısında çıxış edirdi. Burada bir bomba partlatsan, sanki bütün İslam dünyasında partlatmısan; bir söz desən, sanki beynəlxalq bir informasiya kanalından demisən. İmam Sadiq (ə) bu izdiham qarşısında açıq şəkildə və rəsmən elan edirdi ki, ey insanlar, bu gün imam və haqlı hakim Cəfər ibn Məhəmməddir (ə), Əbu Cəfər Mənsur deyil. Buna dəlil də söyləyirdi. Kəlami və əqli dəlil demirdi, o zaman insanlarda belə əsaslandırmaya hövsələ yox idi, başqa cür əsaslandırırdı. Mənsur Abbasi və digərləri xalqı qane etmək üçün Peyğəmbərin (s) canişini olduqlarını söyləyirdilər. Bir şəcərə düzəldib deyirdilər ki, biz Abbasın övladlarıyıq. Onların iki şəcərələri vardı, hər dəfə .birini deyirdilər

Biri bu idi ki, deyirdilər biz Peyğəmbərin (s) əmisi Abbasın övladlarıyıq. Peyğəmbərin (s) vəfatından sonra xilafət hüququ Bəni-Haşimə məxsus idi və bu qəbilədə hamıdan yaşlı olduğuna görə Abbas xəlifə olmalı idi. Sonra isə xilafət onun övladları olan bizə çatır. Bu bir əsas idi. Başqa bir şəcərə də düzəldib deyirdilər ki, biz Əli ibn Abdullah ibn Abbasın övladlarıyıq. Doğru deyirdilər; onlar Əli Abbbasinin oğulları, nəvələri idilər. Onlar deyirdilər ki, Əli Abbasi Əmirəlmöminin Əli ibn Əbu Talibin (ə) oğlu Məhəmməd (Hənəfiyyənin şagirdidir. Xilafət Peyğəmbərdən (s) Əliyə (ə), Əlidən (ə

Məhəmməd Hənəfiyyəyə, ondan Abdullah ibn Abbasın oğlu və bizim babamız olan .Əliyə və ondan da bizə çatmışdır. Buna görə də biz xəlifə olmalıyıq

Belə bir şəcərə düzəldirdilər və bu, təfəkkür səviyyəsi aşağı olan ozamankı insanları qane edirdi. İmam da yuxarıda danışdığımız böyük izdiham qarşısında dayanıb imamətin həqiqi sahiblərini ardıcıllıqla təqdim edirdi. Buyururdu ki, ey insanlar, Peyğəmbərin (s) özü imam və cəmiyyətin rəhbəri idi. Ondan sonra Əli ibn Əbu Talib (ə) imam oldu, sonra Həsən (ə), sonra Hüseyn (ə), sonra Əli ibn Hüseyn (ə), sonra Məhəmməd ibn Əli (ə) və sonra mən. O özünü imam kimi təqdim edirdi. Bu böyük cəsarət tələb edirdi, sadə söz deyildi, ən böyük müxaliflik idi. İmam Sadiq (ə) Bəni-Üməyyə dövründə bu işi görürdü. Bəni-Abbas dövründə isə təqiyyə və məxfilikdən istifadə etməyə başladı. Səbəb bu idi ki, Bəni-Abbas Əli (ə) ailəsinin şüarlarını və .fikirlərini söyləyirdilər. Zahirləri Əli (ə) ailəsi, əməlləri isə Bəni-Üməyyə kimi idi

Bəni-Üməyyənin hakimiyyəti dövründə mübarizə o formada idi, daha uzun sürən Bəni-Abbas dövründə isə məxfi şəkil aldı. Bəni-Abbas fürsətdən istifadə edib İmam Sadiqin (ə) hazırladığı inqilabı yolundan yayındıran azğın bir cərəyan idi. Bu, inqilabların həmişəki təhlükəsidir. İnqilabın əsas meyarlarına uyğun olan düzgün xətt bəzən öz yerini haqq şüarları verən azğın və batil bir xəttə verir. Çox diqqətli olmaq lazımdır. O zaman insanlar diqqətlərini toplamadılar. Abbasilərin hakimiyyətə gəlməsindən ۲۰-۳۰ il sonraya qədər ucqar bölgələrin əhalisi elə bilirdilər ki, bu onların Əli (ə) ailəsi üçün apardıqları mübarizənin məhsuludur. Elə bilirdilər ki, Əli (ə) ailəsinin hökuməti budur. (Onların qəsbkar olduğundan xəbərsiz idilər. (۱۹۸۰

İmam Sadiq (ə) bu dövrdə iki mərhələni keçdi. ۱۱۴-cü ildən Mənsurun xilafətinə qədərki dövr dinclik və sakitlik dövrüdür. Bu dövrdə Bəni-Üməyyə və Bəni-Abbas arasındakı ixtilaflara görə imamlar fəaliyyət imkanı qazandılar. İmam Baqirin (ə) dövründə belə -bir şey yox idi. O zaman Bəni

Üməyyə qüdrətli idi və Əbdülməlikdən sonra ən böyük şəxsiyyətləri olan Hişam ibn Əbdülməlik hakimiyyətdə idi. Odur ki, İmam Baqirin (ə) dövründə heç bir qarşıdurma yox idi və onun üçün belə bir imkan yaranmadı. İmam Sadiqin (ə) dövründə, Abbasilərin dəvətinin yavaş-yavaş başlandığı, genişləndiyi və bütün İslam dünyasında .Şiə dəvətinin zirvəyə çatdığı dövrdə isə bu imkan yarandı

Mənsur hakimiyyətə gələndə vəziyyət ağırlaşdı, İmam Sadiqin (ə) vəziyyəti İmam Baqirin (ə) dövründəki formaya qayıtdı, repressiyalar başladı. İmam Sadiqi (ə) dəfələrlə Hirəyə, Rümeyləyə və digər yerlərə sürgün etmişlər. İmamı dəfələrlə yanına çağırmış Mənsur bir dəfə ona belə dedi: Səni öldürməsəm, Allah məni öldürsün!(۱) Bir dəfə də Mədinənin hakiminə xəbər yolladı ki, Cəfər ibn Məhəmmədin (ə) evini yandır.(۲) Mənsur İmam Sadiqlə (ə) çox sərt rəftar edirdi və dəfələrlə onu təhdid .etmişdi

İmam Sadiqin (ə) Mənsurun qarşısında təzim göstərdiyini və özünü alçaltdığını bildirən rəvayətlərin heç biri düzgün deyil. Mən bu rəvayətləri araşdırdım, onların heç bir əsası yoxdur və əksəri Rəbi Hacibə çatır. Rəbi Hacib Mənsurun yaxınlarından olan fasiq bir insandır. Bəzi adamlar sadəlövhcəsinə onun şiə olduğunu söyləmişlər. Rəbinin harası şiə olmuşdur?! Rəbi ibn Yunisin həyatını araşdırarkən gördüm ki, o, doğulduğu evdən birbaş Bəni-Abbasın sarayına gəlmiş, onlara nökərlik etmiş, Mənsurun vaxtında keşikçibaşı vəzifəsində çalışmış və Abbasilərə böyük xidmətlər göstərmişdir. Rəbi olmasaydı, Mənsurdan sonra xilafət onun ailəsindən çıxacaqdı. O, Mənsurun adından saxta bir vəsiyyətnamə hazırlayıb oğlu Mehdini taxta çıxardı. Fəzl ibn Rəbi də onun oğludur. Bu ailə Abbasilərə sadiq ailələrdəndir, Əhli-beytə heç bir hörməti keçməmişdir. Rəbinin qoşduğu rəvayətlər də saxtadır. O, İmam Sadiqin (ə) xəlifənin



---

.Təbrisi. Əl-İhticac, c. ۱, səh: ۱۶۳ [۱۵۲] -۱

.Əl-Kafi, c. ۱, səh: ۴۷۳ [۱۵۳] -۲

qarşısında özünü alçaltdığını deyir ki, digərləri də öz vəzifələrini başa düşsünlər. Hər halda, İmam Sadiqlə (ə) Mənsurun münasibəti çox pis olmuş və nəhayət, ۱۴۸-ci ildə (birincinin şəhidliyi ilə nəticələnmidir. (۱۹۸۶

İmam Sadiqin (ə) həyatında bizim yanaşdığımız baxışla əlaqədar olan mühüm cəhətlər :aşağıdakılardan ibarətdir

;İmamət məsələsinin təbliği -۱

Şiə fiqhinə uyğun din hökmlərinin bəyan edilməsi, eləcə də Şiə baxışına uyğun - ۲ ;Quran təfsiri

(Məxfi siyasi-ideoloji təşkilatın yaradılması. (Sadiq rəhbər, səh: ۶۷ -۳

**İmam Sadiqin (ə) imamət dəvəti**

İndi isə əsas mətləbə keçirik. Digər Şiə imamları kimi İmam Sadqin (ə) dəvətinin əsas hissəsini də imamət məsələsi təşkil etmişdir. Bu tarixi reallığın isbatı üçün ən tutarlı dəlil İmam Sadiqin (ə) dilindən çox açıq-aydın şəkildə imamət iddiasını nəql edən çoxlu .rəvayətlərdir

Deyəcəyəm ki, imam bu məsələni təbliğ edərkən özünü bir mübarizə mərhələsində görmüş, birbaşa və açıq şəkildə dövrün hakimlərini inkar edib özünü xalqa vilayət və imamətin həqiqi sahibi kimi təqdim etmişdir. Prinsipcə bundan ötrü mübarizənin bütün qabaqkı mərhələləri uğurla həyata keçməli, böyük bir kütlədə ictimai və siyasi ayıqlıq yaranmalı, hər yerdə potensial hazırlıq hiss olunmalı, böyük bir qrupda ideoloji şərtlər yaranmalı, çoxları üçün haqq və ədalət hakimiyyətinin zəruriliyi sübuta yetməli və nəhayət, rəhbər son mübarizə üçün özünün qəti qərarını verməlidir. Bunlar həyata keçmədən müəyyən bir şəxsin adını cəmiyyətin haqlı rəhbəri və imamı kimi çəkmək .tələsik və faydasız olar

Başqa bir mühüm məsələ budur ki, imam bəzən imaməti özü üçün isbat etməklə də kifayətlənmir, öz adı ilə yanaşı qabaqkı imamların və sələflərinin adlarını da çəkir və Əhli-beyt imamətinin ayırlmaz olduğunu ortaya qoyur. Şiə təfəkkürünün keçmişdəki ,bütün batil hakimləri rədd etdiyini

tağut saydığını nəzərə alsaq, bu əməl həmin dövrün şiələrinin mübarizəsinin keçmiş mübarizələrin davamı olmasına işarə də sayıla bilər. İmam Sadiq (ə) bu sözlə öz imamlığını qabaqkı imamların imamətinin zəruri nəticəsi sayır, onu köksüz və əsassız haldan çıxarır, özünü etimadlı və şübhəedilməz halqalarla Böyük Peyğəmbərə (s) :birləşdirir. İndi imamın dəvətinə dair bir neçə nümunəyə diqqət yetirin

Mənim bu barədə gördüyüm ən maraqlı rəvayət Əmr ibn Əbu Miqdamın rəvayətidir. Bu rəvayət heyrətamiz mənzərə təsvir edir. Zilhiccə ayının doqquzu Ərəfə günüdür. Ərəfə gününə xas mərasimi yerinə yetirmək üçün Ərəfat çölündə Uzaq Xorasandan Aralıq dənizinin sahillərinə qədər bütün bölgələrin nümayəndələrindən ibarət böyük bir izdiham toplanmışdır. Burada yerində deyilmiş bir söz o zaman ən geniş rabitə şəbəkəsinin işini görə bilər. İmamın bu izdihama sözü vardır. Rəvayətçi deyir ki, imamın xalq arasında dayanıb bacardığı qədər uca səslə, hər yerdə, bütün qulaqlarda əks-səda doğuracaq və eşidənlər tərəfindən bütün İslam dünyasına yayılacaq fəryadla öz sözünü üç dəfə təkrarladığını gördüm. Sonra üzünü başqa bir tərəfə çevirib həmin sözü üç dəfə söylədi. Daha sonra isə üzünü başqa bir tərəfə çevirdi və yenə də həmin fəryad, həmin söz. Beləliklə imam sözünü on iki dəfə təkrar etdi. Həmin söz bundan ibarət idi: Ey insanlar! Həqiqətən Allahın rəsulu imam idi. Ondan sonra Əli ibn Əbu Talib (ə), sonra Həsən (ə), sonra Hüseyn (ə), sonra Əli ibn Hüseyn (ə), sonra .(Məhəmməd ibn Əli (ə) imam oldu. İndi isə imam mənəm(١

Başqa bir hədis Əbu Sabah Kənanidəndir. Burada İmam Sadiq (ə) özünü və digər Şiə imamlarını belə vəsf edir: Allah bizə itaət etməyi insanlara vacib buyurmuşdur. Döyüşsüz əldə edilən qənimətlər və zalım hakimlərin haqsız topladığı malların idarəsi bizə aiddir. Zalım tağutlar bəzi mal-dövləti özlərinə aid edərək haqqı çatanları ondan məhrum edirdilər. səh:٢١۴

---

.Bihar əl-ənvar, c. ۴٧, səh: ۵٨ [١۵۴] -١

Qəsb olunmuş bu mallar müsəlman döyüşçülərin qələbəsi ilə məğlub zalımların əlindən alındıqda digər qənimətlər kimi bölünmür, İslam hakiminin səlahiyyətinə verilir və o, bunlardan müsəlmanların xeyrinə istifadə edir. İmam bu rəvayətdə özünü həmin malların və həmçinin döyüşsüz əldə edilən qənimətlərin ixtiyar sahibi kimi təqdim etməklə İslam cəmiyyətinin hakimi olduğunu aydın şəkildə göstərir. Bütün bunlar onun .ixtiyarına buraxılmalı və onun təyin etdiyi yerlərdə xərclənməlidir

Başqa bir hədisdə keçmiş imamların adlarını bir-bir sadalayır, onların imamlığına və fərmanlarına itaətin vacib olmasına şəhadət verir, öz adına çatanda isə dayanır. İmamın dinləyiciləri yaxşı başa düşürlər ki, İmam Baqirdən (ə) sonra elm və hakimiyyət irsi İmam Sadiqə (ə) keçmişdir. O beləliklə həm özünün hakimiyyət haqqını irəli sürür, həm də dəyərli babası olan Əli ibn Əbu Talibə (ə) mənsubluğunu bəyan edir.(۱) Kafi kitabının Höccət bölməsində, həmçinin Bihar əl-ənvar kitabının ۴۷-ci cildində imamət iddiasını və imamətə dəvəti birbaşa, yaxud dolayısı ilə bildirilən belə .hədislər çoxdur

Başqa bir dəqiq sənəd imamın bütün İslam məmləkətində yaratdığı geniş təbliğat şəbəkəsindən xəbər verən, belə bir şəbəkəni tam təsdiqləyən faktlardır. Bu faktlar o qədər çox və əsaslıdır ki, açıq hədis olmasaydı da, bu şəbəkənin mövcud olduğuna şübhə yaranmazdı. İmamların həyatını araşdıran şəxs özündən soruşur: Bəni-Üməyyə dövrünün sonlarında müxtəlif bölgələrdə Şiə imamlarını təbliğ və xalqın onlara itaət və dəstəyini təmin edən dəvətçilər olmadığı halda onlarla şiələr arasındakı ideoloji, təşkilati və maliyyə əlaqələri necə izah oluna bilər? Necə olur ki, dünyanın hər bir tərəfindən Mədinəyə şəriət ödəncləri gəlir, bu qədər dini məsələlər soruşulur, hər yerdə şiəliyə dəvət olunur, İslam məmləkətinin mühüm yerlərində Əli (ə) ailəsinə ,misilsiz sevgi və hörmət bəslənir, imamın ətrafında Xorasandan, Sistandan, Kufədən



---

.Əl-Kafi, c. ۱, səh: ۱۸۶ [۱۵۵] -۱

Bəsrədən, Yəməndən və Misirdən çoxlu rəvayətçilər görünür? Bütün bunları hansı qüdrətli əl yaratmışdı? Bir-biri ilə əlaqədar olan bu amillərin təsadüfən, yaxud öz-!?özünə yarandığını düşünmək olarmı

Əməvi rejiminin tribunalarından istisnasız olaraq hər yerdə aparılan bütün müxalif təbliğata, hətta minbər və çıxışlarda Əli ibn Əbu Talibin (ə) adının ən pis İslam şəxsiyyəti kimi xatırlanmasına rəğmən, güclü bir təbliğat şəbəkəsi olmadan belə ucqar və tanınmaz yerlərdə Əli (ə) ailəsinin sevilməsi mümkün idimi?! İnsanlar yalnız görüşmək, sözlərindən bəhrələnmək, həmçinin sevgi və sədaqətlərini bildirmək üçün uzaq yollar qət edib Hicaza və Mədinəyə gələr, Şiə inancına görə siyasət və hakimiyyət kimi mühüm olan din elmini onlardan öyrənər, bəzən dözümsüz şəkildə hərbi hərəkata, rəvayətlərin dili ilə desək, qiyama başlamalarını istəyərdilərmi?! Əgər şiələrin hazırlığı yalnız imamların elm və zahidliyinin isbatı istiqamətində olmuşdursa, !?silahlı qiyam xahişinin nə mənası ola bilər

Sual oluna bilər ki, həqiqətən belə geniş və fəal təbliğat şəbəkəsi olmuşdursa, nə üçün tarixdə adı çəkilmir və barəsində açıq danışılmır. Qısa cavab budur ki, bu səssizliyin səbəbini ilk növbədə imamın tərəfdarlarının əsaslı və mütərəqqi bir prinsip olan təqiyyəyə ciddi əməl etmələrində axtarmaq lazımdır. Bu, kənar qüvvələrin imamın təşkilatına qatılmasına mane olurdu. Həmçinin bu Şiə mübarizəsinin uğursuzluğu və hakimiyyətlə nəticələnməməsi də buna səbəb olmuşdur. Bu uğursuzluğun özü də müəyyən amillərin nəticəsidir. Əgər Abbasilər də hakimiyyətə gəlməsəydilər, onların gizli fəaliyyət və təbliğatlarına dair acı və şirin xatirələri də sinələrində qalacaq, heç kəs onlardan xəbər tutmayacaq və tarixdə qeyd olunmayacaqdı. (Sadiq rəhbər, səh: (۷۴-۸۰

Təqiyyədən danışarkən deyə bilərsiniz ki, bu, güclü bir hökumətin iş başında olduğu zamana aiddir. Şah dövründə biz də gizlənirdik və qorxudan bir söz demirdik. Xeyr! O zaman

da təqiyyə qorxudan deyildi. Təqiyyə möminin qalxanıdır(۱). Qalxandan isə döyüşdə istifadə olunur. Deməli, təqiyyə də döyüşə aiddir.

O zaman da belə idi; təqiyyə edərək xəncəri düşmənin başından elə endirirdik ki, o nə xəncəri görürdü, nə xəncəri tutan əli, nə xəncərin qalxmasını, nə də enməsini. Yalnız ağrısını hiss edirdi. Təqiyyə budur. O zaman təqiyyə edənlər belə edirdilər. Onlar düşmənin gözündən uzaq, məxfi şəkildə, gizli evlərdə, çox diqqət və ehtiyatla bir elan hazırlayırdılar. Bu elan yayılanda isə rejim tamamilə rəzil olurdu. Bu iş düşmənin başına endirilən xəncər zərbəsinə bənzəyirdi. Yəni təqiyyə etməklə düşmənin görülən işlərdən xəbər tutmasına imkan vermirdik. Təqiyyə qalxan idi, təqiyyə edən onun arxasında gizlənirdi. Təqiyyənin mənası budur. İndi də həmin mənanı ifadə edir. (۱۹۹۰)

#### Şiə fiqhinə uyğun din hökmlərinin təbliği

Bu da İmam Sadiqin (ə) həyatında görünən aydın bir işdir. Bunu digər imamlardan daha fərqli, daha açıq və düzgün formada görmək olar. Belə ki, Şiə fiqhi Cəfəri fiqhi adlandırılmışdır. İmamın siyasi fəaliyyətini görməzdən gələnlərin hamısı İmam Sadiqin (ə) öz dövrünün ən böyük elm və fiqh mərkəzinə, yaxud belə mərkəzlərdən birinə malik olmasında yekdildirlər. Bu arada imamın həyatının əksər tədqiqatçılarına gizli qalan nüans onun siyasi və etirazçı mənasıdır. Biz indi bu haqda danışacağıq.

Öncə bilmək lazımdır ki, İslamda xilafət institutu bu baxımdan bütün üsul-idarələrdən fərqlənir, yalnız siyasi bir təşkilat yox, siyasi-dini rəhbərlikdir. İslam hakiminə xəlifə titulunun verilməsi onun yalnız siyasi rəhbər yox, həm də Peyğəmbər canişini olmasını göstərir. Peyğəmbər isə bir dinin banisi, əxlaq müəllimi və təbii ki, eyni zamanda siyasi hakim



---

۱- [۱۵۶] Bihar əl-ənvar, c. ۷۲, səh: ۳۹۴.

və rəhbərdir. Deməli, İslamda xəlifə siyasətdən əlavə, həm də xalqın dini işlərini idarə .edir və dini rəhbər sayılır

Bu qəti məsələ ilk İslam xəlifələrindən sonra hakimiyyətə gələn, dini məlumatları çox zəif olan, bəzən isə ümumiyyətlə olmayan hakimlərin bu boşluğu özlərinə bağlı dini şəxsiyyətlər vasitəsi ilə doldurmaq, öz saraylarına muzdur fəqih, təfsirçi və .hədisşünaslar gətirməklə din və siyasəti yenidən sintezləmə cəhdlərinə səbəb oldu

Hökumətdə şəriətə bağlı qüvvələrin çalışmasının başqa bir faydası bu idi ki, onlar zalım hakimin istəyinə və fərmanına uyğun olaraq din hökmlərini asanlıqla dəyişdirə, Allah hökmünü adi və avam insanlar tərəfindən ayırd edilməyən ictihad pərdəsi altında .padşahların xeyrinə təhrif edə bilirdilər

Ötən əsrlərin tədqiqatçı və tarixçiləri əksərən siyasi iradənin göründüyü saxta hədis və təfsirlərə dair dəhşətli nümunələr qeyd etmişlər. Hicrətin birinci əsrinin sonlarına qədər daha çox hədis və rəvayət formasında görülən bu iş yavaş-yavaş fətva formasına da düşmüşdü. Bəni-Üməyyə hakimiyyətinin sonlarında, Bəni-Abbas hakimiyyətinin əvvəllərində Qiyas və İstehsan kimi bidətçi üsullardan istifadə edib İslam hökmlərini əksərən hakim qüvvələrin istəyinə uyğunlaşdıran çoxlu fəqihlər olmuşdur. Bu iş eynilə Quran təfsirində də həyata keçirdi. Təfsirçinin Quranı şəxsi fikrinə uyğun təfsir etməsi Allahın hökmünü asanlıqla dəyişib xalqı təfsirçinin, daha .doğrusu, əksərən hakim qüvvələrin fikrinə inandıra bilirdi

Beləliklə qədim İslam dövrlərindən fiqh, hədis və təfsir sahələri iki ümumi cinaha bölündü: biri qəsbkar hakimlərə bağlı olan, əksər hallarda həqiqəti hökumətlərə qurban verən və dəyərsiz sərvət qarşılığında Allahın hökmünü təhrif edən, digəri isə heç bir məsləhəti düzgün ilahi hökmlərdən önə keçirməyən, buna görə də hər bir addımda hökumətlə və onun muzdur fəqihləri ilə üz-üzə gələn ortodoks və düzgün cinah. İkinci cinah o zamandan əksər hallarda məxfi və qeyri-rəsmi fəaliyyət .göstərirdi

Deyilənlərə əsasən, aydın şəkildə başa düşmək olar ki, Cəfəri fiqhi İmam Sadiq (ə) dövrünün rəsmi fəqihlərinin fiqhi qarşısında yalnız bir fikir ayrılığı deyildi, eyni zamanda iki etirazçı məzmunu da ehtiva edirdi. Bunların birincisi və daha mühümü hakim qüvvələrin dini məlumatsızlığının, xalqın düşüncə idarəsinə acizliyinin – yəni əslində xilafət məqamı üçün səlahiyyətsizliyinin isbatı, digəri isə rəsmi fəqihlərin öz xeyirlərini güdmələrindən, hakim qüvvələrin istək və əmrlərinə tabe olmalarından doğan təhrif nümunələrini bəlli etmək idi. İmam Sadiq (ə) hakimiyyətə bağlı alimlərdən fərqli şəkildə elm mərkəzi yaratmaqla, fiqh, İslam təlimləri və Quran təfsiri dərsləri deməklə faktiki olaraq rejimə qarşı çıxırdı. O həzrət bununla xəlifələrin hakimiyyətinin mühüm bir təməli sayılan bütün rəsmi din və fiqh təşkilatının yanlışlığını üzə çıxarır, hökumətin dini .legitimliyini sarsıdırdı

Bəni-Üməyyə hakimiyyətinin İmam Sadiqin (ə) elm və fiqh fəaliyyətinin etirazçı cəhətinə nə qədər diqqət yetirməsinə dair aydın və qəti sənəd yoxdur. Lakin böyük ehtimal budur ki, Bəni-Abbas, xüsusən də güclü istedadı, bacarığı, həm də xilafətdən qabaqkı bütün ömrünü Əməvilər əleyhinə mübarizədə keçirdiyinə görə Əli (ə) övladlarının mübarizə taktikalarından dəqiq məlumatı olan Mənsurun dövründə .xilafətin bu dolayı mübarizənin rolundan xəbərdar olduğunu söyləmək olar

Mənsurun İmam Sadiqin (ə) elmi fəaliyyətlərinə qarşı sonsuz təzyiq və təhdidləri bu məlumatdan irəli gəlmişdir. Hicazın və İraqın məşhur fəqihlərini öz hakimiyyətinin paytaxtına toplamaqda çox israrlı olması da həmin ehtiyacdan irəli gəlmişdir. İslama görə elmdən uzaq bir şəxsin xəlifə və hakim olmağa haqqı yoxdur. İmam Sadiqin (ə) öz tərəfdarları və yaxınları ilə müzakirə və dərslərində bu amildən istifadə etməsi aydın görünür. Yəni imam özünün fiqh və Quran dərslərində olan etirazçı məzmunu açıq .şəkildə də söyləmişdir

O həzrətdən nəql olunan bir hədisdə buyurur ki, biz Allah tərəfindən itaəti vacib buyurulanlarıq; halbuki siz elə adamlara

itaət göstərirsiniz ki, insanlar onların cahilliyinə görə Allah yanında üzürlü olmayacaqlar.(۱) Yəni yanlış rəhbərlərin cəhaləti səbəbindən yoldan çıxanlar, Allah yolundan yayınanlar Allah yanında belə bir bəhanə gətirə bilməzlər ki, biz öz seçimimizlə yanlış yolu getməmişik, rəhbərlərimiz bizi bu yola sövq etmişlər. Belə rəhbərlərə itaət etməyin özü düzgün olmadığına görə sonrakı yanlış işlərin gühanını da .götürə bilməz

İnqilabi İslam cəmiyyətində siyasi və inqilabi rəhbərliyin zəruri olaraq dini-ideoloji rəhbərliklə eyniliyi İmam Sadiqdən (ə) öncəki və sonrakı imamların təlimlərində də açıqca görünür. İmam Əli ibn Musa Rza (ə) babası İmam Məhəmməd Baqirdən (ə) nəql etdiyi rəvayətdə imamlarda olan silahı keçmiş Bəni-İsrail tayfaları arasında olan tabuta bənzədir: Bizim silahımız Bəni-İsrailin tabutu kimidir. Tabut kimdə olsaydı, nübüvvət – bir rəvayətdə isə hökumət – ona məxsus idi. Bizdə də silah kimdə olsa, rəhbər və başçı odur. Bu sözün çox dərin məfhumuna və simvolik formasına diqqət yetirin. Rəvayətçi soruşur ki, silahın elmsiz bir şəxsdə olması mümkündürmü? İmam cavab verir ki, xeyr.(۲) Yəni müsəlman ümmətin inqilabi və siyasi rəhbərliyi silaha və .elmə sahib olana məxsusdur

Deməli, imam bir tərəfdən imamətin şərtini din elmi və Quranın düzgün dərki bilir və digər tərəfdən elm mərkəzi yaratmaqla, din elminə maraq göstərən çoxlu insanları ətrafına toplamaqla, fiqh, hədis və təfsir elmlərinin ümumi vəziyyətindən, xilafətə bağlı alim, hədisşünas və təfsirçilərdən fərqli şəkildə din öyrətməklə əməli olaraq öz dinşünaslığını, xilafətin isə bütün muzdur və adlı-sanlı alimləri ilə birgə dinşünas olmadığını isbatlayır, bununla davamlı, güclü və sakit hücuma keçib mübarizəsinə yeni .istiqamət bəxş edir



---

۱- [۱۵۷] Əl-Kafi, c. ۱, səh: ۱۸۶.

۲- [۱۵۸] Yenə orada, səh: ۲۳۸.

Qeyd etdiyim kimi, hakimiyyətdən öncə özləri illərlə Əli (ə) övladlarının apardığı mübarizələrdə iştirak edən, Əli (ə) ailəsinin tərəfdar və ardıcıllarının kənarında yaşayan və onların bir çox sirlərinə vaqif olan ilk Abbasi hökmdarları bu hədis və təfsir dərslərinin siyasi əhəmiyyətini öz Əməvi sələflərindən yaxşı anlayırdılar. Bəlkə elə buna görə Mənsur Abbasi İmam Sadiqlə (ə) məkrli çəkişmələri əsnasında uzun müddət ona xalqla ünsiyyəti, onlara din öyrətməyi, xalqa da onun yanına get-gəl etməyi və bir şey soruşmağı qadağan etdi. Məşhur Şiə şəxsiyyətlərindən olan Müfəzzəl ibn Ömərin dediyinə görə, evlilik, talaq və digər bu kimi məsələlər qarşıya çıxanda insanlar o həzrətin cavabını asanlıqla əldə edə bilmirdilər.(۱) (Sadiq rəhbər: (səh: ۸۸-۹۵

**Məxfi siyasi–ideoloji təşkilat**

İmam Sadiq (ə), İmam Səccad (ə) və İmam Baqirin (ə), xüsusən də sonuncunun həyatının son illərində aparılan geniş fəaliyyətin köməyi ilə bütün İslam dünyasında ideoloji, inqilabi, prinsipial, fədakar və təhlükəyə hazır olan bir qrup mömin və müsəlman yetişdi. Bunlar adi adamlar deyildilər. Demək istəmirəm ki, bunlar xüsusi təbəqələrdən olmuşlar. Xeyr! Elə tacir, qul və bu kimi insanlar idilər, amma mənəvi baxımdan əsla adi insanlara bənzəmirdilər, həyatlarını məqsəd və məktəblərinə həsr etmişdilər. Belə insanlardan hər yerdə vardı. Maraqlı burasıdır ki, İmam Sadiqin (ə) dostları hər yerdə vardı, yalnız Mədinədə deyildilər. Kufədə Mədinədən çox idi, hətta Şamın özündə də vardı. Bunlar İmam Sadiqin (ə) möhtəşəm şəbəkəsini təşkil edirdilər. Əli (ə) təşkilatı, Şiə təşkilatı bunlardan ibarət idi. Bunlar İmam Sadiqin (ə) həyatının naməlum hissələrindəndir. Mən bunun üzərində təkidlə dayanıram ki, İmam Sadiq (ə) tərəfindən bütün İslam dünyasında böyük bir şəbəkə və əməlli-başlı bir partiya idarə (olunurdu. Bu bir üstün cəhət idi. (۱۹۸۰

səh:۲۲۱

---

.İbn Şəhr Aşub. Mənaqib, c. ۴, səh: ۲۳۸ [۱۵۹] -۱

Bu şəbəkə İslam məmləkətinin bir çox ucqar yerlərində, xüsusən də İraqın ərəblər yaşayan hissəsində və Xorasanda üzərinə imamət məsələsinə dair gözəçarpan və səmərəli fəaliyyətlər götürmüşdü. Lakin bu, məsələnin yalnız bir üzü və kiçik hissəsidir. İmam Sadiqin (ə) və həmçinin digər imamların siyasi həyatında məxfi təşkilat amili onların macəra dolu həyatlarının ən mühüm, ən qızğın və eyni zamanda ən məchul və .tanınmaz hissələrindəndir

Qeyd etdiyim kimi, belə bir təşkilatın olmasını isbat etmək üçün açıq-aşkar sənəd gözləmək olmaz. İmamlardan, yaxud onların yaxın ətraflarından birindən Şiə məzhəbinin siyasi-ideoloji təşkilatına dair açıq etiraf gözləmək düzgün deyil. Bu, deyiləsi bir şey deyildi. Normal gözlənti budur ki, düşmən imamın gizli təşkilatının olduğunu anlayıb onun özündən, yaxud yaxınlarının birindən bu haqda soruşanda da belə bir şeyi tamamilə inkar etsin, bunu bir bədgümanlıq və ya iftira adlandırsın. Məxfi işin xisləti belədir. Təbii ki, imamların tarixini tədqiq edənlərdən də yetərli əsas və dəlil olmadan belə bir təşkilatın varlığını qəbul etmələrini gözləmək olmaz. Faktları, məlumatları, zahirən sadə görünən hadisələrin adi tamaşaçının diqqətini cəlb etməyən, diqqətlə baxanda isə çoxlu gizli məsələlərdən xəbər verən məğzini araşdırmaq lazımdır. İmamların ۲۵۰ illik bütün həyatına bu baxışla nəzər salsaq, onların başçılıq etdiyi belə gizli təşkilatın olduğuna təxminən əmin olarıq. (Sadiq rəhbər, səh: (۹۶-۹۷

səh:۲۲۲

## On üçüncü fəsil: Gizli təşkilat

### İşarə

Təşkilat dedikdə məqsəd nədir? Məlum məsələdir ki, məqsəd bugünkü mənada nizam-intizamlı, lazımlı kadrları, region, şəhər və kənd komitələri, özəkləri olan mütəşəkkil bir partiya deyil və ola da bilməzdi. Bu sözdə məqsəd ortaq məqsədlə müxtəlif iş və vəzifələri yerinə yetirən, vahid mərkəz və rəhbərliyə tabe olan, öz aralarında da müəyyən əlaqələri, həmçinin yaxınlıq və doğmalıq hissləri olan insanların .birliyidir

İmam Əlinin (ə) dövründə, Səqifə ilə xilafət arasındakı ۲۵ illik müddətdə xilafətin insanların xoşuna gələn düzgün fikirlərinə rəğmən, hakimiyyətin ən üstün və ən fədakar müsəlman olan Əli ibn Əbu Talibin (ə) haqqı olduğuna inanan, Əlinin (ə) canişinliyinə dair Peyğəmbərin (s) sözünü unutmayan, Səqifədən sonrakı ilk günlərdə hakimiyyətə qarşı etirazlarını və imama qarşı sədaqətlərini açıq şəkildə bildirən xüsusi səhabələr vardı. Sonralar imamı sükuta və hətta birinci xəlifələrlə əməkdaşlığa vadar edən böyük məsləhətə uyğun olaraq, onlar da ümumi proseslərdə yer aldılar, lakin heç zaman öz düzgün fikir və seçimlərini əldən verməyib həmişə Əli (ə) ardıcılı kimi qaldılar. Bu səbəbdən haqlı olaraq Əlinin (ə) şiəsi – ardıcılı, tərəfdarı adlandırıldılar və bu adla məşhurlaşdılar. Salman, Əbuzər, Übəy ibn Kəb, Miqdad, Əmmar və Hüzeyfə .kimi məşhur və adlı-sanlı şəxsiyyətlər bu sırada yer alırdılar

Tarixi faktlar göstərir ki, bu qrup Şiə düşüncəsini - yəni düşüncə və siyasi rəhbər kimi imama itaətin zəruriliyini həmişə münasib yollarla yayaraq tədricən çevrələrini .genişləndirmişlər. Əlinin (ə) hakimiyyətini təmin etmək üçün bu iş zəruri sayılırdı

Əmirəlmöminin (ə) hicrətin ۳۵-ci ilində hakimiyyətə gələndə hakimiyyət və imamətə dair Şiə meyarlarını rəhbər tutub imamı həmin meyarlarla qəbul edən yalnız həmin qrup - yəni ötən ۲۵ illik dövrdə imamın birbaşa və dolayısı ilə

yetişdirdiyi şəxslər idilər. Xalqın əksəriyyətini təşkil edən digərləri də imamın rəhbərliyi altında yaşasalar və əməldə Şiə təfəkkürü istiqamətində hərəkət etsələr da, onları Şiə təşkilatına qoşan ideoloji və mənəvi bağlantıya malik deyildilər. İmamın tərəfdarları arasındakı bu ikitirəliyi nəzərə alsaq, ozamankı müsəlmanların – məsələn Əmmarın, Malik Əjdərin, Hücr ibn Ədinin, Səhl ibn Hüneyfin, Qeys ibn Sədin və digər tərəfdən .Əbu Musa Əşərinin, Ziyadın, Səd ibn Əbi Vəqqasın fərqli rəftarlarını başa düşmək olar

Qəbul etmək lazımdır ki, Şiə təşkilatının yaradılması üçün ilk addım həqiqətən İmam Həsənin (ə) bəzi böyük şəxslərlə görüşündə baş tutsa da, onun layihəsi bu görüşdən uzun müddət qabaq İmam Əli ibn Əbu Talibin (ə) öz yaxın tərəfdarlarına müraciətlə .proqnoz verdiyi sözdədir

İmam Həsənin (ə) sülhündən sonra görülən çox mühüm iş Şiə düşüncəsini genişləndirmək, zalım Əməvi şahı tərəfindən təzyiqə məruz qalan bu qrupu nizama salmaq idi. Bu qrup indi Əməvi şahının zalım iqtidarı və məruz qaldığı təzyiq səbəbindən daha da fəallaşa bilərdi. Həmişə belədir: təzyiq və repressiya mütəşəkkil qüvvələri parçalamaq yerinə onların daha da bərkiməsinə və genişlənməsinə bais .olur

### İmam Həsənin (ə) strategiyası

İmam Həsənin (ə) strategiyası və onun sülhünü qaçılmaz edən son səbəb bunlar idi: etimadlı və prinsipial Şiə qüvvələrini toplamaq, onları Əməvi hakimiyyətinin amansız antişiə əməliyyatlarından qorumaq, məhdud, lakin dərin dairədə əsl İslam təfəkkürünü yaymaq, potensial qüvvələri cəlb edib şiələrə qatmaq, münasib fürsət gözləmək və nəhayət, zamanında hərəkətə keçib cahil Bəni-Üməyyə quruluşunu .dağıtmaq, İslam və Əli (ə) quruluşunu yenidən bərpa etmək

İmam sülhdən sonra Kufədən Mədinəyə qayıdaraq bu şəhəri yenidən özünün ideoloji və siyasi bazasına çevirmişdi. Bu zaman Museyib ibn Nəcəbənin və Süleyman ibn Sürəd Xüzainin başçılıq etdiyi şiələr onun yanına gəlib təklif etdilər ki, hərbi qüvvələri bərpa edərək Kufəni ələ keçirsinlər və yenidən Şam qoşunlarına qarşı vuruşsunlar. İmam gələnlər səh:۲۲۴

arasından bu iki nəfəri seçib onlarla xüsusi görüş keçirdi, məzmunu haqda heç bir məlumat olmayan sözlərlə onları bu planın yanlışlığına qane etdi. Onlar öz yoldaşlarının yanına qayıdanda qısa və üstüörtülü sözlərlə başa saldılar ki, hərbi qiyam .mövzusu bağlanmışdır və Kufəyə qayıdıb öz işləri ilə məşğul olmalıdırlar

Bu tarixi məlumatlara əsaslanan görkəmli və müasir ərəb tarixçisi Taha Hüseyn Şiənin .siyasi təşkilatının bünövrəsinin həmin gün həmin məclisdə qoyulduğunu söyləyir

Siz məni əldən verəndən sonra elə şeylər görəcəksiniz ki, özünüzə ölüm arzulayacaqsınız: ədalətsizlik, düşmənçilik, inhisarçılıq, Allahın haqqına qarşı saymazlıq və can qorxusu. Belə olduqda ilahi əlaqə ilə özünüzü ümumi şəkildə qorumalı və təfriqəyə getməməlisiniz. Müqaviməti, namazı, Allah zikrini və təqiyyəni rəhbər tutun. Bilin ki, bəndələrinin hər an bir rəngə düşməsindən Allahın acığı gəlir. Haqdan və haqlıdan vaz keçməyin; çünki bizim yerimizə digərini seçən hər bir kəs dünyanı əldən (verər, bu dünyadan günahkar köçər.(۱

İmam Əlinin (ə) Əməvi dövrünün ən mühüm ağrılarını təsvir edən, təşkilatlanmaya və birliyə dair fərman sayılan bu sözləri Şiə təşkilatına aid ən mühüm sənədlərdəndir. İmam Həsənin (ə) ən görkəmli şiələrdən ikisi ilə görüşündə icrasına başlanan da bu layihədir. Şübhəsiz ki, bütün şiələr çox ağıllı şəkildə düşünülmüş bu plandan xəbərdar deyildilər. Bəzi dostların etiraz və iradlarının səbəbi də bu idi. Amma imamdan güman ki, dəfələrlə eşidilən bir cümlədə həmin siyasətə gizli işarə vurulmuşdur: Bəlkə bu sizin .üçün imtahan və müəyyən vaxta qədər möhlətdir

## Müaviyənin iyirmiillik zalım hakimiyyəti zamanı

Müaviyənin iyirmiillik zalım hakimiyyəti zamanı Şiə düşüncəsinin inkişafını, Hicaz və İraqda şiələrin sayının artmasını təmin edən yeganə amil belə təşkilatlanma idi. Tarixçilər həmin dövrdə bütün müsəlman məmlkətində antişiə təbliğatının aparılmasına dair acınacaqlı məlumatlar



---

.Tühəf əl-üqul, səh: ۸۲ [۱۶۰] -۱

yazmışlar. İmam Əlinin (ə) lənətlənməsinin ənənəyə çevrilməsi, İmam Həsən (ə) və .İmam Hüseyn (ə) tərəfindən açıq fəaliyyətin müşahidə olunmaması bu dövrə aiddir

Sülhdən iyirmi il sonra bu bölgələrin düşüncə vəziyyətinə nəzər salaq. Kufədə şiələr ən məşhur şəxsiyyətlərdir. Məkkədə, Mədinədə, hətta bəzi ucqar yerlərdə də şiələr zəncir halqaları kimi bir-birinə bağlanmış və bir-birindən xəbərdardırlar. Bir neçə ildən sonra Şiə başçılarından olan Hücr ibn Ədi qətlə yetiriləndə güclü repressiyaya baxmayaraq ölkənin bir neçə yerində etirazlar ucalır və məşhur bir şəxsiyyət Xorasanda qəzəbli etirazların ardınca qəm-qüssədən vəfat edir.(۱) Müaviyənin ölümündən sonra minlərlə insan İmam Hüseynə (ə) məktub yazıb qiyam üçün Kufəyə dəvət edir. İmamın şəhadətindən sonra on minlərlə insan qisasçılar qrupuna qoşulur, Təvvabin hadisəsində, yaxud Muxtarın və İbrahim ibn Malikin qoşununda Əməvi .hakimiyyətinə qarşı qiyam edir

İslam tarixinin tədqiqatçısı özündən soruşur: Şiə təfəkkürünün və Şiə təmayüllərinin bu həddə genişlənməsi vahid və yekdil Şiə qrupu - yəni İmam Həsənin (ə) sülhdən dərhal sonra proqnoz verdiyi təşkilat tərəfindən mütəşəkkil və düşünülmüş fəaliyyət olmadan mümkün olardımı?! Şübhəsiz ki, cavab mənfidir. Mütəşəkkil, yekdil və təbii ki, məxfi bir qrup tərəfindən idarə olunan məqsədyönlü təbliğat aparılmadan hakim Əməvi rejiminin yüzlərlə qazi, qiraətçi, natiq və vali vasitəsi ilə apardığı məqsədyönlü .təbliğatına cavab vermək və bəzi hallarda onu zərərsizləşdirmək mümkün olmazdı

Müaviyənin ölümünə yaxın bu mütəşəkkil fəaliyyət güclənmiş və sürətlənmişdi. Belə ki, Mədinənin hakimi imamın fəaliyyətləri haqda topladığı məlumatlara əsasən Müaviyəyə yazdı: Ömər ibn Osman İraqın və Hicazın bəzi tanınmış adamlarının Hüseynin (ə) yanına get-gəl etdiklərini



---

۱- [۱۶۱] İmam Həsənin (ə) sülhü .Razi Ali-Yasin

və güman ki, qiyama hazırlaşdıqlarını xəbər verdi. Mən bunu araşdırdım və onların kütləvi etiraz niyyətlərinin olduğunu öyrəndim. Öz fikrini və fərmanın yaz.(١) Kərbəla hadisəsindən və imamın şəhadətindən sonra şiələrin mütəşəkkil fəaliyyəti İraqda qat-qat artıq gücləndi və nizama düşdü. Kufə şiələrinin çoxu hakimiyyətin təzyiqi altında çaş-baş qalaraq özlərini Aşura döyüşünə çatdıra bilməmişdilər. Bu, həmin şiələrin psixoloji vəziyyətinin yaratdığı durum idi, onların təəssüf və kədərləri buna xüsusi rəng .qatırdı

Məşhur tarixçi Təbəri yazır: Bu qrup daim silah toplamaqla, hərbi hazırlıqla, şiələri və qeyri-şiələri gizli şəkildə Hüseynin (ə) intiqamını almağa çağırmaqla məşğul idi. İnsanlar dəstə-dəstə onlara qatılırdı. Bu proses gedərkən Yezid ibn Müaviyə öldü.(٢)

Cihad əş-Şiə kitabının müəllifi haqlı olaraq yazır: Şiə cəmiyyəti Hüseynin (ə) şəhadətindən sonra siyasi məqsədlərin və dini etiqadların birləşdirdiyi, rəhbərlərin və döyüşçü qüvvələrin toplandığı mütəşəkkil bir qrupa çevrildi. Təvvabin qrupu onların ilk timsalı idi.(٣)

Tarixi hadisələrdən, həmçinin tarixçilərin fikirlərindən başa düşmək olar ki, Müaviyənin dövründə, eləcə də İmam Hüseynin (ə) şəhadətindən sonra baş verən hadisələrdə yeganə təşəbbüsçü və rəhbər şiələr olmuşdur. Digər maraqlara, Əməvi hakimiyyətindən narazılıqlarına, yaxud başqa amillərə görə əməldə şiələrlə əlbir olan, döyüşlərdə iştirak edənlər də çox idi. Tarixin bu dönəminin müxtəlif hadisələrində iştirak edən, fəal, yaxud adi rol oynayan bütün şəxslərin şiə - yəni imamların yaratdığı .mütəşəkkil qrupun üzvü olduqlarını söyləmək olmaz

Yuxarıda deyilənlərdən sonra üzərində dayanmaq istədiyim məqam budur ki, İmam Hüseynin (ə) şəhadətindən sonraya



---

١- [١۶٢] Məlumat əl-Əxbar ət-tival kitabında qeyd olunmuşdur.

٢- [١۶٣] Təbəri, c. ٧.

٣- [١۶۴] Cihad əş-Şiə, səh: ٢٧.

qədər şiə adı İmam Əlinin (ə) dövründə olduğu kimi yalnız düşüncə və əməl baxımından həqiqi imamla güclü və bəlli əlaqəyə sahib olanlara şamil edilirdi. İmam Həsənin (ə) sülhündən sonra onun fərmanı ilə mütəşəkkil Şiə təşkilatını yaradan, özlərinin güclü və geniş təbliğatları ilə düşüncə və ideologiya baxımından özləri kimi olmayan çoxlarını Şiə təşkilatına və hadisələrinə çəkən bu qrup idi. Bu söhbətin əvvəlində İmam Sadiqdən (ə) bir hədis söylədim ki, möminlər üç, yaxud beş nəfərdən ibarət idi. Burada məqsəd həmin qrupdur - yəni şiələr, imamların yaxın ətrafı, Əli (ə) və Haşim övladlarının inqilablarının dinamik hərəkətində məqsədli və həlledici rol .oynayan şəxslər

## İmam Səccadın (ə) gizli və zahirən sakit görünən fəaliyyəti

İmam Səccadın (ə) gizli və zahirən sakit görünən fəaliyyəti nəticəsində bu qrup öz potensial kadrlarını tapdı, cəlb etdi, artırdı və İmam Sadiqin (ə) indi işarə vurduğum rəvayətdə söylədiyi kimi xalq onlara qoşuldu və çoxaldılar. İmam Səccad (ə), İmam Baqir (ə) və İmam Sadiqin (ə) dövründə bu qrupun şübhəli hərəkəti xilafət başçılarını .qorxudur və bəzən sərt reaksiyalara vadar edirdi

Qısası budur ki, İslamın ilk əsrlərində, imamların dövründə şiə və qeyri-şiələrə görə şiə adı yalnız qəlbində Peyğəmbər (s) ailəsini sevən, yaxud mərkəzində imamların durduğu fəaliyyətlərdə iştirak etməsə belə, onların haqlı olmasına və dəvətlərinin doğruluğuna sadəcə inanan şəxsə şamil olmurdu. Şiə olmağın bunlardan əlavə mühüm və zəruri bir şərti vardı və o, imamla düşüncə və əməl əlaqəsi, qəsb olunmuş haqqı geri qaytarmaq, Əli (ə) və İslam quruluşu qurmaq üçün imamın təşəbbüsü və rəhbərliyi ilə aparılan ideoloji, siyasi və bəzən hərbi fəaliyyətlərdə iştirak etməkdir. Bu əlaqə Şiə ədəbiyyatında vilayət adlanır. Şiə sözü əslində imamət təşkilatı, imamın rəhbərliyi ilə müəyyən fəaliyyətlər göstərən və repressiya dövründə bütün narazı partiya və təşkilatlar kimi məxfi şəraitdə yaşayan qrupun adı idi. Bu, imamların, xüsusən də İmam Sadiqin (ə) həyatına dəqiq bir baxışın xülasəsidir. Qeyd etdiyim kimi, bunu isbat etmək üçün açıq dəlillər

gözləmək olmaz. Çünki gizli bir obyekti tapmaq üçün plakat axtarmazlar. Baxmayaraq ki, qəti fakt olmadan onu qəbul etmək də düzgün deyil. Odur ki, tarixi məlumatları, fakt və işarələri araşdırmaq lazımdır. (Sadiq rəhbər, səh. ۹۷-۱۰۷)

səh:۲۲۹

## (On dördüncü fəsil: İmam Kazim (ə

### İşarə

Həzrət Əbülhəsən Musa ibn Cəfərin (ə) ١۴٨-ci ildən ١٨٣-cü ilə qədər sürən ٣۵ illik imamət çağı imamların həyatının ən mühüm dövrlərindən biridir. Ən qüdrətli Bəni-Abbas xəlifələrinin ikisi - Mənsur və Harun və onların iki ən zalım şahı olan Mehdi və Hadi bu dövrdə hakimiyyətdə olmuşlar. Xorasanda, Afriqiyyədə, Mosulda, Deyləmdə, Qorqanda, Şamda, Nəsibeyndə, Misirdə, Azərbaycanda və digər yerlərdə çoxlu qiyamlar yatırıldı, böyük İslam məmləkətinin şərq, qərb və şimal sərhədlərində əldə .edilən yeni zəfərlər və çoxlu qənimətlər Abbasilərin taxtını daha da möhkəmlətdi

Bu dövrdə ideoloji və etiqadi məktəblərin bəzisi çox inkişaf etmiş, bəzisi yeni yaranmışdı; düşüncə mühiti ziddiyyətə köklənmiş, hakimlərin əlində bir silaha, xalqın dini və siyasi sayıqlığına isə təhlükəyə çevrilmişdi. Əsl İslam təlimlərinin öndərlərinə və .Əli (ə) dəvətinin aparıcılarına ağır şərait yaranmışdı

Şeir, incəsənət, fiqh, hədis, hətta zahidlik və təqva da hakim qüvvələrin xidmətində duraraq onların sərvət və güc vasitələrini tamamlayırdı. Bu zaman xilafəti nə Bəni-Üməyyə dövrünün sonlarındakı, nə Bəni-Abbas dövrünün ilk on ilindəki, nə də Harunun ölümündən sonrakı dövrdə olduğu kimi ciddi bir təhlükə təhdid etmir, .xəlifənin diqqətini dərin və davamlı Əhli-beyt dəvətindən yayındırmırdı

Bu dövrdə Əhli-beytin və onların sadiq tərəfdarlarının mübarizəsinə, ideoloji və siyasi hərəkətinə inkişaf və davam imkanı verəcək yeganə amil onların yorulmaz fəaliyyəti, təhlükəli mübarizəsi və ilahi üsul olan təqiyyədən istifadə idi. Həzrət Musa ibn Cəfərin .(ə) mübarizəsinin heyrətamiz və fövqəladə böyüklüyü də bunda idi

Qeyd etməliyəm ki, İslam tarixçiləri İmam Musa ibn Cəfərin (ə) həyatını araşdırarkən bu böyük imamın uzunmüddətli həbsindən ibarət olan böyük və misilsiz

hadisəyə lazımi diqqət ayırmamış və nəticədə onun mühüm mübarizəsindən xəbərsiz .qalmışlar

illik imamlığının hamısını əhatə edən davamlı mübarizə amilinə diqqət yetirmədən ۳۵ bu uca imamın həyatını araşdırmaq, bir-biri ilə əlaqədar olmayan müxtəlif hadisələr haqda fikir bildirmək, onun elmi və mənəvi məqamını incələmək, ailəsi, səhabələri, şagirdləri, elmi-etiqadi mübahisələri və digər məsələlər haqda danışmaq yarımçıq və natamam olar. Bu amili aydınlaşdırandan sonra bu səmərəli həyatın bütün hissələri bir-birinə bağlanır, hər bir məsələnin, hadisənin və hərəkətin mənalandığı aydın, kamil .və istiqamətli bir təsvir ortaya çıxır

Nə üçün həzrət İmam Sadiq (ə) Müfəzzələ buyurur ki, bu gəncin imamlığını yalnız etimadlı şəxslərə de? O, nə üçün Əbdürrəhman ibn Həccaca açıq söyləmədən işarə ilə deyir ki, zireh onun əyninədir; Səfvan Cəmmal kimi yaxın səhabələrə də onu əlamətlə tanıtdırır? Nə üçün öz vəsiyyətnaməsində canişin kimi övladının adını birincisi Mənsur Abbasi, sonra Mədinənin hakimi, sonra isə iki qadının adının qeyd olunduğu dörd nəfərdən sonra çəkir? Belə ki, o həzrətin vəfatından sonra bəzi böyük şiələr bu ۲۰ yaşlı gəncin onun canişini olmasını bilmirlər. Nə üçün bir məmləkətdə iki xəlifəyə xərac gətirirlər(۱) deyən Harunla yumşaq danışır və bunu inkar edir, amma Həsən ibn Abdullah adlı nüfuzlu və zahid bir kişiyə müraciətlə imamı tanımaqdan danışır, özünün ?itaəti vacib buyurulan imam olduğunu bildirir

Nə üçün Harunun sarayında yüksək vəzifə tutan və imamın müridlərindən olan Əli ibn Yəqtinə təqiyyə etməyi əmr edir, Səfvan Cəmmalı isə rejimə xidmət etdiyinə görə qınayır və xəlifə ilə əlaqəsini kəsməyə çağırır? Böyük İslam dünyasında öz dost və tərəfdarları arasında necə və hansı vasitə ilə bu qədər güclü əlaqə qurur və Çinə qədər ?uzanan bir şəbəkə yaradır



---

.Təbrisi. Əl-İhticac, c. ۲, səh: ۳۸۹ [۱۶۵] -۱

Nə üçün Mənsur, Mehdi, Harun və Hadi öz dövrlərində onu öldürməyə, həbs etməyə və sürgünə yollamağa təşəbbüs götərirlər? Nə üçün o həzrət ۳۵ illik imamlığının bir hissəsini – bəzi rəvayətlərdən anlaşıldığı kimi – məxfi şəkildə keçirərək Şamın kəndlərində, yaxud Təbəristanın bəzi bölgələrində gizlənir, dövrün xəlifəsi tərəfindən təqib olunur və öz tərəfdarlarına deyir ki, xəlifə mənim haqqımda soruşanda məni ?tanımadığınızı və harada olduğumu bilmədiyinizi söyləyin

Nə üçün Harun həcc səfərində o həzrətə çox hörmət edir, başqa bir səfərdə isə sürgünə yollanmasını əmr edir? Nə üçün o həzrət əvvəldə mülayim davranıb Ələviləri həbsdən azad edən Harunun xilafətinin əvvəllərində Fədəki bütün İslam dünyasına şamil edir və xəlifə etirazla deyir ki, onda qalx, gəl mənim yerimdə otur? Və nə üçün həmin mülayim xəlifənin rəftarı bir neçə ildən sonra elə sərtləşir ki, o həzrəti ağır rejimli zindana salır və illərlə həbsdə saxladıqdan sonra buna da dözməyərək ?cinayətkarcasına zəhərləyib şəhid edir

Bunlar və İmam Musa ibn Cəfərin (ə) həyatında ilk baxışdan bir-biri ilə əlaqəsiz və bəzən ziddiyyətli görünən yüzlərlə mühüm hadisə o zaman əsl mənasını tapar ki, biz o həzrətin imamlığından şəhidliyinə qədər davam etmiş əsas xətti görək. Bu, imamların ۲۵۰ illik çağın hamısında müxtəlif formalarda davam edən cihad və mübarizə xəttidir. Bunda məqsəd əvvəla əsl İslamı açıqlamaq, Quranı düzgün təfsir etmək və İslam etiqadlarına dair aydın təsəvvür yaratmaq, ikincisi İslam cəmiyyətində imamət və siyasi hakimiyyət məsələsini başa salmaq, üçüncüsü isə uyğun cəmiyyəti qurmaq, böyük İslam peyğəmbərinin və bütün peyğəmbərlərin ədaləti bərqərar etməkdən, Allaha şərik çıxanları hakimiyyətdən uzaqlaşdırmaqdan və cəmiyyəti Allahın xəlifələrinə, saleh bəndələrinə tapşırmaqdan ibarət olan məqsədini həyata keçirməyə .çalışmaqdır

İmam Musa ibn Cəfər (ə) bütün həyatını bu müqəddəs cihada həsr etmişdi. Onun dərsi, təlimi, fiqhi, hədisi, təqiyyəsi

və tərbiyəsi bu istiqamətdə idi. Təbii ki, onun dövrünün öz özəllikləri vardı, cihadı da zamana uyğun idi. İmam Səccadın (ə) dövründən İmam Əsgəriyə (ə) qədər səkkiz imamın hər birinin, yaxud hər bir neçəsinin dövr və mübarizələrində özəl xüsusiyyətləri olmuşdur. Onların həyatı ümumilikdə ۲۵۰ illik həyatın müxtəlif (mərhələlərə bölünən dördüncü dövrünü təşkil edir. (۱۹۸۹

## Yorulmaz fəaliyyət və təqiyyə metodu

Musa ibn Cəfərin (ə) həyatı heyrətamiz və qəribədir. Əvvəla onun yaxınlarına hər şey aydın idi, yaxınları və xüsusi səhabələri arasında nə üçün çalışdığını bilməyən yox idi. Musa ibn Cəfərin (ə) özü də söz, işarə və məxfi işləri ilə bunu digərlərinə göstərirdi. İmamın yaxınlarından olan bir rəvayətçi deyir ki, imam öz otağında oturmuşdu. Mən içəri daxil olanda otaqda üç şey gördüm: Biri cod parçadan qeyri-adi bir paltar idi, döyüş geyiminə bənzəyirdi. Musa ibn Cəfər (ə) bu paltarı geyinmirdi, simvolik bir şey idi. Bundan əlavə, orada tavandan, ya da divardan asılmış bir xəncər və bir Quran vardı.(۱) Görün necə gözəl simvollardır! O həzrətin xüsusi səhabələrindən başqa bir kəsin daxil olmadığı otağında bir ideoloji döyüş adamının əlamətləri müşahidə olunur. Xəncər məqsədin cihad olduğunu göstərir. Cod paltar göstərir ki, vasitə sərt hərbi və inqilabi həyatdır. Quran da göstərir ki, bu vasitələrlə və çəkdiyimiz məşəqqətlərlə .Quran həyatına nail olmaq istəyirik. Həzrətin düşmənləri də bunu təxmin edirdilər

Əvvəla Musa ibn Cəfərin (ə) imamlığı ən ağır dövrdə başlandı. Məncə İmam Səccaddan (ə) sonra heç bir dövr bu qədər ağır olmadı. Musa ibn Cəfər (ə) hicrətin ۱۴۸-ci ilində atası İmam Sadiqin (ə) vəfatından sonra imamlığa çatdı. ۱۴۸-ci ildə Abbasilər ilk vuruşmaları, daxili ixtilafları və xilafətlərinin əvvəlində Bəni-Abbas arasında yaranan döyüşləri arxada qoymuşdular, onların xilafətini təhdid edən



---

.Bihar əl-ənvar, c. ۴۸, səh: ۱۰۰ [۱۶۶] -۱

şəxsiyyətləri, məsələn, İmam Həsənin (ə) nəvələri olan Məhəmməd ibn Abdullah ibn Həsən, İbrahim ibn Abdullah ibn Həsən və Abbasilər əleyhinə mübariz və qiymaçılardan ibarət olan digərlərinin hamısını məğlub etmişdilər. Mənsur Abbasinin ölümündən sonra açılan anbarda çoxlu böyük şəxsiyyətlərin cəsədləri peyda oldu. Mənsur Bəni-Həsən, Bəni-Haşim qəbilələrindən, öz qohum və yaxınlarından o qədər məşhur adam öldürmüşdü ki, bir anbar skelet yığılmışdı. Bunların hamısını həll edəndən sonra növbə İmam Sadiqə (ə) çatdı və hiylə qurub onu da zəhərlətdi. Abbasilərin siyasi həyatı üçün başqa heç bir problem qalmamışdı. Mənsurun zahiri iqtidarın zirvəsində durduğu belə bir şəraitdə gənc Musa ibn Cəfər (ə) imam oldu. İmam Sadiqdən (ə) sonra kimə müraciət etməli olduqlarını öyrənmək istəyənlər də onu çətinliklə tapırdılar. İmam onlara tövsiyə edirdi ki, ehtiyatlı olun, məndən söz eşitdiyinizi, təlim aldığınızı, mənimlə əlaqədə olduğunuzu bilsələr, sizi öldürərlər. Musa .ibn Cəfər (ə) belə bir şəraitdə imamlığı üzərinə götürdü və mübarizəyə başladı

Siz Musa ibn Cəfərin (ə) imamlığa çatanda mübarizəyə necə başladığını, nə iş gördüyünü, kimi topladığını, haralara getdiyini, bu ۳۵ ildə hansı hadisələrin baş verdiyini soruşsanız, təəssüf ki, konkret cavab verə bilməyəcəyəm. Bu, İslamın erkən həyatına dair təəssüflü məsələlərdəndir. Bu ۳۵ illik dövrə dair əlimizdə yazılı tarix yoxdur. Buna görə deyirəm ki, kitab yazılmalı, tədqiqat işləri görülməlidir. Hələliksə .bəzi pərakəndə materiallar var və bunlardan çox şey anlamaq olar

Biri budur ki, İmam Musa ibn Cəfərin (ə) ۳۵ illik imamlığı dövründə dörd xəlifə hakimiyyətdə olmuşdur. Biri Mənsur Abbasidir. Musa ibn Cəfərin (ə) imamlığının ilk ۱۰ ilində xəlifə o idi. Ondan sonra oğlu Mehdi xəlifə oldu. O da ۱۰ il hakimiyyətdə qaldı, sonra Mehdinin oğlu Hadi Abbasi bir il xəlifə oldu, ondan da sonra isə Harun ər-Rəşid. Musa ibn Cəfər (ə) Harunun xilafəti zamanı yaşadığı təxminən ۱۲-۱۳

ildə də imamətin təbliği ilə məşğul idi. Bu dörd xəlifənin hər biri Musa ibn Cəfəri (ə) bir .növ təzyiq və məşəqqət altında saxladı

## Mənsur imamı məcburən Bağdada çağırdı

Mənsur imamı məcburən Bağdada çağırdı, daha doğrusu sürgün etdi. Bu qeyd etdiklərim həmin hadisələrin bəzisidir. Musa ibn Cəfərin (ə) həyatında belə hadisə çox olmuşdur. Bunların biri onun Mədinədən Bağdada gətirilməsidir. Onu bir müddət Bağdadda nəzarət altında saxladı. Rəvayətlərdən ona çoxlu problemlər yaradıldığı anlaşılır. Bu birinci dəfəsidir; nə qədər sürməsi də bəlli deyil. Yenə də Mənsurun dövründə güman ki, onu ikinci dəfə İraqda Əbcər adlı bir yerə gətirdilər və bir müddət orada saxladılar. Bəzi rəvayətçilər orada Musa ibn Cəfərlə (ə) görüşmüş və bəzi hadisələri qeyd etmişlər. Mehdi Abbasinin dövründə ən azı bir dəfə onu Mədinədən Bağdada gətirdilər. Rəvayətlərdən məlum olur ki, bir neçə dəfə aparmışlar. Mənim zənnimcə, Mehdinin xilafəti dövründə onu ۲-۳ dəfə Bağdada çağırmışlar. Bir rəvayətçi deyir ki, mən imamla görüşüb təəssüf və narahtlığımı bildirdim. Buyurdu ki, narahat olma, mən bu səfərdən salamat qayıdacağam, onlar bu dəfə mənə zərər yetirə .bilməyəcəklər. Bu da Mehdinin dövrü

## Hadi Abbasinin dövrü

Hadi Abbasinin dövründə də imamı öldürmək məqsədi ilə Bağdada çağırdılar. Xəlifənin ətrafındakı fəqihlərin biri narahat oldu, Peyğəmbər (s) övladının belə zülm görməsinə dözməyib vasitəçilik etdi, Hadi Abbasi də fikrindən daşındı. Məncə Harunun dövründə də imamı bir neçə dəfə Mədinədən ayırmışlar. Qəti bilinən isə budur ki, bir dəfə imamı gətirib müxtəlif yerlərdə, o cümlədən Bağdadda həbsdə saxladılar və axırda Sindi ibn .Şahəkin zindanında şəhid etdilər

Görürsünüz ki, imaməti təbliğ etdiyi, vəzifəsini yerinə yetirdiyi və mübarizəsi ilə məşğul olduğu ۳۴-۳۵ il ərzində Musa ibn Cəfəri (ə) dəfələrlə Bağdada çağırmışlar. Bundan əlavə, dövrün xəlifələri Musa ibn Cəfəri (ə) öldürmək üçün bir neçə dəfə plan qurdular. Mənsurun oğlu Mehdi Abbasi xəlifə olanda öz vəziri, yaxud keşikçibaşı olan Rəbiə dedi ki, Musa ibn Cəfəri (ə) məhv etmək üçün bir şey düşün; onun çox

təhlükəli olduğunu hiss edirdi. Qeyd etdiyim kimi, Hadi Abbasi də xəlifəliyinin əvvəlində onu öldürmək qərarına gəldi, hətta bu məqsədlə bir şeir də qoşdu. Şeirdə deyilirdi ki, Bəni-Haşimə güzəşt dövrü bitdi; mən qəti qərara gəlmişəm ki, sizdən heç kəsi sağ qoymayım və məhv edəcəyim birinci şəxs Musa ibn Cəfər (ə) olacaq. Ondan sonra Harun ər-Rəşid də bu işi görmək istəyirdi və gördü də. O, sonda bu böyük cinayəti !törətdi. Görün Musa ibn Cəfərin (ə) həyatı necə macəralı keçmişdir

Bunlardan əlavə, Musa ibn Cəfərin (ə) həyatında aydın olmayan çox zərif məqamlar var. Musa ibn Cəfər (ə) bir müddət məxfi yaşamış, harada olduğu bilinməmişdir. Dövrün xəlifəsi müxtəlif insanlardan Musa ibn Cəfər (ə) haqda soruşur, yerini araşdırırdı, onlar da bilmədiklərini söyləyirdilər. Bir rəvayətə əsasən, Musa ibn Cəfər (ə) bir nəfərə dedi ki, səni çağırıb mənim haqqımda soruşacaqlar, məni gördüyünü inkar et və görmədiyini söylə. Elə də oldu: Musa ibn Cəfərin (ə) yerini soruşmaq üçün .onu zindana apardılar

Siz görün hansı insanın həyatı belə keçə bilər?! Yalnız ibadət hökmlərini deyən, İslamdan danışan, hökumətlə heç bir işi olmayan və siyasi mübarizə aparmayan bir şəxs belə təzyiqlərə məruz qalmaz. Mən hətta bir rəvayətdə gördüm ki, Musa ibn Cəfər (ə) bir müddət Mədinədə olmamışdır; dövrün hakim rejimi tərəfindən təqib olunur, Şam kəndlərində gizlənir, casuslar tərəfindən güdülür, bu kənddən o kəndə, o kənddən bu kəndə gedir, geyimini və görkəmini dəyişirmiş. İmam həmin ərəfədə bir mağara ilə rastlaşır, içəriyə daxil olur və orada bir məsihi ilə söhbət edir; yəni o zaman da həqiqəti bəyan etməkdən ibarət olan ilahi vəzifəsini unutmur. O, məsihi ilə söbhət (edir və məsihi müsəlman olur.(١

Musa ibn Cəfərin (ə) macəralı həyatı belə keçmişdir. Siz görün bu həyat necə təlatümlü və həyəcanlıdır. Biz elə bilirik



---

.Yenə orada, səh: ١٠۵ [١۶٧] -١

ki, Musa ibn Cəfər (ə) Mədinədə yaşayan məzlum, səssiz və başıaşağı bir kişi olmuşdur, məmurlar onu Bağdada, Kufəyə, yaxud Bəsrəyə gətirib zindana salmış, sonra da zəhərləmişlər, vəssalam. Halbuki belə deyil. O ətrafına çoxlu insanlar toplayıb uzun müddət mütəşəkkil mübarizə aparmışdır. Bütün İslam bölgələrində Musa ibn Cəfəri (ə) sevənlər vardı. Musa ibn Cəfərin (ə) hakim rejimə bağlı olan naxələf qardaşoğlusu Harunla danışanda deyir ki, ey Harun, yer üzündə yalnız sənin xəlifə olduğunu, xalqın yalnız sənə xərac və vergi verdiyini sanma. Əslində iki xəlifə var: biri sənsən, biri isə Musa ibn Cəfər (ə); xalq sənə də vergi və pul verir, Musa ibn Cəfərə (ə) də. Bu bir həqiqət idi. O, bədxahlıqla deyirdi, söz aparmaq istəyirdi, amma dedikləri həqiqət idi. Bütün İslam bölgələrindən Musa ibn Cəfərlə (ə) əlaqəsi olan şəxslər vardı, amma bu əlaqələr açıq silahlı mübarizəyə başlamağa kifayət etmirdi. Nəhayət, növbə Harun ər-Rəşidə çatdı. O zaman İslam məmləkətində qiyam baş verməsə və hakimiyyət təxminən rahat şəkildə işlərini görsə də, Musa ibn Cəfərin (ə) həyat tərzi və təbliğat dairəsi onun fiziki məhvini çətinləşdirirdi. Harun ağıllı və bacarıqlı bir xəlifə idi. Məşhur tarixçi olan Təbəri ehtimalla, yaxud qəti şəkildə deyir ki, Harun ər-Rəşid həcc niyyəti ilə Məkkəyə yola düşdü, amma əsas məqsədi Mədinəyə gedib Musa ibn Cəfəri (ə) yaxından görmək idi. Barəsində bu qədər danışılan, bu qədər dostu, hətta Bağdadda da tərəfdarları olan bu şəxsiyyəti tanımaq, ondan qorxmalı olub-olmadığını bilmək istəyirdi. O, Musa ibn Cəfərlə (ə) bir neçə dəfə görüşdü. Bu görüşlər olduqca əhəmiyyətli və həssas görüşlərdir. Musa ibn Cəfər (ə) bir dəfə güman ki, tanınmaz şəkildə Məscidül-həramda Harunla rastlaşır, onların arasında sərt müzakirə gedir və imam oradakıların qarşısında xəlifənin əzəmətini sındırır. O zaman Harun Musa ibn Cəfəri (ə) tanımır.

### Mədinəyə gələndə Harunun imamla bir neçə mühüm görüşü

Mədinəyə gələndə Harunun imamla bir neçə mühüm görüşü olmuşdur. Mən yalnız işarə vururam ki, tədqiqatçılar ətraflı araşdırsınlar. Harun ər-Rəşid bu görüşlərdə bir müxalif

insanı və həqiqi mübarizi ələ almaq üçün lazım olan hər bir işi görür: hədələyir, (tamahlandırır və hiyləgərlik edir. (١٩٨٥

Eşitmisiniz ki, Harun xəlifə olandan sonra Mədinəyə gəlib Musa ibn Cəfərə (ə) hörmət ifadə etdi. Bu barədə Harunun oğlu Məmunun danışdığı məşhur əhvalat kitablarda yazılıb. Deyir ki, Musa ibn Cəfər (ə) uzunqulaqla gəlib Harunun oturduğu yerə daxil oldu. Uzunqulaqdan enmək istəyəndə Harun and verdi ki, enmə və mənim yanıma qədər belə gəl. Sonra Harun onu hörmətlə qarşıladı. Gedəndə bizə dedi ki, cilovu tutub ötürün. Həmin rəvayətdə Məmun deyir ki, atam Harun hamıya beş min və ya on min dinar bağışlayırdı, Musa ibn Cəfərə (ə) isə yalnız iki yüz dinar verdi. Halbuki söhbət edəndə onun vəziyyətini soruşmuş, o da demişdi ki, çoxlu övladlarım, problemlərim var və məişət vəziyyətim yaxşı deyil. Məncə bu söhbətlər də çox maraqlıdır; bizim üçün çox tanış və tamamilə başadüşüləndir. İnsan Haruna necə deyə bilər ki, bəli, vəziyyətimiz yaxşı deyil, güzəranımız ağır keçir və sair. Bu, əsla dilənmək və alçalmaq .deyil. İnsan özü etmiş olsa, bunun nə olduğunu bilər

Bilirəm ki, zalım rejim dövründə sizin çoxunuz belə etmisiniz və bu tamamilə başadüşüləndir. Hər halda, bu sözlərdən sonra Harun deməli idi ki, məsələn, al bu əlli min dinar da sənin olsun, amma yalnız iki yüz dinar verir. Məmun deyir ki, sonra atamdan nə üçün belə etdiyini soruşdum. Dedi ki, çox pul versəydim, Xorasının əli xəncər tutanlarını səfərbər edib iki yüz min insanı mənim canıma salardı. Bu, Harunun fikridir və o, düzgün anlamışdı. Bəzi adamlar elə bilirlər ki, imama şər atırdı. Xeyr, həqiqət idi. Harunla mübarizə apardığı zaman Musa ibn Cəfərin (ə) pulu olsaydı, çoxları onun kənarında dayanıb vuruşardılar. Biz buna dair nümunələri imamlardan qeyrilərində görmüşük. Harundan öncə Fəxx şəhidi olan Hüseyn ibn Əli və digərləri qiyamlar etmişdilər. Onların işi göstərirdi ki, imamlar öz ətraflarına nə qədər insan (toplaya bilərlər. Odur ki, Harun düzgün anlamışdı. (١٩٨۶

Orada Musa ibn Cəfərlə (ə) söhbət edərkən deyir ki, siz Əli (ə) ailəsi Fədəkdən məhrum edilmisiz, mən onu sizə qaytarmaq istəyirəm, de görək Fədək haradır, əhatəsi nə qədərdir? Bəllidir ki, bu bir hiylə idi. O, Peyğəmbər (s) ailəsinin məhrum edildiyi haqqını qaytarmaqla özünə hörmət qazanmaq istəyirdi. İmam dedi ki, çox gözəl, qaytarmaq istəyirsənsə, mən yerini müəyyən edərəm. Sonra başlayır Fədəkin ərazisini təyin etməyə. İmam Musa ibn Cəfərin (ə) Fədək üçün təyin etdiyi sahə ozamankı bütün İslam dünyasını əhatə edirdi. Fədək budur, sən bizim ozamankı mübahisəmizin bir bağ və bir neçə xurma ağacı üstündə olduğunu düşünürsənsə, çox sadəlövhsən. O zaman da bizim problemimiz bir neçə xurma ağacı və Fədək bağı deyildi. Söhbət Peyğəmbər (s) canişinliyi və İslam hakimiyyətindən gedirdi. Lakin o zaman düşünürdülər ki, Fədəki almaqla bizi bu hüquqdan tam məhrum edə bilərlər. Biz buna görə bu məsələ üzərində israrla dayanırdıq. Bu gün sənin bizdən qəsb etdiyin isə Fədək bağı deyil, İslam cəmiyyəti və İslam ölkəsidir. Musa ibn Cəfər (ə) dörd tərəfi təyin edib deyir ki, Fədək budur, vermək istəyirsənsə, ver. Yəni orada açıq şəkildə hakimiyyət və xilafət iddiasını (ortaya qoyur. (۱۹۸۵

Dedi ki, Fədəkin hüdudlarını təyin et, onu sənə qaytarım. İmam əvvəlcə bundan imtina etdi, sonra buyurdu ki, tam şəkildə versən, alaram. O dedi ki, çox yaxşı, hüdudlarını müəyyən et. Çox maraqlıdır ki, həzrət onun hüdudlarını təyin edərək deyir: Bir tərəfi Ədəndir. Bunlar Mədinədə, ya da Bağdadda oturub söhbət edirlər. Deyir ki, bir tərəfi Ərəbistan yarımadasının sonu olan Ədəndir. Bunu deyəndə Harunun rəngi dəyişdi. Sonra buyurdu ki, bir tərəfi Səmərqənddir. Bu zaman Harunun rəngi qızardı. Buyurdu ki, üçüncü tərəfi Tunisdir. Bu zaman Harun ər-Rəşidin rəngi qaraldı. Dedi ki, maraqlıdır! Sonra buyurdu ki, dördüncü tərəfi dənizlərin kənarı, adalar, misal üçün, Aralıq dənizidir və sair. Harun ər-Rəşid dedi ki, bəs bizə nə qaldı; onda qalx gəl, mənim yerimdə əyləş. ,İmam Kazim (ə) buyurdu: Sənə dedim ki

hüdudlarını təyin etsəm, qaytarmayacaqsan. Rəvayətçi deyir ki, bu zaman Harun ər-(Rəşid onu öldürmək qərarına gəldi.(۱) (۱۹۸۶

**Harun ər–Rəşid Mədinədə Peyğəmbərin (s) məqbərəsinə daxil oldu**

Harun ər-Rəşid Mədinədə Peyğəmbərin (s) məqbərəsinə daxil oldu. O, xəlifənin ziyarətinə tamaşa edən müsəlmanlara özünü göstərmək və Peyğəmbərlə (s) qohum olduğunu bildirmək üçün qəbrə yaxınlaşıb belə salam verdi: Salam olsun sənə, ey əmioğlu! O bununla özünün Peyğəmbərin (ə) əmisi oğlu olduğunu bildirmək istəyirdi. Musa ibn Cəfər (ə) dərhal qəbrin önündə dayanıb dedi: Salam olsun sənə, ey ata! Yəni Peyğəmbər (s) sənin əmin oğludursa, mənim atamdır. İmam həmin məclisdə Harunun .hiyləsini puça çıxardı

Harun ər-Rəşidin ətafında olanlar da xilafət üçün ən böyük təhlükənin Musa ibn Cəfərdən (ə) ibarət olduğunu duydular. Hakimiyyətə yaxın adamlardan biri orada dayanmışdı. Gördü ki, uzunqulağa minmiş bir şəxs sadə şəkildə, zadəgan olduğundan xəbər verəcək qiymətli bir ata minmədən oraya gəldi və gələn kimi yolu açdılar. Zənnimcə bu hadisə həmin səfərdə Mədinədə baş verdi. Soruşdu bu kimdir ki, hamı ona hörmət göstərdi və xəlifənin ətrafındakılar ona yol açdılar. Cavab verdilər ki, bu, Musa ibn Cəfərdir (ə). İmamın adını eşidən kimi dedi ki, bu axmaqlığına görə vay olsun Bəni Abbasa! Onların ölümünü istəyən, hökumətlərini devirəcək adama belə hörmət edərlər?! Onlar bilirdilər ki, Musa ibn Cəfər (ə) xilafətə çox elmli, təqvalı, düzgün olan və onu tanıyan hər kəsin bundan xəbərdar olduğu böyük bir rəhbər qədər təhlükəlidir. İslam dünyasının hər bir tərəfində onun heç kimdən qorxmayan şücaətli dostları, .sevənləri var. Buna görə də Harunun zahiri əzəməti önündə belə qorxmadan danışır

Bütün İslam dünyasında tərəfdarları, İslam hökuməti və İslam quruluşu üçün planı olan belə bir mübariz, mücahid və Allaha güvənən şəxsiyyət Harunun hakimiyyətinə ən böyük təhlükədir. Buna görə Harun bu təhlükəni önündən götürmək



---

.Yenə orada, səh: ۱۴۴ [۱۶۸] -۱

qərarına gəldi. O, siyasətcil adam idi, bu işi birdəfəyə görmədi. Əvvəlcə dolayı yolla bu işi görmək istədi, sonra gördü ki, yaxşısı budur onu həbs etsin, bəlkə zindanda onunla bazarlıq edə, ona imtiyaz verə və ya təzyiq altında təslim edə bilər. Bu məqsədlə Musa ibn Cəfərin (ə) həbsinə fərman verdi. Mədinə əhalisinin qıcıqlanmaması və Musa ibn Cəfərin (ə) taleyinin necə olmasını bilməmələri üçün iki karvan hazırlayıb birini İraqa, birini isə Şama sarı yolladılar və əhali onun haraya aparıldığını bilmədi. Onu xilafətin paytaxtı Bağdada gətirib zindana saldılar. Bu dustaqlıq uzun çəkdi. Qəti olmasa da, ehtimal var ki, imamı bir dəfə zindandan azad edib, yenidən tutdular. Qəti olan budur .ki, sonuncu dəfə imamı öldürmək məqsədi ilə tutdular və bu işi gördülər

**İmam Musa ibn Cəfər (ə) zindanda da işıqlı məşəl kimi özünün bütün ətrafına nur saçır**

Baxın, haqq budur. İslam təfəkkürü və Qurana əsaslanan mübarizə belə bir şeydir, heç zaman, ən ağır şəraitlərdə belə dayanmır. Musa ibn Cəfər (ə) bu işi gördü. Bu haqda çoxlu əhavalat və rəvayətlər var. Siz bilirsiniz ki, məşhur Sindi ibn Şahək çox güclü və qəddar zindanban, Bəni-Abbasın muzdurlarından və xilafətə sadiq qüvvələrdən idi. İmam Musa ibn Cəfərin (ə) zindanbanı o idi; öz evində çox ağır şəraitli bir zirzəmidə imamı dustaq etmişdi. Sindi ibn Şahəkin ailəsi bəzən bir bacadan zindana baxıb Musa ibn Cəfərin (ə) ağır vəziyyətindən təsirlənirdilər, ürəklərində Əhli-beytə sevgi yaranırdı. Sindinin övladlarından olan Kəşacim Şiə məzhəbinin böyük şəxsiyyətlərindəndir. Sindidən iki, yaxud bir nəsil sonra yaşamış bu insan öz dövründə ən böyük Şiə ədiblərindən, şairlərindən olmuşdur. Bunu hamı qeyd etmişdir; adı .Kəşacim Sindidir

Musa ibn Cəfərin (ə) məhbəs həyatı belə keçmişdir. Dəfələrlə gəlib onu hədələmiş, vədlər vermiş, razı salmağa çalışmışlar. O isə ilahi qüdrətlə, Allaha və onun lütfünə sığınmaqla müqavimət göstərmişdir. Həmin müqavimət bu günə qədər Quranı və İslamı qorumuşdur. Bilin ki, biz bu gün imamlarımızın azğın cinahlar qarşısında müqavimətləri

sayəsində həqiqi İslamı tapa bilirik. Onların sayəsində bu gün müsəlmanlar və bəşər nəsilləri Şiə və hətta Əhli-sünnə kitablarında İslam, Quran və Peyğəmbər (s) sünnəsi adlı bir şey görürlər. Əgər bu ۲۵۰ il boyu imamların çətin mübarizələri olmasaydı, bilin ki, Bəni-Üməyyə və Bəni-Abbas dövrlərinin muzdur yazar və natiqləri İslamı tədricən dəyişib əvəzləyərdilər və bir-iki əsrdən sonra İslamdan heç bir şey qalmazdı; Quran ya qalmazdı, ya da təhrif olunardı. Bu uca bayraqlar, işıqlı məşəllər və hündür minarələr tarixdə yaşayıb İslamın şüasını ətrafa elə saçdı ki, təhrif etmək və qaranlıq mühitdə həqiqətləri dəyişdirmək istəyənlər buna imkan tapmadılar. İmamların şagirdləri yalnız şiələr deyil, bütün İslam firqələrindən olmuşlar. Şiə amalına, yəni imamətə etiqad bəsləməyən çoxlu insanlar imamlara şagirdlik etmiş, onlardan təfsir, Quran, hədis və Peyğəmbər (s) sünnəsini öyrənmişlər. İslamı bu günə qədər bu .müqavimətlər saxlamışdır

Nəhayət, Musa ibn Cəfəri (ə) zindanda zəhərlədilər. İmamların həyatının acı hadisələrindən biri Musa ibn Cəfərin (ə) şəhid edilməsidir. Bu işdə də insanları aldatmaq istəyirdilər. Sindi ibn Şahək son günlərdə Bağdaddan bir qrup məşhur şəxsiyyəti imamın yanına gətirdi, göstərdi ki, baxın, vəziyyəti normaldır, problemi yoxdur. İmam orada buyurdu ki, bunlar məni zəhərləmişlər. İmamı bir neçə xurma ilə zəhərlədilər. Boynunda, əlində və ayağında ağır zəncirlər olduğu halda böyük, məzlum .və əziz imamın ruhu zindanda ruhani aləmə qovuşdu, o, şəhid oldu

Yenə də qorxurdular. İmam Musa ibn Cəfərin (ə) cənazəsindən də, qəbrindən də qorxurdular. Musa ibn Cəfərin (ə) cənazəsini zindandan çıxaranda deyirdilər ki, bu, hakimiyyət əleyhinə qiyam etmiş adamdır. Onun şəxsiyyətini kölgədə qoymaq üçün bu sözləri deyirdilər. Bağdadın vəziyyəti rejim üçün o qədər etimadsız idi ki, Bəni-Abbas zadəganlarından və Harunun əmisi oğlu olan Süleyman ibn Cəfər ibn Mənsur Abbasi bu vəziyyətin onlar üçün problem

yarada biləcəyini görüb üzərinə başqa bir rol götürdü. O, Musa ibn Cəfərin (ə) cənazəsini qiymətli kəfənə bürüdü. Onu hörmətlə Bağdadın yaxınlığındakı Qüreyiş qəbiristanında, bu gün Kazimeyn kimi məşhur olan yerdə dəfn etdi. Musa ibn Cəfərin ((ə) cihad və mübarizə dolu həyatı bunununla sona çatdı. (۱۹۸۵

**(On beşinci fəsil: İmam Rza (ə**

**İşarə**

Musa ibn Cəfər (ə) Harunun zindanında illərlə qaldıqdan sonra zəhərlənib şəhid ediləndə geniş Abbasi məmləkətində güclü repressiya hökm sürürdü, Əli ibn Musanın (ə) bir səhabəsinin dediyi kimi, Harunun xəncərindən qan damırdı(۱). Belə bir şəraitdə bizim böyük və məsum imamımızın ən böyük hünəri Şiə ağacını hadisələr fırtınasından sağlam çıxarmaq və atasının səhabələrinin məyus olub dağınıq düşməsinə mane olmaq idi. O, heyrətamiz üsullarla və təqiyyə vasitəsi ilə Şiə qrupunun mərkəzi və ruhu olan özünü qorudu, ən qüdrətli Abbasi xəlifəsinin dövründə və tam sabitliyin bərqərar olduğu bir rejimdə güclü imamət mübarizəsini davam etdirdi. Tarix səkkizinci imamın Harunun dövründəki onillik həyatından və Harundan sonra Xorasan və Bağdad arasında daxili müharibələrin getdiyi beşillik dövrü bizə aydın təsvir etməmişdir. Amma diqqətlə araşdıranda bu dövrdə səkkinci imamın Aşuradan sonra daim davam edən uzunmüddətli Əhli-beyt mübarizəsini eyni istiqamət və məqsədlərlə davam etdirdiyini .anlamaq olar

ci ildə qardaşı Əminlə hakimiyyət mübarizəsini bitirəndən və xilafətə rəqibsiz-۱۹۸ şəkildə yiyələnəndən sonra Məmunun ilk tədbirlərindən biri Ələvi və Şiə problemini həll etmək idi. O özünün bütün sələflərinin uyğun problem qarşısındakı təcrübələrini bilirdi. Bu təcrübələr həmin hərəkatın gücünü, genişliyini, dərinliyini və hakim qüvvələrin onları məhv etməyə, hətta durdurmağa və məhdudlaşdırmağa aciz olduğunu göstərirdi. O görürdü ki, Harunun qüdrəti və əzəməti yeddinci imamı hətta uzun müddət həbsdə saxlamaqla və zəhərləməklə də Şiə qiyamlarının, siyasi, hərbi, ideoloji və təbliğat mübarizələrinin qarşısını ala bilməmişdi. O indi atası və digər sələfləri kimi qüdrətli olmadığını, bundan əlavə, Abbasilər arasında daxili vuruşmalar səbəbindən xilafəti



---

.Əl-Kafi, c. ۸, səh: ۲۵۷ [۱۶۹] -۱

böyük problemlərin təhdid etdiyini bildiyi üçün Ələvi hərəkatının təhlükəsinə daha ciddi .yanaşmalı idi

Məmun şiələrin öz hakimiyyətinə qarşı təhlükəsini bəlkə də real dəyərləndirirdi. Çox güman ki, yeddinci imamın şəhadətindən o zamana qədər ötən on beş il ərzində, xüsusən də daxili döyüşlərin getdiyi beş ildə Şiə hərəkatı Əli (ə) hakimiyyətini qurmaq .üçün daha böyük hazırlığa malik olmuşdu

Məmun ustalıqla bu təhlükəni təxmin edib tədbir görmək qərarına gəldi. O, səkkizinci imamı Mədinədən Xorasana çağırıb vəliəhdliyə məcbur etdi və bütün imamət .dövründə analoqu olmayan bu hadisə həyata keçdi

İndi vəliəhdlik məsələsini ixtisarla araşdırmağın vaxtıdır. Bu hadisədə səkkizinci İmam Əli ibn Musa Rza (ə) böyük tarixi bir sınaq qarşısında qaldı, Şiə məzhəbinin taleyini yazacaq gizli siyasi döyüşə getməli oldu. Bu döyüşdə təşəbbüsü ələ almış və bütün imkanlarla vuruşa gəlmiş rəqib Məmun idi. Məmun güclü zəkası, ağlı və misilsiz uzaqgörənliyi ilə elə bir işə qoşuldu ki, qalib gəlsəydi və işləri nəzərdə tutduğu kimi aparsaydı, heç şübhəsiz, Əli ibn Əbu Talibin (ə) şəhadətindən sonra heç bir Əməvi və Abbasi xəlifəsinin çatmadığı bir məqsədə nail olacaq, Şiə ağacını kökündən kəsib həmişə bir tikan kimi tağut xəlifələrin gözünə batan müxalif cinahı bütünlüklə məhv .edəcəkdi

Lakin səkkizinci imam ilahi tədbirlə Məmuna qalib gəldi, onu özünün yaratdığı siyasi döyüşdə tam məğlub etdi. Şiəlik nəinki zəifləmədi, yaxud kökündən kəsilmədi, hətta o həzrətin vəliəhd olduğu ۲۰۱-ci il Şiə tarixinin ən səmərəli illərindən biri oldu, Ələvi mübarizələrinə yeni nəfəs verdi. Bütün bunlar səkkizinci imamın ilahi tədbiri və bu .böyük sınaqda seçdiyi məqsədyönlü üsulu sayəsində əldə olundu

Bu böyük hadisəyə işıq salmaq üçün Məmunun və imamın siyasətini qısa şəkildə şərh .edəcəyik

**:Səkkizinci imamı Xorasana dəvət etməkdə Məmunun bir neçə əsas məqsədi vardı**

Birinci və ən mühüm məqsəd şiələrin qızğın inqilabi mübarizələrini sakit və təhlükəsiz siyasi fəaliyyətə çevirmək idi. Qeyd etdiyim kimi, şiələr təqiyyədən istifadə edərək yorulmaz və tükənməz mübarizə aparırdılar. İki xüsusiyyətə malik olan bu mübarizələrin xilafətin devrilməsində əvəzsiz rolu vardı. O iki xüsusiyyətin biri .məzlumluq, digəri isə müqəddəslik idi

Şiələr bu iki amilə əsaslanaraq Əhli-beyt imamlarının İslama dair izah və təfsirindən ibarət olan Şiə düşüncəsini insanların qəlbinə və beyninə salır, azca hazırlığı olan hər bir kəsi sözügedən düşüncə tərzinə yönəldir və ya inandırırdılar. Bununla İslam dünyasında Şiə məzhəbinin dairəsi günbəgün genişlənirdi. Şiə təfəkkürü kimi dayağı olan bu məzlumluq və müqəddəslik bütün dövrlərdə və müxtəlif yerlərdə xilafət .əleyhinə silahlı mübarizə və qiyamları koordinasiya edirdi

Məmun bu mübariz qrupdan məxfiliyi birdəfəyə almaq, imamı inqilabi mübarizədən siyasi mübarizəyə çəkmək, bununla da məxfilik səbəbindən günbəgün genişlənən Şiə hərəkatının təsirini sıfra endirmək istəyirdi. Məmun bununla Ələvilərdən həm də həmin iki təsirli xüsusiyyəti alacaqdı. Çünki rəhbərləri xilafət aparatının yüksək rəsmisi, dövrün padşahının, ölkə başçısının vəliəhdi olan bir qrup nə məzlum ola bilər, nə də çox da müqəddəs. Bu siyasət Şiə düşüncəsini cəmiyyətdə tərəfdarları olan digər etiqad və düşüncələrin sırasına qoya, rejimə müxalif olan, hakim qüvvələr tərəfindən sevilməyən, rəsmən qadağan edilən, xalq, xüsusən də zəif təbəqələr tərəfindən isə .çox sevilən və maraq doğuran bir təfəkkür şəklindən çıxara bilərdi

İkinci məqsəd budur ki, bu hərəkət şiələrin Əməvi və Abbasi xilafətlərinin qanunsuz olmasına dair iddiasını yalanlayır, onlara legitimlik qazandırırdı. Məmun bununla hiyləgərcəsinə bütün şiələrə sübut edirdi ki, daim Şiə məzhəbinin etiqad prinsiplərindən sayılan məsələ - xəlifələrin qəsbkar və qeyri-legitim olması iddiası zəiflik və həqarət komplekslərindən irəli gələn əsassız iddiadır. Çünki

digərlərinin xilafəti qanunsuz və haqsız olsaydı, onların canişini olan Məmunun xilafəti də belə olmalı idi. Halbuki Əli ibn Musa Rza (ə) bu rejimlə çalışdığına, Məmunun canişinliyini qəbul etdiyinə görə, onu qanuni və legitim bilmişdir. Belə çıxır ki, digər xəlifələrin hakimiyyəti də qanuni olmuşdur və bu, şiələrin bütün iddialarını rədd etmək deməkdir. Məmun bununla Əli ibn Musa Rzadan (ə) yalnız özünün və sələflərinin hakimiyyətinin legitimliyinə etiraf almırdı, hətta onların zalımlığına dair Şiə etiqadını da .darmadağın edirdi

Bunlardan əlavə, bu planla şiələrin imamların zahidliyinə, dünyaya etinasızlığına dair başqa bir iddiası da sarsılırdı. Belə görünürdü ki, onların əli dünyaya çatmayanda zahid olur, dünya qapıları üzlərinə açılanda isə ona doğru gedir və başqaları kimi ondan .bəhrələnirlər

Üçüncüsü budur ki, Məmun bu işlə daim mübarizənin əsas mərkəzi olan imamı və ondan əlavə bütün Ələvi böyüklərini, mübarizlərini nəzarətdə saxlayırdı. Bu onun Bəni-.Üməyyədən və Bəni-Abbasdan olan sələflərinin heç birinin nail olmadığı uğur idi

Dördüncüsü budur ki, xalqçı bir qüvvə, ümidlərin qibləsi, sual və şikayətlərin ünvanı olan imamı hökumət məmurlarının mühasirəsində saxlayır, get-gedə xalqçı rəngini .ondan alır, onunla xalq, xalqın sevgi və duyğuları arasında məsafə yaradırdı

Beşinci məqsəd bu işlə özünə mənəvi hörmət və imic qazanmaq idi. Təbii ki, öz qardaş və övladlarını vəliəhdlikdən məhrum edib bu vəzifəyə Peyğəmbər (s) övladını, müqəddəs və mənəvi bir şəxsiyyəti seçdiyinə görə o zaman hamı onu tərifləyəcəkdi. Həmişə belədir: dindarların dünyagirlərə yaxınlaşması dindarların hörmətini azaldır, .dünyagirlərin nüfuzunu isə artırır

Altıncısı budur ki, Məmuna görə, imam bu işlə xilafətin səhvlərini ört-basdır edən bir qüvvəyə çevriləcəkdi. Məlumdur ki, Peyğəmbər (s) övladı kimi hamının gözündə misilsiz səh:۲۴۷

hörmətə malik olan belə elmli və təqvalı bir şəxs hökumətdə baş verən hadisələri ört-basdır etmək rolunu üzərinə götürsəydi, heç bir müxalif nəğmə hökumətin imicinə xələl gətirə bilməz, bu uca hasar xilafətin bütün nöqsan və eybəcərliklərinin üstünü .örtə bilərdi

.Bunlardan əlavə, Məmunun başqa məqsədləri də ola bilərdi

Göründüyü kimi, bu siyasət o qədər mürəkkəb və dərin idi ki, Məmunun özündən başqa heç kim onu lazımınca icra edə bilməzdi. Elə bu səbəbdən Məmunun dost və yaxınları planın müxtəlif cəhətlərindən xəbərsiz idilər. Bəzi tarixi məlumatlardan başa düşülür ki, Məmunun vəziri, baş komandan və xilafətin ən yaxın adamı olan Fəzl ibn Səhl də bu siyasətin əsl mahiyyət və məzmunundan xəbərdar olmamışdır. Məmun bu mürəkkəb plana heç bir xələl gəlməməsindən ötrü onun üçün qondarma səbəblər .düzəldib ona-buna deyirdi

Etiraf etmək lazımdır ki, Məmunun siyasəti çox peşəkar və güclü idi. Lakin bu vuruşmanın digər tərəfi İmam Əli ibn Musa Rzadır (ə) və o, Məmunun şeytan zirəkliyinə baxmayaraq, onun bu siyasətini zərərsizləşdirir və uşaq oynuna çevirir. Məmun çəkdiyi böyük əziyyətlərə baxmayaraq, bu işdən nəinki xeyir götürmədi, hətta onun siyasəti öz əleyhinə çevrildi, İmam Rzanın (ə) etibarını, heysiyyətini və iddialarını hədəf seçən ox özünə dəydi. Belə ki, qısa müddətdən sonra özünün bütün uyğun siyasətlərini kənara qoyub imama qarşı bütün sələflərinin seçdiyi üsuldan, yəni qətldən istifadə etməyə məcbur oldu. Özünə müqəddəs, hörmətli və ağıllı bir xəlifə siması arzusu ilə bu qədər işlər görmüş Məmun nəhayət, özündən öncəki bütün xəlifələrin düşdüyü bataqlığa - yəni zülm və təkəbbürlə yanaşı fəsada, pozğunluğa, .eyş-işrətə yuvarlandı

## Vəliəhdlik məsələsi

Vəliəhdlik məsələsindən sonra Məmunun ۱۵ illik həyatında riya pərdəsinin yırtılmasını onlarla nümunədə görmək olar. Yəhya ibn Əksəm kimi fasiq və əyyaş bir insanı baş qazi təyin

etməsi, xanəndə əmisi İbrahim ibn Mehdi ilə oturub-durması və Bağdadda xilafət sarayında eyş-işrət məclisləri qurub özünü ifşa etməsi bu qəbildəndir.

İndi isə İmam Əli ibn Musa Rzanın (ə) bu hadisədə seçdiyi siyasi üsullara nəzər salaq:

1 - İmam Xorasana dəvət olunanda öz narazılığını bütün Mədinəyə yaydı. Belə ki, imamın ətrafında hər kəs Məmunun onu məkrli niyyətlə vətənindən uzaqlaşdırdığına əmin oldu. İmam Məmunun fikrinə şübhə ilə yanaşdığını mümkün vasitələrlə hamıya çatdırdı. Mədinədən çıxanda, Peyğəmbərin (s) qəbri və ailəsi ilə vidalaşanda, vida məqsədi ilə Kəbəni təvaf edəndə söz və əməlləri, dua və göz yaşları ilə hamıya bildirdi ki, bu onun son səfəridir. Məmunun özünə nikbin və təklifi qəbul etdiyinə görə imama bədgüman olmalarını gözlədiyi bütün şəxslərin qəlbi səfərin ilk anlarından əziz imamlarını zalımcasına onlardan ayırıb qətlgaha aparan Məmuna qarşı nifrətlə doldu.

2 - Mərvdə vəliəhdlik təklif olunanda imam bundan qətiyyətlə imtina etdi, Məmun açıq şəkildə ölümlə hədələməyincə qəbul etmədi. Bu xəbər hər yerə yayıldı ki, Əli ibn Musa Rza (ə) Məmunun israrlı xilafət və sonra vəliəhdlik təklifini qəbul etməmişdir. Məmunun bu siyasətinin mahiyyətindən xəbərdar olmayan saray məmurları naşıcasına imamın təklifdən boyun qaçırmasını hər yerə yayırdılar. Fəzl ibn Səhl hökumət məmurlarının toplantısında dedi ki, mən heç zaman xilafəti belə rəzil görməmişdim: Əmirəlmöminin onu Əli ibn Musaya (ə) təklif edir, o isə bundan boyun qaçırır.(1)

İmamın özü hər bir fürsətdən istifadə edib bu vəzifənin məcburən verildiyini hamıya çatdırırdı. Həmişə deyirdi ki, mən vəliəhdliyi qəbul etmək üçün ölümlə hədələndim. Təbii ki, bu söz ən maraqlı siyasi hadisə kimi ağız-ağız, şəhər-şəhər gəzdi, o zaman və sonralar bütün İslam məmləkəti bu məsələni anladı: Qardaşı Əminin vəliəhdliyindən çıxarıldığına



---

1- [170] Müfid. Əl-İrşad, c. 2, səh: 260.

görə bir neçə il müharibə aparan, bundan ötrü minlərlə insanı, o cümlədən qardaşı Əmini öldürən və qəzəbindən başını şəhər-şəhər gəzdirən Məmun kimi bir adamın qarşısında Əli ibn Musa Rza (ə) kimi bir şəxs peyda olur, vəliəhdliyə etinasız yanaşır, onu ölüm hədəsi qarşısında könülsüz qəbul edir. İmam Rza (ə) ilə Məmun Abbasi .arasında aparılan bu müqayisə Məmunun planladığı məqsədə zərbə vururdu

Bununla yanaşı, Əli ibn Musa Rza (ə) yalnız bu şərtlə vəliəhdliyi qəbul etdi ki, heç bir -٣ hökumət işinə qarışmasın, müharibə, sülh məsələləri və təyinatlarla işi olmasın. Hələlik bu şərtin məqbul olduğunu və sonralar tədricən imamı bu fəaəliyyətlərə də cəlb etməyin mümkünlüyünü düşünən Məmun onunla razılaşdı. Aydındır ki, bu şərtin həyata keçməsi ilə Məmunun planı pozulur, əksər məqsədləri təmin olunmurdu. İmam vəliəhd adını daşıdığı və təbii ki, xilafətin imkanlarından da bəhrələndiyi halda sanki xilafətə müxalif və etirazçı olan bir insan təsəvvürü bağışlayırdı; nə bir göstəriş verir, nə qadağa qoyur, nə vəzifə qəbul edir, nə hökuməti müdafiə edir, nə də təbii ki, sarayın işlərinə don geyindirirdi. Aydın məsələdir ki, düşünülmüş şəkildə bütün məsuliyyətlərdən kənara çəkilən bir saray üzvü ona tərəfdar sayılmaz. Məmun bunu yaxşı hiss edirdi, vəliəhdlik baş tutandan sonra vədinin əksinə olaraq imamı dəfələrlə müxtəlif yollarla xilafət işlərinə qoşmaq və onun neqativ mübarizə metodunu .sarsıtmaq istədi, imam isə hər dəfə onun planını ustalıqla pozurdu

Müəmmər ibn Xəllat səkkizinci imamın özündən nəql edir ki, bir dəfə Məmun ondan vəziyyətin qarışıq olduğu bölgələrdə öz tərəfdarlarına bir şey yazmasını istədi, o isə belə işlərə əsla müdaxilə etməyəcəyinə dair razılaşmanı xatırladıb bu işdən boyun qaçırdı. Çox əhəmiyyətli və maraqlı olan başqa bir nümunə bayram namazı məsələsidir. Məmun xalq səni tanısın və qəlbləri aram olsun deyib bu bəhanə ilə onu bayram namazında imam olmağa dəvət edir. İmam əvvəlcə imtina edir, Məmun son həddə israr edəndə sonra isə bu şərtlə

qəbul edir ki, namazı Peyğəmbərin (s) və Əli ibn Əbu Talibin (ə) qıldığı kimi qılsın. İmam bu fürsətdən elə yararlanır ki, Məmun peşman olub onu yarıyoldan qaytarır və bununla da özünün riyakar jestinə başqa bir zərbə vurmaq məcburiyyətində qalır.(۱)

۴- İmamın bu amildən istifadə etməsi olduqca əhəmiyyətlidir. İmam vəliəhdliyi qəbul etməklə imamların həyatında Əhli-beyt xilafətinin sona çatdığı ۴۰-cı hicri ilindən o zamana və xilafət dövrünün sonuna qədər misli görünməyən bir hərəkət edir. Bu, böyük İslam miqyasında Şiə imaməti iddiasını elan etmək, qalın təqiyyə pərdəsini kənara çəkmək və Şiənin mesajını bütün müsəlmanlara çatdırmaqdan ibarətdır. Xilafətin güclü tribunası imamın ixtiyarına keçdi və imam yüz əlli il ərzində yalnız gizlicə və təqiyyə şəraitində yaxın çevrəyə deyilmiş sözləri uca səslə söylədi, o dövrdə yalnız xəlifələrin və onların birinci dərəcəli yaxınlarının ixtiyarında olan imkanlardan istifadə edərək hamıya çatdırdı.

İmamın alimlərin toplantısında və Məmunun yanında ən güclü imamət dəlillərini söylədiyi diskussiyalar, Fəzl ibn Səhlə yazdığı və Şiə məzhəbinin bütün etiqad və fiqh başlıqlarını ehtiva edən Şəriət toplusu məktubu, Mərvdə Əbdüləziz ibn Müslimə söylədiyi məşhur imamət hədisi, vəliəhdlik münasibəti ilə o həzrəti mədh edən qəsidələr imamın bu böyük uğurunu göstərir. Bu qəsidələrin bəzisi Dibil və Əbu Nüvasa məxsus olub həmişə ən dəyərli ərəb qəsidələrindən sayılmışdır.

Həmin il Əli ibn Musa Rzanın (ə) vəliəhdlik xəbəri yayılanda Mədinədə və bəlkə də bir çox İslam bölgələrində xütbələrdə Əhli-beytin fəzilətlərindən danışmağa başladılar. Yetmiş il açıq şəkildə minbərlərdə lənətlənən, sonra da uzun illər fəzilətləri dilə gətirilməyən Peyğəmbər Əhli-beyti hər yerdə əzəmətlə və yaxşı sözlərlə yad olundu, dostları bundan ruhlandılar, xəbərsiz və laqeydlər tanış oldular, yaxınlaşdılar



---

۱- [۱۷۱] Yenə orada, səh: ۲۵۷-۲۵۸.

və qatı düşmənləri ruhdan düşdülər. Şiə hədisşünasları və mütəfəkkirləri o günə qədər .yalnız gizlicə söylədikləri təlimləri böyük dərslərdə və ümumi toplantılarda söylədilər

Məmun imamı xalqdan ayırmağa, onunla xalq arasındakı mənəvi və duyğusal – ۵ əlaqəni kəsməyə çalışır, imam isə hər fürsətdə xalqla ünsiyyət qururdu. Məmun bilərəkdən imamın Mədinədən Mərvədək yolunu elə seçmişdi ki, Kufə və Qum kimi məşhur əhlibeytsevər şəhərləri görməsin. İmam yolboyu xalqla təmasa girmək üçün hər bir fürsətdən istifadə etdi, Əhvazda imamət əlamətlərini göstərdi, Bəsrədə onu sevməyən insanların məhəbbətini qazandı, Nişapurda Qızıl silsiləsi hədisini həmişəlik yadigar qoydu və bundan başqa möcüzəvi əlamətlər də göstərdi. O, bu uzun səfərdə xalqı hidayət fürsətlərindən maksimum yararlandı. Mərvdə əsas mənzildə və xilafət .iqamətgahında olsa da, fürsət yarananda xilafət darvazalarını xalqın üzünə açırdı

Şiə başçıları nəinki imam tərəfindən sükuta və barışığa həvəsləndirilmədilər, hətta – ۶ faktlar göstərir ki, imamın yeni durumu onların ürəklənməsinə səbəb oldu, ömürlərinin çoxunu keçilməz dağlarda və ucqar kəndlərdə ağır şəraitdə keçirən qiyamçılar İmam Əli ibn Musa Rzanın (ə) dəstəyinə görə müxtəlif şəhərlərdə hətta hökumət məmurlarının hörməti ilə üzləşdilər. Heç zaman heç bir xəlifəyə, vəzirə və əmirə xoş üz göstərməyən, saraylarına getməyən, xilafət başçılarından heç kimin kəsərli dilindən qorunmadığı, bu səbəbdən də həmişə dövlət qurumları tərəfindən təqib olunan, uzun illər qaçaq həyatı yaşayıb şəhər və kəndləri dolaşan Dibil kimi radikal bir müxalif və şair öz imamının və rəhbərinin yanına gedib Ələvi hərəkatının Əməvi və Abbasi xilafəti əleyhinə ittihamnaməsi sayılan ən məşhur və ən gözəl qəsidəsini söylədi. Bu şeir qısa zamanda bütün İslam dünyasını dolaşdı; belə ki, imamın yanından qayıdanda onu .yoldakı oğruların başçısından eşitdi

**Məmunun təşəbbüsü**

İndi isə Məmunun təşəbbüsü ilə başlanmış və İmam Əli ibn Musanın (ə) qeyd etdiyimiz yollarla cəlb edildiyi gizli döyüş

səhnəsinin ümumi vəziyyətinə yenidən nəzər salaq. Vəliəhdliyin elan olunmasından bir :il sonra vəziyyət belədir

Məmun Əli ibn Musaya (ə) çox hörmət etmiş və həddi-hüdudu olmayan imkanlar vermişdir, amma hamı bilir ki, bu hörmətli vəliəhd heç bir dövlət işinə qarışmır və öz istəyi ilə xilafətə aid olan hər şeydən kənar gəzir. Və hamı bilir ki, o, vəliəhdliyi məhz bu .şərtlə qəbul etmişdir

Məmun istər vəliəhdlik fərmanının mətnində, istərsə də digər sözlərində fəzilətinə, təqvasına, hörmətli əsil-nəsəbinə və sonsuz elminə görə onu tərifləmişdir. İndi isə onun yalnız adını eşitmiş, yaxud onu çox da tanımayan və yaxud bəlkə də həmişə ona nifrət bəsləmiş insanların gözündə hörmət sahibi olmuşdur, onu yaşda, elmdə, təqvada və Peyğəmbərə (ə) qohumluqda xəlifədən üstün və layiqli bir insan bilirlər. Məmun onun vəliəhdliyi ilə nəinki özünün şiə müxaliflərini razı salmamış, onların kəsərli dil və qollarından qorunmamış, hətta Əli ibn Musa (ə) onların qorunmasına, arxayınlaşmasına və ruhlanmasına səbəb olmuşdur. Mədinədə, Məkkədə və digər mühüm bölgələrdə Əli ibn Musa (ə) nəinki dünyaya hərislikdə və vəzifəyə sevgidə ittiham olunmadı, hətta onun mənəvi ucalığına zahiri əzəmət də əlavə olundu, on illərdən sonra insanlar onun məzlum və məsum ata-babalarının mənəvi dəyər və məqamını tərifləməyə başladılar. Əsas odur ki, bu böyük qumarda Məmun nəinki bir şey əldə etmədi, hətta çox şeyini əldən verdi və çoxunu da itirmək təhlükəsi yarandı. Bu zaman Məmun məğlub olduğunu hiss etdi, öz kobud səhvini düzəltmək qərarına gəldi. O bütün zəhmətlərdən sonra nəhayət, xilafətin barışmaz düşmənləri olan Əhli-beyt imamlarına qarşı özünün zalım və azğın sələflərinin daim istifadə etdiyi üsuldan – .yəni qətldən istifadə etməyə ehtiyac duydu

Təbii ki, belə bir yüksək mövqe tutandan sonra səkkizinci imamın qətli asan olmayacaqdı. Dəlillər göstərir ki, Məmun bu qəti addımı asanlıqla icra etmək üçün öncə digər işlər gördü, onun adından yalan sözlər söylədi və bəzi şayiələr

yaydı. Birdən-birə Mərvdə Əli ibn Musanın (ə) bütün insanları öz qulları bilməsinə dair .şayiənin yayılması çox güman ki, məhz Məmuna bağlı qüvvələrin təxribatı idi

Əbu Səlt bu xəbəri imama söyləyəndə o buyurdu: Ey Rəbbim! Ey göyləri və yeri yaradan! Sən şahidsən ki, nə mən, nə də mənim ata-babalarımın heç biri heç zaman .belə bir söz deməmişik və bu onların tərəfindən bizə edilən zülmlərdən daha birisidir

İmama qalib gələcəyinə azca ümid bəslənən hər bir kəslə debatların təşkil edilməsi də belə tədbirlərdən sayılır. İmam müxtəlif din və məzhəblərin nümayəndələrini ümumi diskussiyada məğlub edəndən, güclü elminin və dəlillərinin şöhrəti hər yerə yayılandan sonra Məmun hər bir mütəkəllimi və güclü alimi imamla debata çıxarmaq qərarına gəldi. Və bildiyimiz kimi, debatlar nə qədər davam edirdisə, imamın elmi gücü daha da .aşkara çıxır və Məmun daha məyus olurdu

Rəvayətlərə görə, öz adamları və nökərləri vasitəsi ilə bir, yaxud iki dəfə imamın qətlinə plan cızdı. Bir dəfə də onu Sərəxsdə zindana saldı. Amma bu metodlar həmin adamları imamın mənəvi məqamına inandırmaqdan başqa bir iş görmədi, Məmun daha aciz qaldı və daha qəzəbləndi. Sonda ancaq öz əli ilə və heç bir vasitə olmadan imamı zəhərləməkdən başqa çıxış yolu görmədi. O bu işi gördü: hicrətin ۲۰۳-cü ilinin səfər ayında – yəni o həzrəti Mədinədən Xorasana gətirməsindən iki ilə yaxın, vəliəhd təyin etməsindən isə bir ildən bir qədər artıq vaxt ötəndən sonra öz əlini imamın .qətlindən ibarət olan böyük və unudulmaz cinayətə bulaşdırdı

Bu, Əhli-beyt imamlarının ۲۵۰ illik siyasi həyatının əsas hissələrindən biri idi. Ümidvarıq İslamın ilk əsrlərinin tarixini araşdıran tədqiqatçı və mütəfəkkirlər bu mövzuda daha (çox işləsinlər və araşdırma aparsınlar. (۱۹۸۴

## (On altıncı fəsil: İmam Cavad (ə), İmam Hadi (ə) və İmam Əsgəri (ə

### Uzunmüddətli məqsədlərə malik olan geniş təşkilati fəaliyyət

Digər məsum imamlar kimi İmam Cavad (ə) da bizə örnək və nümunədir. Allahın bu saleh bəndəsinin qısa həyatı küfr və azğınlığa qarşı cihadda keçdi. Yeniyetmə çağında İslam ümmətinin rəhbəri təyin olundu, qısa ömründə Allah düşmənləri ilə cihad etdi və hələ ٢٥ yaşlı gənc ikən ona dözə bilməyib zəhərlə şəhid etdilər. Bizim digər imamlarımızın hər birinin öz mübarizələri ilə şərəfli İslam tarixinə bir səhifə əlavə etdikləri kimi, bu böyük imam da İslamın hərtərəfli mübarizəsinin mühüm bir hissəsini əməlində göstərdi və bizə böyük dərs verdi. O böyük dərs budur ki, münafiq və riyakar qüvvələrlə mübarizə aparmaq üçün xalqın sayıqlığını təmin etməliyik. Düşmən açıq düşmənlik etsə və riyakarlıq etməsə, ona qarşı mübarizə aparmaq asan olar. Lakin Məmun Abbasi kimi müqəddəslik və islamçılıq donu geyinsə, xalqın onu tanıması çətinləşər. Bizim çağımızda və tarixin bütün çağlarında hakim qüvvələr xalqla üz-üzə mübarizədə aciz qaldıqda həmişə riyakarlıqdan istifadə etməyə çalışmışlar. İmam Əli ibn Musa Rza (ə) və İmam Cavad (ə) bu hiylə və riyakarlıq maskasını Məmunun (üzündən kənara çəkməyə çalışdılar və bunu bacardılar. (١٩٨٠

### İmam Hadi (ə) ilə dövrü

İmam Cavad (ə) müqavimətin timsalıdır. Bütün qısa həyatında Abbasi xəlifəsi Məmunun hiyləgər və riyakar hakimiyyətinə qarşı mübarizə apardı, heç zaman bir addım geri çəkilmədi, bütün çətin şərtlərə dözdü və bütün mümkün metodlarla fəaliyyət göstərdi. O, açıq və azad diskussiyanın əsasını qoyan şəxsdir. Məmun Abbasinin yanında alimlərlə və böyük şəxsiyyətlərlə ən dəqiq məsələlərdən danışdı, mübahisə etdi, öz üstünlüyünü və sözünün haqlılığını isbatladı. Azad diskussiya bizim İslam irsimizdir. Bu, hidayətçi imamların

dövründə mövcud olmuş, İmam Cavadın (ə) vasitəsi ilə də gözəl formada həyata .keçmişdir

İmam Hadi (ə) ilə dövrünün xəlifələri arasında gedən döyüşdə zahirdə və elə əslində də qalib gələn imam oldu. O həzrətin imamlığı dövründə altı xəlifə bir-bir hakimiyyətə gəlib cəhənnəmə vasil oldular. Onların sonuncusu olan Mötəz imamı şəhid etdi, özü də qısa müddətdən sonra öldü. Bu xəlifələr əksərən rəzalətlə öldülər; biri oğlunun əli ilə öldürüldü, biri qardaşı oğlunun əli ilə. Beləliklə Şiədən fərqli olaraq Bəni-Abbas tar-mar oldu. Həzrət Hadinin (ə) və Həzrət Əsgərinin (ə) dövründə də ciddi rejimə .baxmayaraq, şiəlik günü-gündən genişləndi və gücləndi

Həzrət Hadi (ə) ۴۲ illik ömrünün ۲۰ ilini Samirədə keçirdi; orada tarlası vardı, işləyir və yaşayırdı. Samirə şəhəri əslində bir qarnizon idi. Mötəsim Türküstandan, Səmərqənddən, Monqolustan və Şərqi Asiya bölgəsindən gətirdiyi özünə yaxın türk qullarını – onları öz türklərimizlə, Azərbaycan və digər bölgələrin türkləri ilə qarışdırmayın – saxlamaq üçün bu şəhəri salmışdı. Onlar təzə müsəlman olduqlarına görə imamları və möminləri tanımır, İslamdan baş açmır, xalqı incidir, Bağdad əhalisi ilə dalaşırdılar. İmam Hadinin (ə) dövründə mühüm sayda Şiə böyükləri Samirə şəhərinə toplaşdılar. İmam onlara rəhbərlik edir, onların vasitəsi ilə imamət mesajını bütün İslam dünyasına çatdırır, məktublar yazırdı. Həmin qrup Qumda, Xorasanda, Reydə, Mədinədə, Yəməndə, ucqar bölgələrdə və dünyanın hər bir yerində fəaliyyət göstərən Şiə şəbəkəsini genişləndirdi, bu məktəbə inananların sayını günbəgün artırdı. İmam Hadi (ə) bütün bu işləri həmin altı xəlifənin iti və qanlı xəncərinin kölgəsi altında gördü. Həzrət Hadinin (ə) vəfatına dair məşhur hədisdən anlaşılır ki, Samirədə çoxlu şiələr toplaşmışdılar və hakimiyyət onları tanımırdı; tanısaydı, hamısını məhv edərdi. .Onlar güclü şəbəkə qurduqlarına görə xilafət onları tapa bilmirdi

## İmamların mübarizəsinin bir günü illər qədər təsir bağışlayırdı

Onların mübarək həyatlarının bir günü cəmiyyətdə illərlə çalışan bir qrupun təsirini buraxırdı. Onlar dini belə qorudular. Başında Mütəvəkkilin, Mötəzimin və Məmunun durduğu, alimləri Yəhya ibn Əksəm kimi ən fasiq, ən günahkar saray alimlərindən ibarət olan bir din əsla qalmaz, həmin günlərdə məhv olar, bitərdi. İmamların bu mübarizə və fəaliyyəti yalnız Şiəni yox, hətta Quranı, İslamı və din təlimlərini qorudu. Allah övliyalarının, xalis və müxlis bəndələrin xüsusiyyəti budur. Əgər İslamın fədakar insanları olmasaydı, ۱۲۰۰-۱۳۰۰ ildən sonra belə təravətli qala və İslam oyanışı yarana bilməzdi, yavaş-yavaş məhv olardı. Peyğəmbərdən (s) sonra İslamın bu möhtəşəm təlimlərini bəşəriyyətin və tarixin beyninə hopduran insanlar olmasaydı, məhv olar, tükənər və heç bir şeyi qalmazdı. Adı qalsaydı da, təlimlərindən bir şey qalmazdı; indi əsas təlimlərindən təxminən heç bir şeyin qalmadığı məsihilik və yəhudilik kimi olardı. Quranın və Peyğəmbər (s) hədislərinin sağlam qalması, bütün bu hökm və təlimlərin yaşayıb min ildən sonra bəşəri təlimlərin zirvəsində durması təbii deyil, çoxlu zəhmətlə başa gələn qeyri-təbii bir haldır. Bunun yolunda döyülmək, həbs olunmaq və .öldürülmək də olub. Bunlar o böyük insanlar üçün mühüm deyildi

## Həzrət Hadinin (ə) uşaqlığı haqda bir hədis var

Həzrət Cavadın (ə) şəhadətindən iki il öncə, hicrətin ۲۱۸-ci ilində Mötəsim imamı Mədinədən Bağdada gətirəndə Həzrət Hadinin (ə) altı yaşı vardı. O, ailəsi ilə birgə Mədinədə qaldı. Həzrət Cavad (ə) Bağdada gətiriləndə Mötəsim onun ailəsi haqda sorğu-sual etdi. Onun böyük oğlu Əli ibn Məhəmmədin altı yaşı olduğunu eşidəndə dedi ki, bu təhlükəlidir, biz bu haqda bir şey fikirləşməliyik. Mötəsim yaxın adamlarından birini Bağdaddan Mədinəyə göndərdi, ona tapşırdı ki, Əhli-beyt düşməni olan bir nəfəri tapıb bu uşağı ona tapşırsın və o, müəllim kimi bunu öz ailəsinə düşmən və xilafətə dost kimi yetişdirsin. Həmin adam Bağdaddan Mədinəyə gəldi. Mədinə

alimləri arasında Əhli-beytə ən müxalif və ən düşmən insanlardan olan əl-Cüneydi adlı birisini tapdı; o zaman Mədinədə belə alimlər vardı. Ona dedi ki, mənə səni bu uşağın tərbiyəçisi etmək əmr olunub. Heç kəsin onunla get-gəl etməsinə qoyma, onu bizim istədiyimiz kimi tərbiyə et. Qeyd etdiyim kimi, o zaman həzrət Hadinin (ə) altı yaşı !?vardı, əmr də hakimiyyətin əmri idi; kim ona qarşı çıxa bilərdi

Bir müddətdən sonra xilafətə bağlı adamlardan biri əl-Cüneydini görüb uşaq haqda soruşdu. Əl-Cüneydi dedi ki, nə üşaq, mən ona ədəb-ərkandan bir söz deyəndə o mənə bu barədə bilmədiyim incəliklərdən danışır. Bunlar harada dərs oxuyublar? Bəzən otağa girmək istəyəndə ona deyirəm ki, bir Quran surəsi oxu, sonra gir, - görünür ona əziyyət vermək istəyirmiş - o soruşur ki, hansı surəni oxuyum. Mən deyirəm ki, böyük bir surə, məsələn, Ali-İmran surəsini oxu. O oxuyur, mürəkkəb yerlərini də mənə izah edir. Bunlar alim, Quran hafizi, Quranın təvil və təfsirinə vaqifdirlər. Bir müddətdən sonra isə həmin müəllim Əhli-beyti sevən şiələrdən oldu. .(Təbii ki, o, zahirdə uşaq, əslində isə Allah vəlisi idi: Biz uşaq ikən ona hikmət verdik(١)

Bunlar hər bir sahədə qalib gəldilər, onlar isə məğlub oldular. Bütün Bəni-Abbas xəlifələrinə müxalif olmuş, öz şeirləri ilə onları vurmuş və hər biri üçün tarixdə bir sənəd qoymuş Dibilin Mötəsim haqda bir neçə beyt şeiri var. Deyir biz kitablarda oxumuşduq ki, Bəni-Abbas yeddi xəlifədir, indi isə deyirlər səkkizdir. Səkkizincisi haradadır? Onlar Əshabi-Kəhf kimidirlər: səkkizincisi itləridir. Sonra deyir ki, sən hara, o it hara. O it Allaha heç bir günah etməmişdi, sən isə başdan-ayağa günah içindəsən. ((٢٠٠۴

İmamı nəzarət altında saxlamaq üçün Mədinədən Samirəyə gətirdilər, lakin gördülər ki, faydası yoxdur. Siz Mənaqib kitabında(٢) və digər əsərlərdə bu üç imam haqda yazılanlara



---

.Məryəm/١٢ [١٧٢]-١

.İbn Şəhr Aşub. Mənaqib Ali-Əbi Talib (ə), c. ۴, səh: ٣٣٧-۴۴٧ [١٧٣]-٢

baxsanız, görərsiniz ki, Şiə şəbəkəsi onların dövründə İmam Baqirin (ə) və İmam Sadiqin (ə) dövründən də güclü olmuşdur. Məhdud şəraitdə olsalar da, ucqar bölgələrdən onlara məktub yazır, pul göndərir və əmr alırdılar. Həzrət İmam Hadi (ə) Samirədə xalq tərəfindən sevilirdi, hamı ona hörmət edirdi. Onun və həmçinin İmam Əsgərinin (ə) vəfatı zamanı şəhər təlatümə gəldi. Hakim qüvvələr anladılar ki, burada bir sirr var, onu öyrənmək və ona çarə qılmaq lazımdır. Onlar müqəddəslik məsələsini anladılar. Mütəvəkkil imamı şərab məclisinə çağırdı ki, Əli ibn Məhəmmədin əyyaşlıq edilən bir şərab məclisinə qonaq olması xəbəri hər yerə yayılsın. Siz görün bu xəbər .necə təsir buraxardı

İmam məsələyə mübariz bir insan gözü ilə baxıb təxribata qarşı tədbir gördü. O, Mütəvəkkilin sarayına gedib onun şərab məclisini mənəviyyat məclisinə çevirdi. Haqqı söyləməklə və məzəmmətli şeirlər oxumaqla Mütəvəkkilin planını alt-üst etdi. İmam danışandan sonra Mütəvəkkil ayağa qalxıb onun üçün müşk-ənbər gətirdi, onu hörmətlə yola saldı. İmam ona dedi ki, sən elə bilirsən burada oturmusan və ölümün pəncəsi səni tuta bilməyəcək?! O beləliklə Mütəvəkkilin cəsədini yeyəcək qurdlara qədər bütün ölüm mərhələlərini bəyan etdi. İmam məclisi tamamilə alt-üst edib saraydan çıxdı. Hücumçunun qəddar və qüdrətli bir xəlifə, qarşı tərəfin isə müdafiəsiz bir gənc olduğu mübarizədə zahirən zəif tərəf psixoloji bir üsula - nizə və xəncərin işləmədiyi bir mübarizəyə əl atdı. Biz olsaydıq, bu işi görə bilməzdik. İmam mövqeyi dərk edib xəlifəni qəzəbləndirməyəcək şəkildə danışmağı bacarır. İmam misal üçün, ayağa qalxıb bütün şərab şüşələrini qıra bilərdi. Bu, yaxşı reaksiya olmaz, ondan yaxşı .nəticə verməzdi. İmam ayrı cür etdi. Məsələnin bu cəhəti çox əhəmiyyətlidir

### İmamların həyatında bu məqama diqqət yetirmək lazımdır

İmamların həyatında bu məqama diqqət yetirmək lazımdır ki, onlar daim mübairzə halında olmuşlar. Bu, siyasi mübarizə idi. Çünki hakimiyyət kürsüsündə oturmuş adam da dinə iddiaçı idi, o da zahirdə dini nəzərə alır, hətta bəzən imamın

fikrini qəbul edirdi. Məmun haqda eşitmisiniz ki, imamın bəzi məsələlərə dair fikrini açıq şəkildə qəbul edirdi. Yəni bundan çəkinmir, bəzən fiqhi nəzərini qəbul edirdilər. Əhli-beytə qarşı mübarizəyə səbəb olan amil onların özlərini imam bilmələri idi. Onlar deyirdilər ki, biz imamıq. Ümumiyyətlə, hakim qüvvələr əleyhinə ən böyük mübarizə bu idi. Çünki hakim olan, özünü imam və rəhbər adlandıran şəxs imama lazım olan xüsusiyyətlərin özündə deyil, Əhli-beytdə olduğunu görür, onları hakimiyyətə təhlükə sayırdılar. Həm də onların bu iddiaları vardı. Hakim qüvvələr bu mübarizə ruhuna qarşı vuruşur, imamlar da dağ kimi möhkəm dayanırdılar. Təbii ki, bu mübarizədə imamların təbliğ etdiyi din təlimlərinin, fiqh hökmlərinin və əxlaqi məsələlərin öz yeri vardı. Onlar daha çox şagird yetişdirdilər, Şiə əlaqələri günbəgün genişləndi və məzhəbi bunlar saxladı. Düşmənlərinin ۲۵۰ il hakimiyyətdə olduğu bir məzhəbdən əsla bir şey qalmamalı, tamamilə məhv olmalı idi, amma görün indi dünyada vəziyyət necədir və .Şiə nəyə nail olmuşdur

Bu məsələni İmam Sadiq (ə), İmam Hadi (ə) və İmam Əsgəri (ə) haqda oxunan şeirlərdə yaxşı görmək olar. Onlar mübarizə apardılar və bu yolda canlarını qurban verdilər. Bu, müəyyən məqsədlərə doğru davam edən bir yoldur; bəzən biri qayıdır, biri bu tərəfdən gedir – məqsəd isə birdir. Onlar bu işin təməlini qoyan İmam Hüseyndən (ə) daha müvəffəq oldular. Çünki İmam Hüseynin (ə) şəhadətindən sonra çox az adam bu xətdə qaldı, İmam Hadinin (ə) dövründə isə onların bütün İslam .dünyasında nüfuzları vardı, hətta Bəni-Abbas da buna aciz qalır, nə edəcəyini bilmirdi

Abbasi xəlifələrinin biri məmurlarına bir məktub yazıb xütbələrdə Əhli-beytin adının çəkilməsini və Əhli-beytin haqlı olduğunun söylənməsini əmr etdi. Bu məktub tarixdə qeyd olunmuşdur. Yazmışlar ki, sarayın vəziri özünü tez xəlifəyə çatdırıb dedi: Sən nə edirsən?! O, Əhli-beytin haqlı olmadığını deməyə cəsarət etmədi, dedi ki, indi bəzi qüvvələr Təbəristanın dağlarında və digər yerlərdə Əhli-beyt şüarı ilə

qiyam etmişlər. Sənin bu sözün hər yerə yayılsa, o zaman bir orduya çevrilib üstünə gələcəklər. Xəlifə onun doğru söylədiyini görüb fərmanı ləğv etdi. Onlar hakimiyyətlərinə görə qorxurdular. Buna inanırdılarsa da, hakimiyyət və dünya sevgisi (bu inamlarına mane olurdu. (۲۰۰۱

## Bizim məsumlarımız həqiqətən çox qərib olmuş

Bizim məsumlarımız həqiqətən çox qərib olmuş, Mədinədən, ailədən və doğma cəmiyyətdən uzaq qalmışlar. Amma bunun kənarında İmam Cavad (ə), İmam Hadi (ə) və İmam Əsgəri (ə) haqda başqa bir məsələ də var. O da budur ki, həzrət Əsgərinin (ə) imamlığının sonuna yaxınlaşdıqca, bu qəriblik daha da artmışdır. Bu üç imamın dövründə imamların və şiələrin nüfuz dairəsi İmam Sadiqin (ə) və İmam Baqirin (ə) dövrünə nisbətən bəlkə on dəfə artmışdı. Bu, mühüm məsələdir. Onların güclü nəzarət və təzyiq altında saxlanmasının səbəbi də bəlkə bu idi. İmam Rzanın (ə) İrana doğru hərəkətindən və Xorasana gəlişindən sonra baş verən dəyişikliklərin biri bu idi. Bəlkə də səkkizinci imam bu məsələni düşünmüşdü. Ondan öncə şiələr hər yerdə tək-tük, zəif əlaqəli, ümidsiz və məyus idilər, xəlifələr də hər yerə nəzarət edirdilər. Məmundan öncə firon kimi qüdrətli olan Harun iş başında idi. İmam Rza (ə) Xorasana gələndə və bu yoldan keçəndə xalqın qarşısına elə bir şəxsiyyət çıxdı ki, həm elmi, həm əzəməti, həm sədaqəti, həm də nuraniliyi ilə xalqın diqqətini cəlb etdi. İnsanlar əsla belə bir şəxs görməmişdilər. Ondan öncə nə qədər şiə Xorasandan Mədinəyə gedib İmam Sadiqi (ə) görə bilərdi?! Bu uzun yolboyu isə imamı yaxından gördülər. Qəribə mənzərə idi, sanki Peyğəmbəri (s) görürdülər. Onun mənəvi əzəməti, iqtidarı, əxlaqı, təqvası, nuraniliyi və dərin elmi... Nə soruşursansa, nə istəyirsənsə, hamısına cavab hazırdır. İnsanlar belə .bir şey görməmişdilər. Bu hamıda həyəcan yaratmışdı

## İmam Xorasana və Mərvə çatdı

Paytaxt indiki Türkmənistanda yerləşən Mərv şəhəri idi. Bir-iki ildən sonra da imamın şəhadəti baş verdi və xalq matəmə qərq oldu. Həm imamın xalqın görmədiyi və eşitmədiyi mənzərəni canlandıran

girişi, həm də böyük qəm-kədər doğuran şəhadəti bu bölgələrin hamısını şiələrin ixtiyarına keçirdi. Hamısı şiə olmadı, amma hamısı Əhli-beyti sevdi. Şiələr belə bir şəraitdə işləməyə başlamışdılar. Siz görürsünüz ki, Əşərilər birdən-birə Qumda peyda olurlar. Onlar nə üçün gəldilər? Əşərilər ərəbdirlər. Onlar Quma gəlib orada hədis və İslam təlimləri mərkəzi açdılar. Reydə də Kuleyni kimilər meydana çıxdı. Kuleyni kimi bir şəxs təsadüfi bir yerdə yetişmir. Mühit etiqadlı şiə olmalıdır ki, belə xüsusiyyətlərə malik olan bir gənc yetişib Kuleyni olsun. Bu hərəkət beləcə davam etdi. Siz baxın, Şeyx Səduq Hərata, Xorasana və digər yerlərə gedib Şiə üçün hədis toplamışdır. Bu çox əhəmiyyətli məsələdir. Şiə hədisçiləri Xorasanda, Səmərqənddə nə edirlər? Səmərqənddə kim var? Şeyx Əyyaşi Səmərqəndi. Əyyaşi Səmərqəndi Səmərqənd şəhərindəndir. Onun haqda belə deyiblər: Evi şiələrin və alimlərin toplaşdığı mərkəzə çevrilmişdi.(۱) Bu, Şeyx Kəşşinin sözüdür. Şeyx Kəşşinin özü də səmərqəndlidir. Buna əsasən, İmam Rzanın (ə) hərəkəti və sonra məzlumcasına şəhadəti səbəbindən bu yerlər imamların təsir dairəsinə qatıldı və onlar bu imkandan istifadə etməyə başladılar; məktublaşdılar, get-gəllər başladı. Bu get-gəllər adi formada deyil, məxfi şəkildə həyata keçirdi. Bunu açıq etsəydilər, insanların əl-ayaqlarını kəsərdilər. Kərbəlaya getməyi qadağan edən qəddar Mütəvəkkil insanların suallarının asanlıqla imama verilməsinə və sonra cavablarının aparılmasına, şəriət ödənclərinin gətirilməsinə və ondan qəbz alıb insanlara aparılmasına icazə verərdimi?! Bunlar bu üç imamın böyük təbliğat və təlimat şəbəkəsini göstərir.

İmam Rzadan (ə) həzrət Əsgərinin (ə) şəhadətinə qədər vəziyyət belə olmuşdur. Samirə şəhəri elə də böyük deyildi, yeni salınmış paytaxt idi. Saray adamları, əyan-əşraf və gündəlik ehtiyacları təmin edəcək qədər adi adamlar orada məskunlaşmışdılar. Həzrət Hadi (ə) və həzrət Əsgəri (ə)



---

۱- [۱۷۴] Nəccaşi. Rical, səh: ۳۷۲.

əslində bir qarnizon olan bu şəhərdə bütün İslam dünyası ilə belə rabitə sistemi qura bilmişdilər. Biz imamların həyatının müxtəlif cəhətlərinə baxanda onların nə etdiyini anlayırıq. Onlar yalnız namaz, oruc, pak və murdar məsələlərinə dair suallara cavab vermirdilər, dini mənada olan bir imam mövqeyində durub xalqla danışırdılar. Məncə, buna digər cəhətlərin kənarında baxmaq lazımdır. Siz görürsünüz ki, həzrət Hadini (ə) Mədinədən Samirəyə gətirib gənc çağında - ۴۲ yaşında şəhadətə yetirirlər. Yaxud İmam Həsən Əsgəri (ə) ۲۸ yaşında şəhid edilir. Bunların hamısı imamların, şiələrin və onların səhabələrinin bütün tarix boyu möhtəşəm hərəkətinin göstəricisidir. Xilafət qəddar totalitar rejim olsa da, eyni zamanda imamlar belə uğurlu fəaliyyət göstərirdilər. Yəni qürbətin kənarında bu qüdrəti və nailiyyəti də görmək lazımdır. ((۲۰۰۳

Bütün İslam dünyasında şiələrin bir-biri ilə əlaqəsi və Şiə təşkilatının əhatəsi heç zaman həzrət Cavadın (ə), həzrət Hadinin (ə) və həzrət Əsgərinin (ə) dövründəki kimi olmamışdır. Vəkillərin, naiblərin olması, həzrət Hadi (ə) və həzrət Əsgəridən (ə) nəql olunan əhvalatlar - məsələn, biri pul gətirdi və imam təyin etdi ki, onunla filan iş görülsün - bunu göstərir. Yəni bu iki imamın Samirədə, onlardan öncə də həzrət Cavadın (ə) bir şəkildə və həzrət Rzanın (ə) başqa bir şəkildə nəzarət altında olmasına baxmayaraq, insanların əlaqəsi genişlənmişdi. Bu əlaqələr İmam Rzadan (ə) öncə də (vardı, lakin onun Xorasana gəlişi buna olduqca böyük təkan verdi. (۲۰۰۵

Bizim imamlarımız əziz İslam Peyğəmbərinin (s) vəfatından həzrət Əsgərinin (ə) vəfatına qədər ötən ۲۵۰ il ərzində çox əziyyət çəkdilər, öldürüldülər, zülmə məruz qaldılar. Onlar üçün ağlamağa dəyər. Onların məzlumluğu ürəkləri qan edir. Lakin bu məzlumlar qalib gəldilər; həm dönəm səviyyəsində qələbə çaldılar, həm də (ümumilikdə və tarix boyu. (۲۰۰۴

## On yeddinci fəsil: ۲۵۰ yaşlı insanın hərəkətinin sonu

### Məhdəviyyət inancı

Məhdəviyyət inancı bütün müsəlmanlar tərəfindən qəbul olunur. Digər dinlərin etiqadlarında da son dövrdə gələcək bir xilaskar gözlənilir. Məsələnin bir hissəsində onlar da düzgün fikirdədirlər, əsas hissəsində, yəni xilaskarın kimliyinə dair isə səhv fikirdədirlər. Şiə özünün qəti dəlilləri ilə xilaskarı adla, əlamət, xüsusiyyət və doğum (tarixi ilə tanıyır. (۲۰۰۵

Şiə etiqadının xüsusiyyəti elədir ki, bu məsələ həmin məzhəbdə sırf zehnə aid bir məsələ və arzu deyil, realdır. Həqiqət budur ki, şiələr vəd edilmiş Mehdinin (ə) timsalında xilaskar insanı gözləyir və zehni məsələlərdə qalmırlar. Onlar mövcud və real bir həqiqəti axtarırlar. Allahın höccəti insanların arasındadır, mövcuddur, insanlarla yaşayır, insanları görür, onlarla bir yerdədir, onların dərdlərini hiss edir, ləyaqəti olan xoşbəxt insanlar da bəzən tanımadan onu ziyarət edirlər. O var; özünün, ata-anasının adları bəlli olan real bir varlıqdır, xalqın arasındadır və onlarla bir yerdə .yaşayır. Biz şiələrin etiqadı belədir

Digər məzhəblərdən olub bu etiqadı qəbul etməyənlər heç zaman bu düşüncənin və reallığın ziddinə məntiqli bir dəlil göstərə bilməyiblər. Bir çox sünnilərin də təsdiqlədiyi bütün aydın və güclü dəlillər qəti şəkildə bu uca insanın, Allah höccətinin, bizim bildiyimiz xüsusiyyətlərə malik olan bu parlaq həqiqətin varlığından xəbər verir. Siz bir .çox qeyri-şiə qaynaqlarında da bunu görə bilərsiniz

İmam Həsən Əsgərinin (ə) mübarək övladının doğum tarixi, onunla əlaqəsi olanların kimliyi və onun möcüzələri bəllidir. Allah ona uzun ömür vermişdir. Dünyanın bütün ümmətlərinin, bütün dinlərin, millətlərin və bütün dövrlərin böyük arzusunun təcəssümü odur. Bu mühüm məsələ haqda Şiə məzhəbinin xüsusiyyəti bundan (ibarətdir. (۲۰۰۸

### Məhdəviyyətlə bağlı bəzi məqamlar var

Mən qısa şəkildə onlara toxunmaq istəyirəm. Bir məsələ budur ki, İmam

Mehdinin (ə) müqəddəs vücudu ilahi peyğəmbərlərin və ilahi dəvətlərin tarixin əvvəlindən başlayan hərəkətinin davamıdır. Nüdbə duasında oxuyursunuz ki, bəzilərini cənnətindən sakit etmisən. Bu, həzrət Adəmdir (ə). Sonra deyirsiniz ki, hər bir dövrdə peyğəmbər göndərib axırda sona çatdırdın. Sonra isə o həzrətin canişinliyi və Əhli-beyti haqda danışıb dövrün imamına çatırsınız. Onların hamısı bəşər tarixində bir-birinə bitişik və bir-biri ilə əlaqədar olan bir zəncir halqalarıdır. Bu o deməkdir ki, peyğəmbərlərin fəaliyyəti və həyata keçirdikləri ilahi dəvət heç bir nöqtədə dayanmamışdır. Bəşərin peyğəmbərə, ilahi dəvətə və dəvətçilərə ehtiyacı həmişə olmuşdur, bu gün də var və zaman ötdükcə peyğəmbərlərin təlimlərinə daha da .yaxınlaşır

Bu gün elmin, düşüncənin və sivilizasiyanın inkişaf etdiyinə görə bəşəriyyət peyğəmbərlərin onlarla əsr bundan qabaq dərk edilməyən bir çox təlimlərini başa düşür. Ədalət, azadlıq, humanizm və bu gün dünyada geniş yayılmış digər ideallar peyğəmbərlərin sözləridir. O zaman adi camaat bunları dərk etmirdi. Peyğəmbərlərin bir-birinin ardınca gəlməsi, dəvətlərinin yayılması bu düşüncələri nəsil-nəsil insanların beyninə, fitrətinə və qəlbinə hopdurmuşdur. Bu ilahi dəvətçilərin ardı bu gün də kəsilməmişdir və Bəqiyyətullah – yəni Allahın saxladığı böyük ehtiyat olan İmam Mehdi (ə) ilahi dəvətçilərin davamıdır. Ali-Yasin ziyarətində oxuyursunuz: Salam olsun sənə, ey Allahın dəvətçisi! Yəni siz bu gün İbrahimin (ə), Musanın (ə), İsanın (ə), digər peyğəmbərlərin, ilahi islahatçıların və sonuncu Peyğəmbərin (s) dəvətinin İmam Mehdi (ə) tərəfindən davam etdirildiyini görürsünüz. Bu imam onların hamısının varisidir, onların hamısının dəvətini və bayrağını daşıyır və dünyanı peyğəmbərlərin zaman .boyu gətirib bəşəriyyətə təqdim etdiyi təlimlərə çağırır. Bu, mühüm məsələdir

**Məhdəviyyət məsələsində növbəti məqam qurtuluşun intizarı məsələsidir**

Qurtuluşun intizarı çox geniş məna kəsb edir. Biri son qurtuluşun intizarıdır; yəni bəşəriyyət dünya

tağutlarının at oynatdığını, soyğunçuluq etdiyini və sərbəst şəkildə insanların haqqını tapdadığını görəndə dünyanın taleyinin bundan ibarət olduğunu düşünməsin, çıxış yolunun olmadığını güman edib bu vəziyyətlə barışmasın. Xeyr! Bilməlidir ki, bu müvəqqətidir və dünyada ədalətli hakimiyyət qurulacaq. Bizim yaşadığımız, bəşəriyyətin zülm və əzablara məruz qaldığı bu son dövrdə qurtuluşun intizarı buna bir .nümunədir və onun başqa nümunələri də var

Bizə qurtuluşu gözləyin demişlərsə, mənası yalnız bu deyil ki, son qurtuluşu gözləyin. Mənası budur ki, hər bir sıxıntıdan çıxış yolu var. Qurtuluş budur. Müsəlman qurtuluşun intizarı dərsi ilə həyatda çıxışsız bir dalanın olmadığını, insanın məyus halda əlini-əlinin üzərinə qoyub oturmalı olmadığını öyrənir. Xeyr! Bəşər həyatının sonunda bütün bu zülmlərə qarşı qurtuluş günəşi doğacaqsa, deməli, bu qurtuluş həyatın cari problemlərində də gözləniləndir. Bu bütün insanlara ümid dərsi verir. Bu, bütün .insanlara həqiqi intizar dərsidir

Məhz buna görə qurtuluşun intizarını ən fəzilətli əməl saymışlar. Bəlli olur ki, intizar bir əməldir, əməlsizlik deyil. Səhvən belə düşünmək olmaz ki, intizar əlini-əlinin üzərinə qoyub gözləmək deməkdir. İntizar bir əməldir, hazırlıqdır, qəlbdə və daxildə həvəsi gücləndirmək, bütün sahələrdə bir fəallıq, həvəskarlıq və dinamiklikdir. Bu əslində Quranın aşağıdakı ayələrinin təfsiridir: Bis istəyirdik ki, yerdə zəif düşüb əzilənlərə mərhəmət göstərək, onları öndə gedənlər və varislər edək;(۱) yaxud Yer üzü Allahındır. Bəndələrindən istədiyini onun varisi edər. Aqibət (dünyada zəfər, axirətdə yüksək məqamlar) təqvalılara məxsusdur!(۲) Yəni xalqlar və ümmətlər heç zaman .qurtuluşa məyus olmamalıdırlar

**İran xalqı qiyam edəndə buna ümidi vardı**

.O ümidin həyata keçdiyi bugünkü gündə ondan həmin böyük nəticəni almışdır



---

.Qəsəs/۵ [۱۷۵] -۱

.Əraf/۱۲۸ [۱۷۶] -۲

Bu gün də gələcəyə ümidi var, ümid və həvəslə hərəkət edir. Bu ümid işığı gəncləri həvəskarlığa, hərəkətə, fəallığa sövq edir, passivliyin və depressiyanın qarşısını alır, .cəmiyyətdə dinamik ruh oyadır. Qurtuluş intizarının nəticəsi budur

Deyilənlərə əsasən, həm son qurtuluşu gözləmək lazımdır, həm də fərdi və ictimai həyatın bütün problemlərindəki qurtuluşu. Məyusluğun qəlbinizə hakim olmasına imkan verməyin, qurtuluşu gözləyin, intizarınızın həqiqi intizar olduğu, əməl, səy, iradə (və hərəkət etdiyiniz təqdirdə bu qurtuluşun mütləq baş verəcəyini bilin. (۲۰۰۵

Biz bu gün qurtuluş gözləyirik; gözləyirik ki, ədaləti bərqərar edəcək qüdrətli əl gəlib təxminən bütün bəşəriyyəti özünə tabe etmiş zülmə son qoysun, vəziyyəti dəyişdirsin, insanların həyatına ədalət gətirsin və insanlar onu duysunlar. Bu, yalnız özünü düşünməyən canlı və ayıq bir insanın daimi ehtiyacıdır. Bütün bəşər həyatına geniş baxışla baxan bir insan təbii şəkildə gözləyir. İntizarın mənası budur. İntizar qane olmamaq, mövcud durumu qəbul etməmək və ideal durum üçün çalışmaqdır. Qətidir ki, bu ideal durum Allah vəlisi olan həzrət Höccət ibn Həsən İmam Mehdi .Sahibəzzamanın (ə) qüdrətli əli ilə həyata keçəcək

Özümüzü bir əsgər kimi, belə bir şərait uğrunda mübarizəyə hazır bir insan kimi hazırlamalıyıq. Qurtuluş intizarının mənası bu deyil ki, insan yerində otursun, əlini heç bir işə vurmasın, heç bir islahata çalışmasın və dövrün imamını gözləməsi ilə işini bitmiş saysın. Bu intizar deyil. Bəs intizar nədir? İntizar qüdrətli, məğlubedilməz ilahi əldir. O gəlib bütün insanların köməyi ilə zülmün hakimiyyətinə son qoymalı, haqqı qalib, ədaləti hakim etməli, tövhid bayrağını ucaltmalı, insanları həqiqətən Allah bəndəsi etməlidir. Buna hazır olmaq lazımdır. İslam Respublikası quruluşunun yaranması bu böyük tarixi hərəkətə hazırlıqdır. Ədalətin bərqərar edilməsi uğrunda atılan hər bir addım uca məqsədə doğru bir addımdır. İntizarın mənası budur. İntizar hərəkətdir, passivlik deyil, işdən əl çəkib onun öz-özünə görülməsini

gözləmək deyil. İntizar hərəkət və hazırlıqdır. Özümüzdə və ətrafımızda bu hazırlığı qorumalıyıq. Allah-Taala bizim əziz xalqımıza bu böyük addımı atıb zühura şərait (yaratmaq səadətini bəxş edib. Qurtuluş intizarının mənası budur. (۲۰۰۸

Mehdi (ə) cəmiyyəti, yəni Dövrün İmamının quracağı dünya bütün peyğəmbərlərin gəlişinə səbəbolan cəmiyyətdir. Bütün peyğəmbərlər nəhayət Dövrün İmamının və vəd edilmiş Mehdinin (ə) vasitəsi ilə reallaşacaq ideal cəmiyyətin yaranmasına hazırlıq görmüşlər. Sanki bir nəfər hündür bir binanın tikiləcək yerini hamarlayır, biri həmin yeri qazır, biri betonlayır, fundamentini qurur, başqa birisi divarlarını hörür - müxtəlif ustalar bu hündür binanı bir-bir tədricən ərsəyə gətirirlər. Allahın peyğəmbərləri bəşər tarixinin əvvəlindən bir-bir gəlib cəmiyyəti və bəşəriyyəti addım-addım ideal cəmiyyətə və son məqsədə yaxınlaşdırmışlar. Peyğəmbərlərin hamısı müvəffəq olmuşlar. Onların hətta biri də bu yolda uğursuz olmamış, hər biri üzərinə düşən yükü mənzil başına yaxınlaşdırmış və bacardıqları qədər çalışmışlar. Onların birinin ömrü bitəndə o birisi yükü götürüb hədəfə daha bir addım və daha bir mənzil yaxınlaşdırmışdır. Bütün ilahi peyğəmbərlərin varisi olan İmam Mehdi (ə) sözügedən .ilahi cəmiyyətin qurulmasında son addımı atacaq

Mən həmin cəmiyyətin xüsusiyyətlərinə dair bir qədər danışmaq istəyirəm. Siz İslam ədəbiyyatını və əsas kitabları araşdırsanız, o cəmiyyətin bütün xüsusiyyətlərini görə bilərsiniz. Yəqin ki, hər cümə günü oxuduğunuz Nüdbə duasında həmin cəmiyyətin xüsusiyyətləri qeyd olunmuşdur. Məsələn, bir yerdə deyir: Haradadır dostları ucaldan və düşmənləri xar edən? Bundan belə çıxır ki, həmin cəmiyyətdə Allah dostları başıuca, düşmənləri isə xar olacaqlar. Yəni orada dəyər və meyarlar belədir. Yenə həmin duadan başa düşürük ki, bu cəmiyyətdə ilahi qanunlar tətbiq olunacaq. İmam Mehdinin (ə) cəmiyyətində Allahın və İslamın müəyyən etdiyi bütün qanun-qaydalara əməl olunacaq. Dövrün imamı zühur edəndə bir neçə ümumi

xüsusiyyətə malik bir cəmiyyət quracaq. Mən həmin xüsusiyyətləri söyləyəcəyəm. Siz əziz qardaş və bacılar da Quran ayələri və məsumlardan nəql olunan duaları oxuyarkən bu məsələni diqqətdə saxlayın, zehninizi daha çox açın. Nüdbə duasını .yalnız oxumaq kifayət deyil, onu anlamaq və ondan dərs götürmək lazımdır

**:Dövrün imamı cəmiyyəti bu bir neçə təməl üzərində quracaq**

Birinci məsələ zülmü məhv etmək, onun kökünü kəsməkdir. İmam Mehdinin (ə) qurduğu cəmiyyətdə zülm olmamalıdır. Bu o deməkdir ki, yalnız hansısa ölkədə, yaxud müsəlmanlar yaşayan yerlərdə deyil, dünyanın heç bir yerində zülm olmayacaq. Həmin cəmiyyətdə nə iqtisadi, nə siyasi, nə mədəni, nə də başqa bir haqsızlığa yol verilməyəcək. Dünyada istismarçılıq, təbəqələrarası fərqlər, ayrıseçkilik, hegemonluq .və quldurluq sona çatmalıdır. Birinci xüsusiyyət budur

Dövrün imamının ideal cəmiyyətinin ikinci xüsusiyyəti təfəkkür səviyyəsinin yüksəlməsidir - həm elmi təfəkkürün, həm də İslam təfəkkürünün. Yəni siz İmam Mehdinin (ə) dövründə dünyada cəhalətdən, savadsızlıqdan, mədəni və düşüncə yoxsulluğundan əsər-əlamət tapmamalısınız. Orada xalq dini düzgün tanımalıdır. Hamınızın bildiyi kimi, bu, peyğəmbərlərin böyük məqsədlərindən biri olmuşdur. İmam Əli (ə) bunu Nəhcül-bəlağənin bir xütbəsində bəyan etmişdir: İnsanların ağıl xəzinələrini aşkara çıxarmaq üçün....(۱) Bizim hədislərimizdə göstərilir ki, dövrün imamı zühur edəndə bir qadın evdə oturub Quranı açacaq və din həqiqətlərini ondan anlayacaq. Bu nə deməkdir? Yəni islami və dini təfəkkür səviyyəsi o qədər yüksələcək ki, bütün insanlar və misal üçün, ictimai işlərdə çalışmayan evdar qadınlar da fəqih və dinşünas ola biləcək, Quranı açıb özləri din həqiqətlərini anlayacaqlar. Siz görün hamının - müxtəlif səviyyəli kişi və qadınların dini dərk etdiyi və ilahi kitabdan nəticə çıxardığı bir cəmiyyət nə



---

.Nəhcül-bəlağə, xütbə: ۱ [۱۷۷] -۱

qədər işıqlı olar və bu cəmiyyətdə heç bir qaranlıq nöqtə qalmaz. Həmin cəmiyyətdə .bu gün mövcud olan fikir ayrılıqları mənasız olar

Mehdi (ə) cəmiyyətinin üçüncü xüsusiyyəti budur ki, o zaman təbiətin və insanın bütün imkanları kəşf ediləcək, yerin altında insanın istifadə etmədiyi bir şey qalmayacaq. Bütün istifadəsiz təbii enerjilər, insanın qidalana biləcəyi bütün torpaqlar, kəşf olunmamış qüvvələr aşkarlanacaq; əsrlərlə təbiətdə olmuş atom və elektrik enerjiləri kimi. Dünyanın ömründən əsrlər ötürdü, bu enerjilər təbiətdə qalmışdı, insan onları tanımırdı, sonra isə tədricən kəşf olundu. İmam Mehdinin (ə) dövründə təbiətin belə .saysız-hesabsız imkanlarından istifadə ediləcək

**İmam Mehdinin (ə) dövründə fəzilət və əxlaq meyar seçiləcək**

Başqa bir xüsusiyyət budur ki, İmam Mehdinin (ə) dövründə fəzilət və əxlaq meyar seçiləcək. Kimin daha üstün əxlaqı, dəyəri olsa, daha öndə olacaq. (١٩٨٠) Başqa bir rəvayətdə buyurulur ki, zalımlar bizim qiyamçımızdan qorxacaqlar. Biz bu gün öz cəmiyyətimizdə bunun kiçik bir nümunəsini görürük. Bu gün bizim İslam hökumətindən bir damla olan hökumətimiz, cəmiyyətimiz və İslam quruluşumuz həmin ilahi əzəmət və iqtidar okeanından bir damladır. Hökumətimiz dünya zalımlarının qəlbinə elə qorxu salıb ki, bu qorxunun özü bizim qələbəmizə yardım edir. Bu gün dünya hegemonları İslam Respublikasından, bizim inqilabımızdan, xalqımızdan və quruluşumuzdan qorxurlar. Onlar qorxduqlarına görə öz zalım hakimiyyətlərinə problem yaradan bu amili ortadan götürməyə çalışırlar. Gördüyünüz kimi, onların uyğun fəaliyyətlərinə baxmayaraq, dünya siyasəti daha çox İslam və müsəlmanların qələbəsi ilə nəticələnir. İmam Mehdinin (ə) dövründə bu hal elə geniş və ümumi olacaq ki, həmin qlobal hökuməti yarada biləcək. Allah ona yardım edəcək, yer onun ,qarşısında yumağa dönəcək, onun ixtiyarına və hakimiyyəti altına keçəcək

xəzinələr ona aşkarlanacaq, onun hakimiyyəti dünyanın şərqinə və qərbinə doğru genişlənəcək.(۱)

Həmin rəvayətdə bir neçə cümlədən sonra buyurur: Yer üzündə hər bir xarabalıq abadlaşacaq(۲). Yəni bu imkanlar dünyanın abadlaşdırılmasına sərf olunacaq, insanların maraqlarını tapdamağa və onları istismar etməyə yox. Bütün dünya miqyasında hər bir xarabalıq abadlaşacaq; istər insanın əli ilə xarabalığa çevrilmiş yerlər, istərsə də bəşərin cəhaləti səbəbindən mövcud olan xarabalıqlar. İmam Baqir (ə) başqa bir rəvayətdə buyurur: Qiyamçı qiyam edəndə ehtiyaclı şəxs əlini qardaşının cibinə salıb istədiyi qədər götürər və o buna mane olmaz.(۳) Bu, insanların bərabərlik istəyən xarakterinə və fədakarlığına işarədir. İnsanların qəlbini onların fəlakətinin ən böyük amili olan xəsislik və tamahkarlıqdan xilas etmək belə bir vəziyyəti müjdələyir. Bir qardaş əlini digər qardaşın cibinə salıb ehtiyacı olan qədər götürür və o buna mane olmur. Bu əslində ozamankı sağlam islami, əxlaqi, iqtisadi və ictimai sistemi göstərir; yəni məcburiyyət olmadan insanların özləri xəsislikdən və tamahkarlıqdan qurtulub belə bir cənnət yaradırlar. Başqa bir rəvayətdə belə deyilir: Bizim qiyamçımız qiyam edəndə xəracla torpaq verməyə son qoyulacaq(۴). Dünyanın hegemon hakimlərinin həmişə öz yaxınlarına verdikləri bəxşişlərə, xalqların cibindən ona-buna verilən ənamlara son qoyulacaq. Xərac keçmişdə bir formada idi, bu gün isə başqa bir formadadır. Keçmişdə belə idi ki, bir xəlifə, bir şah bir qədər torpağı, bir səhranı, kəndi, şəhəri, bəzən də vilayəti bir nəfərə bağışlayıb deyirdi ki, get orada nə istəyirsən et; xalqdan vergi yığ, tarlalardan istifadə et, nə qazansan götür və filan qədər də şaha ver. Bu gün neft, ticarət, sənaye, texnologiya, iri sənayelər və xalqları bədbəxt edən müxtəlif inhisarların hamısı əslində xərac sayılır. Bu gün



---

۱- [۱۷۸] Kamal əd-din və tamam ən-nemət, c. ۱, səh: ۳۳۱.

۲- [۱۷۹] Yenə orada.

۳- [۱۸۰] Vəsail əş-Şiə, c. ۵, səh: ۱۲۱.

۴- [۱۸۱] Bürucerdi. Came əhadis əş-Şiə, c. ۲۳, səh: ۱۰۱۲.

inhisarlar da bu hökmə şamil olur, çünki bu da hökumətlərlə sövdələşmək, rüşvət vermək və rüşvət almaq sayəsində meydana çıxır. O zaman belə antiinsani və .antidəyər hallara son qoyulacaq və hamıya çalışmaq imkanı veriləcək

Başqa bir rəvayət də iqtisadi vəziyyətə aiddir: İnsanlar arasında bərabərlik elə bir həddə çatacaq ki, zəkat vermək üçün yoxsul tapılmayacaq.(۱) Maliyyə və iqtisadi işlərdə elə bərabərlik bərqərar ediləcək ki, mallarınızın zəkatını verməyə yoxsul adam tapmayacaqsınız. O zaman dünyada yoxsul olmadığına görə təbii ki, zəkat da ümumi işlərə sərf olunacaq. Bir İslam cəmiyyətini və həqiqi bir dünyanı təsvir edən belə rəvayətlər çoxdur. Bu, bəzilərinin düşündüyü ideal cəmiyyətlər kimi utopiya deyil. Xeyr! Bunlar praktikada mümkün olan İslam qaydalarıdır. Biz İslam Respublikasında hiss edirik ki, həqiqətən bir qüdrətli əl, ilahi vəhyə bağlı bir qəlb, düşüncə və məsum insan (şübhəsiz, dünyada belə bir vəziyyət yarada və bəşəriyyət də onu sevə bilər. (۱۹۸۷

Ayə və hədisləri araşdırsanız, belə xüsusiyyətlərdən daha çox taparsınız. Siz zülm və ədavətdən əsər-əlamət olmayan, insanların dini və elmi düşüncəsinin yüksək səviyyədə olduğu, dünyanın bütün bərəkət, nemət, yaxşılıq və gözəlliklərinin aşkara çıxdığı, insanların ixtiyarına keçdiyi və nəhayət, təqvanın, dəyərin, fədakarlığın, qardaşlığın, mehribanlığın, bərabərliyin əsas və meyar seçildiyi bir cəmiyyəti təsəvvür edin. Bu, vəd edilmiş Mehdinin (ə), dövrümüzün imamının və qədimdən gözlədiyimiz tarixi dostumuzun - o indi də bu göyün altında, bu yerdə yaşayır və insanların .arasındadır - quracağı cəmiyyətdir. Bizim dövrün imamına dair etiqadımız belədir

Biz İran xalqı bir inqilab etmişik. Bizim inqilabımız dövrün imamının zühur edəcəyi məqsəd yolunda zəruri bir hazırlıq və böyük addımdır. Biz bu böyük addımı ,atmasaydıq, şübhəsiz, dövrün imamının zühuru gecikərdi. Siz İran xalqı



---

.Bihar əl-ənvar, c. ۵۲, səh: ۳۹۰ [۱۸۲] -۱

şəhid vermiş analar, matəmə qərq olmuş atalar və bu mübarizə boyu zəhmət çəkmiş şəxslər! Bilin ki, siz bəşəriyyətin tarixi mənzilə doğru hərəkətinin inkişafına və dövrün imamının zühurunun sürətlənməsinə səbəb olmusunuz. Siz bu yükü bir addım mənzilə yaxınlaşdırdınız, bu inqilabla dünyanın bu hissəsində mənfur zülm rejimindən, çox təhlükəli və ziyanverici xərçəngdən ibarət olan maneəni ortadan götürüb məhv .etdiniz

Bəs bundan sonra nə etməliyik? Bundan sonra bizim vəzifəmiz bəllidir. Əvvəla bilməliyik ki, bu inqilabımızla bir addım yaxınlaşan zühur inqilabın yaşadığı sürəcdə daha da yaxınlaşa bilər. Yəni inqilab edib özünü dövrünün imamına bir addım yaxınlaşdıran bu xalq daha bir addım, daha bir addım və sonra daha bir addım da yaxınlaşdıra bilər. Necə? Əvvəla İranda olan bu miqdar İslamın – biz bunu şişirtmirik; bu təbii ki, kamil İslam deyil, amma bu xalq İslamın bir hissəsini İranda həyata keçirə bilmişdir – dairəsini bacardığınız qədər dünyanın digər yerlərinə, digər ölkələrə, qaranlıq və zülmət nöqtələrə genişləndirsəniz, əmr sahibinin və dövrün höccətinin zühuruna həmin həddə kömək etmiş, yaxınlaşmış olarsınız. İkincisi, dövrün imamına yaxınlaşmaq nə fiziki yaxınlaşmadır, nə də zamana yaxınlaşma. Dövrün imamının zühuruna yaxınlaşmaq istəyən bilsin ki, onun zühurunun müəyyən bir vaxtı yoxdur. Yəni zühur ۵۰ ildən sonraya təyin edilməyib ki, biz bu müddətin ۳-۴ ilini keçirdiyimizi və ۴۶-۴۷ ilinin qaldığını düşünək. Xeyr! Bu yaxınlaşma məkan baxımından da deyil. Biz deyə bilmərik ki, buradan məsələn, dünyanın şərqinə, qərbinə, şimalına, yaxud cənubuna sarı hərəkət edib dövrün imamını axtarır və ona çatmaq istəyirik. Xeyr! Bizim dövrün imamına yaxınlaşmağımız mənəvi yaxınlaşmadır. Yəni siz hər hansı zamanda – ۵, ۱۰, ۱۰۰ ilə qədər İslam cəmiyyətinin keyfiyyət və kəmiyyətini artıra bilsəniz, dövrün imamı zühur edər. Əgər inqilabi cəmiyyətiniz daxilində, özünüzdə və digərlərində təqvanı, fəziləti, əxlaqı, dindarlığı, zahidliyi və Allaha mənəvi səh:۲۷۳

yaxınlığı təmin edə bilsəniz, dövrün imamının zühurunun təməlini möhkəmlətmiş olarsınız; mömin və ixlaslı müsəlmanların sayını nə qədər artıra bilsəniz, yenə də dövrün imamına və onun zühur zamanına yaxınlaşmış olarsınız. Deməli, biz öz cəmiyyətimizi, zamanımızı və tariximizi addım-addım dövrün imamının zühuruna .yaxınlaşdıra bilərik. Bu bir məsələ

İkinci məsələ budur ki, bu gün bizim inqilabımızda hərəkət və üsullarımız var. Bu çox önəmli məsələdir. Bir adam riyaziyyat müəllimi olmaq istəyirsə, riyaziyyat ixtisası üzrə təhsil almalıdır. Riyaziyyatçı olmaq istəyən adama fiqh dərsi keçməyin mənası yoxdur; yaxud müctəhid olmaq istəyənə təbiətşünaslıq dərsləri keçməyimiz düzgün deyil. Müqəddimə və hazırlıq işləri nəticəyə uyğun olmalıdır. Nəticə və hədəf qeyd etdiyim xüsusiyyətlərə malik olan ideal Mehdi (ə) cəmiyyətidir. Buna görə də, biz buna uyğun hazırlıq işləri görməliyik. Biz zülmlə barışmamalı, hansı növdən və kimin tərəfindən olsa belə, zülm əleyhinə qətiyyətli mövqe seçməliyik. Biz İslam qanunlarının bərqərar edilməsini məqsəd seçməli, cəmiyyətimizdə qeyri-islami və anti-islam düşüncəsinin yayılmasına imkan verməməliyik. Təbii ki, məqsədimiz zorla deyil, düşüncə və elmlə imkan verməməkdir. Başqa yolla mübarizə aparmaq olmaz. Hətta düzgün və məntiqli .yollarla İslam düşüncəsini genişləndirmək lazımdır

Bizim bütün qanunlarımız, dövlət idarələrinin və icraçı qurumların əsasnamələri forma və məzmun baxımından İslama uyğun olmalı və günbəgün yaxınlaşmalıdır. Bu, dövrün imamının intizarının bizə və bizim hərəkətimizə verdiyi istiqamətdir. Nüdbə duasında oxuyursunuz ki, dövrün imamı fasiqliyə, azğınlığa və nifaqa qarşı mübarizə aparacaq, onların və təfriqənin kökünü kəsəcək. Deməli, biz də bu gün öz cəmiyyətimizdə bu istiqamətdə hərəkət etməliyik. Bizi mənəvi baxımdan dövrün imamına və cəmiyyətimizi onun

cəmiyyətinə - Mehdi (ə), Əli (ə) və tövhid cəmiyyətinə daha da yaxınlaşdıracaq amil (budur. (۱۹۸۰

Bu dünyanın təsvirinin başqa bir təsiri və nəticəsi xalqların qəlbindən məyusluğu və ümidsiliyi çıxarmasıdır. Bilirik ki, bizim mübarizəmiz təsirli və nəticəlidir. Bəzən İslam təfəkkürünün bu cəhəti ilə tanış olmayanlar dünyanın böyük maddi düzəni qarşısında çaş-baş qalır, məyus olurlar. Onlar düşünürlər ki, inqilab etmiş olsa belə, bir xalq bu qədər inkişaf etmiş texnologiyası, dağıdığı silahları və atom bombası olan böyük güclər qarşısında məgər nə qədər müqavimət göstərə bilər?! Onlar düşünürlər ki, zülm və hegemonluğun təzyiqi qarşısında dayanmaq mümkün deyil. Mehdiyə (ə), Peyğəmbər (s) övladının və dövrün imamının vasitəsi ilə islami və ilahi dövlətə etiqad insanda bu ümidi yaradır ki, xeyr, biz mübarizə aparacağıq, çünki aqibət bizə məxsusdur, bizim fəaliyyətimiz dünyanın təslim olması ilə nəticələnəcək. Tarixin gedişi bizim bu gün əsasını qoyduğumuz, yarımçıq olsa belə nümunəsini yaratdığımız vəziyyətə doğru gedir. Mübariz xalqların, xüsusən də müsəlmanların qəlbində bu ümid yaransa, onlara elə yorulmazlıq verər ki, heç bir amil onları mübarizədən saxlaya və daxili .məğlubiyyətə uğrada bilməz

## Uzun illər xalqın beyninə belə bir yanlış fikir salmışdılar

Uzun illər xalqın beyninə belə bir yanlış fikir salmışdılar ki, həzrət Mehdinin (ə) qiyamından öncə başlanan hər bir islahatçı hərəkət faydasızdır. Bunu belə əsaslandırırdılar ki, həzrət Mehdinin (ə) zühur etməsi üçün dünya zülmlə dolmalıdır. Belə olmadıqca o, zühur etməyəcək. Deyirdilər ki, o həzrət dünya zülmlə dolduqdan sonra zühur edəcək. Lakin burada incə bir məqam var: Həzrət Mehdi (ə) haqqında söylənmiş bütün rəvayətlərdə uyğun cümlə belədir: Dünya zülmlə dolduğu kimi, Allah yer üzünü ədalətlə dolduracaq(۱). Mən indiyə qədər bir yerdə görməmişəm ki, zülmlə dolduqdan sonra deyilsin. Rəvayətlərdə belə bir şeyin olduğunu da güman etmirəm. Mən bu məqsədlə müxtəlif rəvayətlərə baxdım və heç bir yerdə



---

.Əl-Kafi, c. ۱, səh: ۳۴۱ [۱۸۳] -۱

belə bir şeylə rastlaşmadım. Yəni dünyanın həzrət Mehdi (ə) vasitəsi ilə ədalətlə dolması onun zülmlə dolmasından dərhal sonra baş verməyəcək. Xeyr! Tarix boyu dünya bir dəfə və bir zamanda yox, müxtəlif zamanlarda dəfələrlə zülmlə dolmuşdur; fironlar, tağut hakimiyyətləri və zalım şahlar dövründə bütün dünya zülm altında inləyir, qara zülm buludunun zülmətinə qərq olurdu, heç bri yerdə ədalət və azadlıq yox idi. Dünya belə bir günü gördüyü kimi, elə bir günü də görəcək ki, bu geniş dünyada ədalət işığının yanmadığı və zülmün hakim olduğu bir yer də qalmayacaq; insanların zülmdən, hökumətlərin təzyiqindən, qoluzorluların özbaşınalığından və ayrıseçkilikdən əziyyət çəkdiyi bir yer də qalmayacaq. Yəni bu gün dünyanın əksərinə hakim olan və şübhəsiz ki, bir zamanlar bütün dünyaya hakim olmuş bu vəziyyət (ümumi ədalətlə əvəzlənəcək. (۱۹۸۷

Həzrət Mehdinin (ə) inqilabı bu gün bizim İslam inqilabımızla dünya miqyasında ədaləti bərqərar etmək məqsədinə doğru böyük bir addım atmış oldu. İslam hakimiyyətinin yaranması nəinki vəd edilmiş bu aqibəti geriyə salmır, hətta onu sürətləndirir də. İntizarın mənası da budur. Qurtuluşun intizarı – Quran və İslam hakimiyyətini gözləmək deməkdir; yəni siz dünyanın indiki vəziyyəti və hətta İslam inqilabı ilə əldə olunan inkişafla da qane olmur, Quran və İslam hakimiyyətinə daha yaxınlaşmaq istəyirsiniz. Qurtuluşun intizarı budur. Qurtuluş intizarı bəşəriyyətin xilasını .gözləməkdir

## Bu gün bəşəriyyətin işi bərk düyünə düşmüşdür

Bu gün bəşəriyyətin işi bərk düyünə düşmüşdür. Bu gün maddi mədəniyyət zorla insanlara sırınmışdır. Bu bir düyündür. Bu gün dünya miqyasında ayrıseçkilik insanları sıxır. Bu böyük bir düyündür. Bu gün dünyanı elə bir hala salıblar ki, inqilabçı bir xalqın ədalətsevər fəryadı zorluların və hakimlərin məst nərələri arasında itir. Bu bir düyündür. Bu gün Afrikanın və Latin Amerikasının məzlumları, Asiyanın və Uzaq Şərqin milyonlarla ac insanı, irqi ayrıseçkilikdən əziyyət çəkən milyonlarla qaradərili ümid gözlərini bir xilaskara

dikmişlər. Böyük güclər bu xilaskarın səsinin onlara çatmasına qoymurlar. Bu bir düyündür. Qurtuluş bu düyünlərin açılması deməkdir. Baxış bucağınızı genişləndirib yalnız öz evinizin içinə, ailə həyatınıza baxmasanız, dünya miqyasında insaniyyətin qurtuluş istədiyini, amma yolunu bilmədiyini görərsiniz. Siz inqilabçı müsəlman xalq İslam inqilabının davamına dair öz nizamlı hərəkətinizlə insaniyyətin qlobal qurtuluşuna, vəd edilmiş Mehdinin (ə) zühuruna, bütün dünyanı bürüyəcək və bütün bu düyünləri açacaq son ümumbəşəri İslam inqilabına yaxınlaşmalı, bəşəriyyəti də yaxınlaşdırmalısınız. Qurtuluşun intizarı budur. Bu yolda Allahın lütfü və dövrün imamının duası bizim dayağımızdır. Biz o həzrətlə daha çox tanış olmalı, dövrün imamını unutmamalıyıq. Bizim məmləkətimiz İmam Mehdi (ə) məmləkəti, inqilabımız İmam Mehdi (ə) inqilabıdır. Allahın böyük höccətini yaddan çıxarmayın. İlahi! Biz səndən şərafətli dövlət istəyirik(۱) duasını ürəkdən və mütləq ehtiyacı dərk edərək oxuyun. Həm ruhunuz Mehdi (ə) intizarında olsun, həm cisminiz bu yolla hərəkət etsin. Siz İslam inqilabının güclənməsi üçün atdığınız hər bir addımla Mehdinin (ə) zühuruna bir addım yaxınlaşırsınız. (۱۹۸۱)

Siz xalqın əlində olan bu hökumət möminlərin minillik arzusu olmuşdur. Bütün imamlar bu istiqamətdə hərəkət etmişlər ki, cəmiyyətdə Allah hakimiyyətini, ilahi qanunların hakimiyyətini həyata keçirsinlər. Buna çalışmış, bunun üçün cihad etmiş, əziyyətlər çəkmişlər. Bu yolda səmərəli həbslərə məruz qalmış, sürgün edilmiş, şəhadətə yetirilmişlər. Bu gün siz bu imkanı əldə etmisiniz. Necə ki, Bəni-İsrail əsrlərdən sonra Davud (ə) və Süleyman (ə) peyğəmbərlərin dövründə bu imkanı əldə etdi. Ey müsəlman ümmət! Ey qəhrəman xalq! Ey İranın qəhrəman və mübariz xalqı! Əldə etdiklərinizin qədrini bilin, özünüzü qoruyun ki, bu hökumət dövrün imamı olan vəd edilmiş Mehdi Sahibəzzamanın (ə) hökumətinə birləşsin. (۱۹۸۱)



---

۱- [۱۸۴] Cümlə İftitah duasındandır. (Yenə orada, c. ۳, səh: ۴۲۴.)

Bu, siz əziz İran xalqının məqsəd seçdiyi, hərəkət etdiyi və ilahi yardımla bundan sonra da davam etdirəcəyi yoldur. Xoşbəxtlikdən, bu gün İslam dünyasının müxtəlif yerlərində müsəlman xalqların tədricən bu yola doğru hərəkət etdiklərini görürük. Allah-Taala buyurmuşdur ki, aqibət təqvalılara məxsusdur.(۱) Biz bu təqvaya sahib olsaq, qaçılmaz aqibət və sonuc İslam ümmətinə məxsus olacaq. Və Allaha ümidlə bu gələcək çox da uzaq deyil. (۲۰۱۱)

Sonda o böyük imamla və Allahın məsum vəlisi ilə mənəvi əlaqənin zəruriliyinə dair bir cümlə demək istəyirəm. Məsələni elmi təhlil səviyyəsində məhdudlaşdırmayın, Allahın seçdiyi bu məsum bu gün biz insanların arasında, dünyanın bizim bilmədiyimiz bir yerində yaşayır. O var, dua edir, Quran oxuyur, rüku, səcdə və ibadət edir. O, bəzi yerlərdə görünür, insanlara kömək edir, lakin biz onu tanımırıq. Allahın bu seçilmiş bəndəsi bu gün var və biz ictimai-siyasi işlərdən əlavə, - Allaha şükür ki, bizim quruluşumuz o həzrətin istədiyi istiqamətdədir – onunla fərdi və mənəvi əlaqəmizi də gücləndirməliyik. Cəmiyyətimizin hər bir fərdi dövrün imamına təvəssül etməli, o həzrətlə tanışlığı, dərdləşməyi, ona salam verməyi və onu yada salmağı özünə bir vəzifə bilməli, onun üçün dua etməlidir. İmam Mehdi (ə) haqda çoxlu dualar nəql olunmuşdur. Allahhummə kulli vəliyyikə(۲) duası onlardan biridir. Bundan əlavə, kitablarda dövrün imamının ziyarətnamələri də var. Onların hamısının elmi və ideoloji cəhətindən əlavə, mənəvi və emosional cəhəti də var və biz buna ehtiyaclıyıq. Bizim uşaqlarımız, gənclərimiz, cəbhədəki döyüşçülərimiz dövrün imamını yada salmaqla ruhlanır, qüvvələnir və ümidləri artır. Onlar sevgi göz yaşları ilə qəlblərini o həzrətə yaxınlaşdırır, Allahın və onun diqqətini cəlb edirlər. Bu mütləq olmalıdır. (۱۹۸۷)



---

۱- [۱۸۵] Əraf/۱۲۸.

۲- [۱۸۶] Əl-Kafi, c. ۴, səh: ۱۶۲.

**!Ey dövrün imamı**

Ey dövrün imamı! Ey bu ümmətin vəd edilmiş sevimli Mehdisi! Ey Peyğəmbərlərin pak zürriyyəsi! Ey bütün tövhid inqilablarının varisi! Bizim xalqımız əvvəldən sənin adını və xatirəni uca tutmuş, həyatında və vücudunda sənin lütfünü görmüşdür. Ey Allahın saleh bəndəsi! Biz bu gün sənin bu xalqın və bu inqilabın qələbəsi üçün pak ilahi qəlbdən və müqəddəs ruhdan edəcəyin duaya və Allahın bəxş etdiyi qüdrətlə bu xalqa və bu ümmətə edəcəyin yardıma möhtacıq. Ey dövrün imamı! Bizim üçün çox ağırdır ki, saleh insanlara və Allah bəndələrinə məxsus olan bu dünyada, bu sonsuz təbiətdə Allah düşmənlərini görək, Allah düşmənlərinin varlıq əlamətlərini müşahidə edək, səni .isə görməyək və hüzurunu dərk etməyək

Ey Rəbbimiz! Səni Məhəmməd və Ali-Məhəmmədə (ə) and veririk, bizim qəlblərimizi !həmişə dövrün imamının xatirəsi ilə təravətli saxla

!Ey Rəbbimiz! Bizim gözlərimizi dövrün imamını görməklə işıqlandır

Ey Rəbbimiz! Bu Allah qoşununu, Sənin yolunda mübarizə aparan bu insanları dövrün (imamının əsgər və fədailərindən et! (١٩٨٠

Ey Rəbbimiz! Səni Məhəmməd və Ali-Məhəmmədə (ə) and veririk, Öz məsum vəlinin müqəddəs qəlbini bizdən razı et! Bizi o həzrəti yada salanlardan və ona təvəssül !edənlərdən et

Ey Rəbbimiz! Məhəmməd və Ali-Məhəmməd (ə) hörmətinə, o həzrətin zühurunu və !ilahi hakimiyyət üçün qiyamını tezləşdir

Ey Rəbbimiz! Yeni qurulmuş bu İslam cəmiyyətini idarəçilik və quruculuq işlərində o !dövrə və o quruluşa bənzət

Ey Rəbbimiz! Məhəmməd və Ali-Məhəmməd (ə) hörmətinə, bizi onun dostlarından, (bütün hallarda və bütün işlərdə ardıcıllarından et! (١٩٨٧

səh:٢٧٩

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər sürəsi, ayə ٩

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ٢٠٠۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.١

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.٢ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .٣ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.١

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲
.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳
.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴
.Nəşriyyatın mənbələrini qeyd etmək.۵
.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir
:Müəssisənin fəaliyyəti
.Kitabların çapı və nəşri.۱
.Kitab oxumaq müsabiqələrinin təşkili.۲
.Məcazi sərgilərin istehsalı.۳
.Kompüter oyunlarının istehsalı.۴
Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵
.Sərgi məhsullarının və moizələrin istehsalı.۶
.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷
.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸
.Təlim kurslarının həyata keçirilməsi.۹
Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰
Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı
JAVA.۱
ANDROID.۲
EPUB.۳
CHM.۴
PDF.۵
HTML.۶
CHM.۷
GHB.۸
.۷.Qaimiyyə kitab bazarı adına dörd market
ANDROID.۱
IOS.۲
WINDOWS PHONE.۳
WINDOWS.۴
deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik


:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹